dərslər axşam keçirilirdi. O, bu dövrdə özünün təşəbbüsü ilə açılan pedaqoji kursların işində fəal iştirak etməklə yanaşı, həm də Azərbaycan Dövlət Universitetinin Zoologiya kafedrasına baş müəllim təyin olunur. Universitetdə o, biologiyanın tədrisi metodikası fənnindən mühazirələr oxuyur.



ДИПЛОМЪ.

Предъявитель сего **Ризабековъ** Фатулла-бекъ Машади Азизъ-бекъ-оглы, сынъ бека (кавказскаго дворянина), вѣроисповѣданія магометанскаго, въ бытность студентомъ физико-математическаго факультета ИМПЕРАТОРСКАГО Новороссійскаго Университета подвергался въ 1908, 1909, 1910 и 1911 уч. г.г. полукурсовому испытанію, на которомъ оказалъ слѣдующіе успѣхи: по неорганической химіи—*весьма удовлетворительные;* по аналитической химіи -- *удовлетворительные;* по анатоміи человѣка— *весьма удовлетворительные;* по физикѣ — *весьма удовлетворительные.* По зачетѣ опредѣленнаго уставомъ числа полугодій на названномъ факультетѣ, **по отдѣленію естественныхъ наукъ,** подвергался испытанію по предметамъ государственнаго испытанія: а) въ бытность въ Университетѣ, при чемъ оказалъ слѣдующіе успѣхи: по органической химіи—*удовлетворительные;* по зоологіи—*весьма удовлетворительные;* по морфологіи и систематикѣ растеній — *весьма удовлетворительные;* по анатоміи и физіологіи растеній —*весьма удовлетворительные;* и б) въ **Физико-Математической** испытательной комиссіи при Новороссійскомъ Университетѣ въ апрѣлѣ и маѣ мѣсяцахъ 1911 года, при чемъ оказалъ слѣдующіе успѣхи: по физіологіи животныхъ — *удовлетворительные;* по физическому землевѣдѣнію — *весьма удовлетворительные;* по минералогіи съ кристаллографіей — *весьма удовлетворительные;* по геологіи съ палеонтологіей—*удовлетворительные.*

№ 38449

Посему на основаніи ст. 81-й общаго устава ИМПЕРАТОРСКИХЪ Россійскихъ университетовъ 23-го Августа 1884 года, г. **Ризабековъ** удостоенъ въ засѣданіи помянутой комиссіи 28 мая 1911 года диплома *второй* степени со всѣми прав[illegible] и [illegible]муществами поименованными въ ст. 92-й устава и въ V-мъ п. ВЫСОЧАЙШЕ утверж[illegible]го въ 23-й день Августа 1884 года мнѣнія Государственнаго Совѣта. Въ удостовѣреніе сего и данъ ему, г. **Ризабекову,** сей дипломъ за надлежащею подписью и съ приложеніемъ печати Канцеляріи Попечителя Учебнаго Округа.

Г. Одесса, 16 іюля дня 1913 года.

*Попечитель Одесскаго Учебнаго Округа,*
*Тайный Совѣтникъ и Кавалеръ*

*Предсѣдатель Физико-Математической Испытательной Комиссіи,*
*Дѣйствительный Статскій Совѣтникъ и Кавалеръ*

*F.Rzabəylinin ali təhsil haqqında diplomu*

Fətulla bəy Rzabəylinin Azərbaycanda ali pedaqoji təhsilin təşkilində və müəllim kadrları hazırlığında mühüm xidmətləri olub. Onun təşkil etdiyi pedaqoji kurslar Ali Pedaqoji İnstitutun yaradılmasında bünövrə - baza rolunu oynadı. 1920-ci ildə Azərbaycan Xalq Maarif Komissarlığı ali pedaqoji təhsil müəssisəsinin təşkili ilə bağlı xüsusi təşkilat komissiyası yaratdı. Təşkilat komissiyasına pedaqoji kadr hazırlığındakı təcrübəsini nəzərə alaraq Fətulla bəy Rzabəyli sədr, Həbib bəy Mahmudbəyov və Rəhim Cəfərov üzv təyin edildi. Əməli kömək göstərmək məqsədilə komitənin tərkibinə Abdulla Şaiq Talıbzadə, Məmməd bəy Əfəndiyev, Sadıq Hüseynov da cəlb olundu. Təşkilat komitəsi institut açılana qədər milli pedaqoji kadrlar hazırlığına xidmət edəcək tədris planının layihəsini hazırlayıb Xalq Maarif Komissarlığına təqdim etməli, ali məktəbdə dərs demək təcrübəsi olan yüksəkixtisaslı müəllim kadrları seçməli, eləcə də tədris üçün zəruri olan avadanlıq və bina məsələsini həll etməli idi. Komitə öz işinə 1920-ci il iyunun 9-da başladı. Hazırlıq komissiyasının gördüyü işlər haqqında sədr Fətulla bəy Rzabəyli bilavasitə Azərbaycan SSR Xalq Komissarları Sovetinin sədri N.Nərimanova və Xalq Maarif Komissarı D.Bünyadzadəyə məlumat verir, onlardan lazımi göstəriş və yardım alırdı. N.Nərimanov komissiya üzvlərini qəbul edən zaman öz razılığını bildirərək demişdi: *"Mən görürəm, maarifin haradan başlanılmasını ruhən düzgün düşünmüş və Azərbaycan xalqının nicatı yolunu görüb bütün həyatınızı ona həsr etmişsiniz. Azərbaycan Respublikası bu zəhmətinizi hər zaman təqdir edəcək. Azərbaycan xalqı həmişə sizi yad edəcəkdir".*

İnstitut Azərbaycan XKS-nın sədri N.Nərimanovun imzaladığı 1921-ci il 26 avqust tarixli 66 saylı dekret əsasında yaradıldı. 1921-ci ilin noyabr ayının 12-də İnstitut Şurasının ilk iclası keçirildi və dərslərin mütəşəkkil təşkili, kollektivin qarşısında duran mühüm vəzifələr müzakirə edildi. Azərbaycan

Xalq Maarif Komissarlığının 1921-ci ilin iyunun 13-də keçirilən kollegiyası Fətulla bəy Rzabəylinin rəhbərliyi ilə hazırlanan Ali Pedaqoji Kişi İnstitutunun ilk Nizamnaməsini təsdiq etdi. Nizamnamədə ali təhsil ocağının quruluşu, vəzifələri və hüquqları müəyyənləşdirilirdi. Nizamnamədə göstərilirdi ki, yeni təşkil olunmuş institutun məqsədi orta məktəbdə ana dilində dərs demək üçün yüksəkixtisaslı pedaqoji kadrlar hazırlamaqdır. Orada tədris planına daxil olan ixtisas fənləri və onlar üçün ayrılan saatlar müəyyənləşdirilir, tələbələrin biliyini yoxlamaq və nəzarəti gücləndirmək məqsədilə kollokvium, məqbul və imtahanların aparılması qaydası qeyd olunurdu.

Azərbaycan Xalq Maarif Komissarlığı institutun rəhbərliyini və pedaqoji heyətini təsdiq etdi. Fətulla bəy Rzabəyli institutun ilk direktoru (rektoru) təyin edildi. O, 1921-1924-cü illərdə Azərbaycan Pedaqoji İnstitutuna rəhbərlik etdi. 6 nəfər tələbə ilə fəaliyyətə başlayan institutun fəaliyyəti ildən-ilə genişləndi. Fətulla bəy Rzabəylinin instituta rəhbərliyi dövründə tələbələr üçün 40 nəfərlik pansion təşkil edildi, bir neçə kabinə və laboratoriya yaradıldı, kitabxana xeyli zənginləşdirildi. 1923-1924-cü tədris ilində institutda 6 ixtisas qrupunda və hazırlıq şöbəsində 100 tələbə təhsil alırdı. Fətulla bəy Rzabəylinin dəvəti ilə Kiyev Universitetinin məzunları Davud Şərifov (antropologiya və rus dili), Hüseyn Mirzəcamalov (siyasi iqtisad) və Cəlil Məmmədzadə (siyasi iqtisad), Kazan Universitetinin məzunları Bəkir Çobanzadə (dilçilik), Fətulla Əlizadə (anatomiya), Rəhim bəy Məlikov (fizika), Odessa Universitetinin məzunu Mirəsədulla Mirqasımov (anatomiya), Fransa Rəssamlıq Akademiyasının məzunu Kelxis, Paris Universitetinin məzunu Mirzə Möhsün İbrahimov (fars dili), Tiflis Aleksandrovski Müəllimlər İnstitutunun məzunları Abdulla bəy Azaqbəyli (psixologiya və məntiq), Süleyman Səlimov (coğrafiya), Peterburq Ali Qadınlar Kursunun məzunu Səlimə xanım Osmanzadə (botanika) müəllim heyətinə qatıldılar. Az sonra Rusiyanın ayrı-ayrı institutlarında və elmi mərkəzlərində çalışan görkəmli şərqşünas alimlər V.V.Bartold, İ.İ.Meşşaninov, N.Y.Marr, A.N.Samoyloviç, P.K.Juze, Ə.S.Ubeydulin Pedaqoji İnstituta dəvət olundular. Berlin Universitetinin məzunu Xəlil Fikrət (psixologiya və pedaqogika), İstanbul Universitetinin məzunları İsmayıl Hikmət (türk ədəbiyyatı tarixi), Tofiq Hikmət (türk ədəbiyyatı tarixi), İsmayıl Novruz (ədəbiyyat), Süleyman Səlim (coğrafiya) Ali Pedaqoji İnstitutda pedaqoji fəaliyyətə cəlb olundu. İlk milli ali təhsil müəssisəsində güclü müəllim kollektivi yaradıldı və ildən-ilə onların sayı milli kadrların hesabına artdı. Ali pedaqoji təhsil müəssisəsinin qarşısına yüksəkixtisaslı müəllim kadrları ilə bağlı qoyulan tələbin reallaşmasında bu, çox vacib və zəruri məsələ idi.

***Fətulla Əziz oğlu Rzabəyli***

İnstitutun ilk illərinin məzunlarından biri olan dosent Musa Hacıyev görkəmli pedaqoq, nəcib insan, əsl vətəndaş kimi səciyyələndirdiyi F.Rzabəyli-ni belə xatırlayır*:"1924-cü ildə APİ-yə qəbul olunanda bizi xoş bir təbəssümlə qarşılayan adamın kim olduğunu sonradan öyrəndik. Demə, bu şəxs Azərbaycan xalqının böyük oğlu, professor Fətulla bəy Rzabəyli imiş. O, yüksəkixtisaslı, hərtərəfli inkişaf etmiş bir şəxsiyyət idi. Sonralar Tibb İnstitutunu bitirib həkimlik ixtsasına yiyələnmişdi. Bu dövrdə institutumuza daxil olan tələbələr bilikcə müxtəlif səviyyəyə malik idilər. Aralarında zəif, biliyi lazımı səviyyədən aşağı olanlar da var idi. Elə buna görə tələbələri orta bir səviyyəyə gətirmək və sonra onlara institut proqramı həcmində bilik vermək lazım idi. Tələbələrin biliyindəki kəsirləri aradan qaldırmaq məqsədilə birillik hazırlıq kursu açıldı. Hansı sinfi bitirməsindən asılı olmayaraq, o zaman bütün tələbələr ümumi kurs adlanan bu kursda oxumalı idilər. Beləliklə, ümumi kursda bizə orta məktəbdə keçilən fənləri tədris etməyə başladılar.*" Hazırlıq kursunda dərsləri məşhur yazıçı və pedaqoq A.Şaiq, riyaziyyat müəllimi M.Əfəndiyev, fizika müəllimi R.Məlikov, kimya müəllimi S.Hüseynzadə, cərrah A.Talışinski, həkim M.Vəkilov və institutun direktoru F.Rzabəyli deyirdi. Tələbələr ümumi kursda öyrəndikləri ilə bağlı may ayında imtahan verirdilər. Müəllim kadrlarına olan ciddi ehtiyaca baxmayaraq ***imtahanda heç kimə güzəşt olunmazdı.*** Qeyd edək ki, 20-ci illərdə imtahanlar bilet əsasında aparılmırdı. Şifahi sorğu tələbələrin biliyinin əsas yoxlama forması idi. Tələbələrdən fənnə aid əsas məlumatları bilənlər imtahandan keçmiş hesab olunurdu.

Musa müəllim imtahan anlarını belə xatırlayır*:"Biologiya fənnindən imtahanı Fətulla bəy Rzabəyli götürəcəkdi. Fətulla bəy nə qədər təvazökar və sadə idisə, bir o qədər də ciddi və və prinsipial idi. İmtahan zamanı heç kimə güzəştə getməzdi. Biz onun bu xasiyyətini yaxşı bildiyimizdən biologiya imtahanına daha mükəmməl hazırlaşmışdıq. İmtahan günü F.Rzabəyli instituta bir qədər də tez gəlmişdi. O gün onun çöhrəsi həmişəkindən daha mehriban, daha işıqlı idi. Bu isə biz tələbələri canlandırmış və həyəcanımızı azaltmışdı. Mən imtahana yaxşı hazırlaşmışdım və sualları kifayət qədər bilirdim. Doğrudan da, mən cavab verərkən F.Rzabəylinin günəş siması bir az da aydınlaşdı. Bu isə cavablarımdan onun razı qaldığını bildirən bir əlamət idi".* Lakin F.Rzabəyli o dövrdə yenicə nəşrə başlayan "Yeni məktəb" jurnalında çıxmış bir məqaləni oxuyub-oxumadığını Musa Hacıyevdən soruşur. Onun məqaləni oxumadığını hiss edən F.Rzabəyli həmin gün onu imtahandan keçirmir. Musa Hacıyev jurnalı tapır və məqalə ilə tanış olur. Sevimli müəlliminin yanına gələndə sürprizlə qarşılaşır. Fətulla bəy ondan heç nə soruşmadan imtahan vərəqəsinə "yetirir" yazaraq deyir: *"Oğlum, sən yaxşı*

*tələbəsən, cavansan, bilirəm ki, həmin məqaləni oxumusan. Müəllim sənə göstərmədiyi materialları da tapıb oxumağa çalış. Onda məlumatların çox olar. Bax, bu yolla sən yaxşı inkişaf edə bilərsən".*

O dövrdə rayonlarda müəllim çatışmırdı. Müəllimlərə olan ehtiyacı aradan qaldırılmaq məqsədilə bölgələrdə qısa müddətli kurslar təşkil edilir, Bakıdan yuxarı kurs tələbələri və müəllimlər mühazirə oxumaq məqsədilə rayonlara ezam olunurdu. 1926-cı ildə Quba şəhərində şimal bölgəsindən olan rayonlardan 500-ə qədər dinləyicinin iştirak etdiyi 3 aylıq pedaqoji kursa Fətulla bəy Rzabəyli ilə birlikdə Musa Hacıyev də müəllim təyin edilir. Musa müəllim sonralar xatirələrində yazırdı*:"Fətulla bəy Rzabəyli kursun dinləyicilərinin sevimlisinə çevrilmişdi. Fitri müəllimlik istedadı olan Fətulla bəy gəncləri çox sevir, söhbət zamanı onları özünə cəlb edə bilirdi. O, öz tələbələrinin simasında gələcəyin müəllimini görür, onların yetişməsində müəyyən əməyi olması ilə fəxr edir, tələbələrə dəyərli məsləhətlər verirdi. Bir gün tələbə yoldaşlarımdan bir ilə Qubada şəhər bağında əyləşib söhbət edirdik. Fətulla bəy Rzabəyli bizə yaxınlaşıb salam verdi və maraqlı söhbət etməyə başladı. Sözarası dedi ki, bilirsiniz nə var, siz gənc ədəbiyyatçısınız, mütləq bir neçə dil bilməlisiniz. Bundan əlavə dil və ədəbiyyatla sıx bağlı olan estetikanı, məntiqi və fəlsəfəni möhkəm öyrənməlisiniz. Yalnız bu zaman siz yaxşı ədəbiyyatçı və dilçi ola bilərsiniz. Həmin gözəl, nəsihətamiz sözlər o vaxt bizim üçün əsl həyat devizi oldu. Əziz müəllimimizin xeyirxah nəsihətini heç vaxt unutmadıq".*

İnstitutun ilk məzunlarından biri olan Hacıbala Hacıyev (uzun müddət ADPİ-nin Biologiyanın tədrisi metodikası kafedrasının dosenti olub) də Fətulla bəyin sevimli tələbələrindən olub. Hacıbala Hacıyev sevimli müəllimi ilə bağlı xatirələrində onun insani keyfiyyətlərini, müəllimlik qabiliyyətini səciyyələndirdikdən sonra yazırdı:"*F.Rzabəyli ilə birlikdə mənə də N.Nərimanovla görüşmək nəsib olmuşdur. Biz institutun kimya avadanlığı ilə təmin edilməsini xahiş etdik. Az sonra keçmiş neft sahibkarlarına məxsus olan zəngin bir kimya laboratoriyasının instituta verilməsi haqqında qərar çıxarıldı. N.Nərimanov həftədə bir-iki dəfə instituta gələr, yeni təşkil olunmuş kabinet və laboratoriyaları nəzərdən keçirər, tələbələrin geyim və yeməklərinə diqqət yetirər və təsərrüfat hissəsinə müəyyən tapşırıqlar verərdi".*

Fətulla bəy Rzabəyli müsahibələrin birində yeni ali pedaqoji məktəbin qarşısında duran vəzifələrdən bəhs edərək deyirdi:"*Pedaqoji İnstitut yalnız azərbaycanlıların deyil, bütün məhkum Şərq xalqlarının qayələrini təmin etməlidir. İnstituta fəhlə və kəndlilər cəlb edilməli və işi yaradıcı bir ruhda təchiz etmək lazımdır. Həyatın tələbi və ehtiyacı üzündən səhnəyə atılmış pedaqoji institutu var qüvvə ilə müdafiə edəcək və yüksəldəcəyik*".

***Fətulla Əziz oğlu Rzabəyli***

İnstitutun təşkilinin ilk dövründə iqtisadi-təsərrüfat, maddi-təchizat və tələbə qəbulunda xeyli çətinliklər mövcud idi. Orta təhsilli gənclər çox az idi. Eləcə də institutu bütün ixtisaslar üzrə müəllim kadrları ilə təmin etmək problem olaraq qalırdı. Ana dilində dərsliklər və əyani vəsaitlər yox idi. Fətulla bəy Rzabəyli fədakar əməyi ilə sadalanan bu problemlərin aradan qaldırılmasında xüsusi rol oynadı. Ciddi təşkilati işlərlə məşğul olmasına baxmayaraq, o, tələbə auditoriyalarında, pedaqoji kurslarda, savad kurslarında mühazirə oxuyur, təcrübi məşğələlər keçir, ana dilində ilk dərsliklərin hazırlanmasında, elmi terminoloji vəsaitlərin tərtibində, elmi tədqiqat işlərinin aparılmasında yaxından iştirak edir, elmi-metodiki məqalələri ilə müəllimlərə praktik köməklik göstərirdi. “Pedaqoji institutlarda tətbiqi dərslər (“Maarif və mədəniyyət”, 1924, № 4, s.26-30), “Pedaqoji institutlarda ülum tərbiyənin tədris planı necə olmalıdır?” (“Maarif və mədəniyyət”, 1924, №1 s.25-26), “Tənəzzöh haqqında” (“Yeni məktəb” 1925 №1-2, s.23-25), “Kənd əmək məktəbi haqqında” (“Yeni məktəb”,1926, №,3-4, s.28-36),” Pedaqoji kurslarda təbiət dərslərinə aid metodik göstərişlər” (“Yeni məktəb”,1926, №5-6, s.7-12), “I dərəcəli məktəb müəllimlərini hazırlayan xalq maarif komissarlığı kursları haqqında” (“Yeni məktəb”,1926, № 7-8, s.3-8), ”Bioloji ülum tərbiyəsinin metoduna dair” (“Yeni məktəb”, 1926, № 9-10, s.42-48), “Ölkəşünaslıq” (“Yeni məktəb”, 1928, №1, s.37-39) adlı məqalələrində ali və orta məktəblərdə pedaqoji prosesin düzgün təşkili ilə bağlı fikir və ideyaları yer alıb. Məsələn, “Tənəzzöh haqqında” (“Yeni məktəb” 1925, №1-2, s.23-25) məqaləsində məktəb və cəmiyyətin qarşılıqlı əlaqəsinin mahiyyətini açmağa çalışan Fətulla bəy Rzabəyli yazırdı*:”Məktəb həyata yaxın olmalı, əhali arasında məktəb tərəfindən təşviqat aparılmalı, məktəb həyatın kiçik bir hissəsi kimi təsəvvür edilməlidir”*. 1924-1930-cu illərdə “Yeni məktəb” adı ilə nəşr olunan indiki “Azərbaycan məktəbi” jurnalının yaradılması ideyası onun adı ilə bağlıdır. Həmkarlar müvəkkilləri ilə bağlı ilk nizamnamə də onun tərəfindən hazırlanmış və “Maarif işçisi” jurnalının 1927-ci il sayının 3 (s.27-30), 14 (s.62-65) və 16-17 (s.27-32) saylarında nəşr edilmişdir.

1924-cü ildə F. Rzabəyli N.Nərimanovun tövsiyəsi ilə Azərbaycan Xalq Maarif Komissarlığının Baş ictimai tərbiyə idarəsinin müdiri vəzifəsinə təyin olunur. Həmin şöbə xalq maarifinin yeni məzmunda təşkilinin ən mühüm məsələləri ilə məşğul olurdu. Məktəbyaşlı uşaqların siyahıya alınması, yeni məktəb binalarının tikintisi, tədris planı, proqramı və dərsliklərin hazırlanması, yüksəkixtisaslı müəllim kadrlarının yetişdirilməsi həmin şöbəyə həvalə edilmişdi. Bütün bunlar ölkədə qısa bir zamanda icbari ibtidai təhsilin həyata keçirilməsinə xidmət edirdi. Fətulla Rzabəylinin rəhbərlik etdiyi şöbənin əməkdaşları son dərəcə mürəkkəb və məsuliyyətli olan bu işin öhdəsindən

fədakarlıqla gəldi. O dövrdə Baş İctimai Tərbiyə İdarəsində Nəsibağa Qiyasbəyli, Əlcabbar İsmayılov, Seyfulla Şamilov, Abdulla bəy Sübhanverdixanov, Cavad bəy Cuvarlinski kimi qabaqcıl maarif xadimləri çalışırdı.

Fətulla bəy Rzabəyli mütəmadi olaraq müəllimlərlə görüşür, elmi-metodiki yeniliklərlə, təhsilin məzmununda baş verən yeniliklərlə onları tanış edir, K.D.Uşinskinin, A.S.Makarenkonun və S.T.Şatskinin tərbiyə ilə bağlı fikirlərini onların arasında yayır, pedaqoji fəaliyyətlərində nəzərə almağı tövsiyə edirdi. O, Baş ictimai tərbiyə idarəsinin müdiri kimi gənclərin politexnik təhsil alması, dərsin əməklə əlaqələndirilməsi, məktəblərdə emalatxanaların təşkili sahəsində diqqətəlayiq işlər görüb. O, rayonlarda kəndli-gənclər məktəb şəbəkəsini genişləndirməklə yerli əhalidə məktəbə rəğbət yaratmış, kənd təsərrüfatı üçün mütəxəssislər hazırlamaqla yanaşı, həm də icbari təhsilin həyata keçirilməsinə dəyərli töhfə vermişdir. Onun Nəriman Nərimanov adına Sənaye Texnikumu, Səmədağa Ağamalıoğlu adına Kənd Təsərrüfatı Texnikumu, Diş Həkimliyi Texnikumu və sonralar onun əsasında yaranan Diş Həkimliyi İnstitutunun təşkilində, həmin müəssisələr üçün proqram və metodiki göstərişlərin hazırlanmasında xüsusi xidmətləri olub. Qadın təhsil və tərbiyəsinə xüsusi önəm verən Fətulla bəy Rzabəyli 1920-ci ildə Azərbaycan Xalq Maarif Komissarlığında işləyəkən bir neçə qadın kursu təşkil etmiş, özü də bir müddət orada mühazirə oxumuşdu.


ПРЕЗИДИУМ ВЕРХОВНОГО СОВЕТА АЗЕРБАЙДЖАНСКОЙ ССР

*Заслуженному деятелю науки Азербайджанской ССР*

*Тов.* РЗАБЕЙЛИ

ФАТУЛЛЕ АЗИЗОВИЧУ

За Вашу выдающуюся деятельность в области науки

и в связи с 40-летием Азербайджанской Советской Социалистической Республики и Коммунистической партии Азербайджана, за достигнутые успехи в области хозяйственного и культурного строительства

Президиум Верховного Совета Азербайджанской ССР своим Указом от 24 мая 1960 г.

присвоил Вам звание

ЗАСЛУЖЕННОГО ДЕЯТЕЛЯ НАУКИ АЗЕРБАЙДЖАНСКОЙ ССР

Председатель Президиума Верховного Совета Азербайджанской ССР — С. Джафаров

Секретарь Президиума Верховного Совета Азербайджанской ССР — З. Шукюрова

№ 88

24 мая 1960 г.

г. БАКУ

*F.Rzabəyliyə Azərbaycan SSR Ali Soveti tərəfindən Əməkdar elm xadimi fəxri adının verilməsi haqqında sənəd*

1928-ci ildə Azərbaycan Dövlət Universitetinin Elmi Şurasının qərarı ilə Fətulla bəy Rzabəyliyə səmərəli pedaqoji fəaliyyətinə görə professor elmi adı verilib. 1930-cu ildə BDU-nun tibb fakültəsinin əsasında Azərbaycan Dövlət Tibb İnstitutu yaradılanda Fətulla bəy Rzabəyli orada Biologiya kafedrası təşkil edərək uzun müddət ona (1930-1933 və 1946-1964-cü illərdə) rəhbərlik edib. Onun rəhbərliyi ilə kafedra əməkdaşları məktəbyaşlı uşaqların fiziki inkişaf dinamikasını öyrənib, helmintlərə yoluxmuş Bakı məktəblilərinin müayinəsi problemi ilə məşğul olub, Azərbaycan ərazisində bitən bitkilərin fitonsid xüsusiyyətlərini araşdırıb. Kafedranın profilinə uyğun



*F.Rzabəyli həkim işləyərkən*

elmi-pedaqoji kadrların yetişdirilməsi və tədris proqramının işlənib hazırlanması sahəsində əhəmiyyətli rol oynayıb. Onun rəhbərliyi ilə Azərbaycan florasının fitonsid xassəli bitkiləri öyrənilib.

1933-cü ildə Fətulla bəy Rzabəyli yenidən ADPİ-yə dəvət olunub, o barada prorektor vəzifəsində çalışıb, Biologiya fakültəsinin dekanı və fakültə elmi-metodik komissiyasının sədri olub. Azərbaycan Kənd Təsərrüfatı İnstitutu Bakıda fəaliyyət göstərəndə orada Zoologiya kafedrasının müdiri vəzifəsində çalışıb.

Elmi-pedaqoji fəaliyyətdən, təhsil təşkilatçılığından ayrılmadan Fətulla bəy Rzabəyli həm də ali tibb təhsili alıb.

1928-ci ildə ADU-nun Tibb fakültəsini bitirib, 1938-1942-ci illərdə həkim kimi fəaliyyət göstərib. 1942-ci ildə Azərbaycan Dövlət Qiyabi Pedaqoji İnstitutunun Biologiya kafedrasının müdiri təyin olunub.

Dövrün tanınmış ziyalısı olan Fətulla Rzabəyli 1937-ci ildə əksinqilabi millətçi "İttihad" partiyasının üzvü kimi həbs olunub, uzun müddətli sorğu-sualdan sonra günahı sübut olunmadığına görə azad edilib.

Ümumiyyətlə, Fətulla Rzabəyli təhsil quruculuğu, böyüyən nəslin təhsil-tərbiyəsi, orta və ali məktəblərdə tədrisin təşkili, yeni təlim metodları və biologiya elminin aktual problemləri ilə bağlı zəngin pedaqoji irsə malikdir. Onun "Ümumi biologiya" (1931), "Biologiya terminləri lüğəti" (1934), "Biologiya" (1955) kitabları və 30-dan artıq elmi məqaləsi nəşr olunub. Ona 24 may 1960-cı ildə Azərbaycan SSR Ali Soveti tərəfindən Əməkdar elm xadimi fəxri adı verilib, bir sıra orden və medallarla təltif olunub.

Prof.Fətulla bəy Rzabəyli həm də gözəl ailə başçısı olub. Rüxsarə xanım Vəkilova ilə izdivaclarından Zülfiqar və Davud adlı oğlanları, Gülrux, Törə adlı qızları olub. Tanınmış Vəkilovlar nəslindən olan Rüxsarə xanım Tiflisdə anadan olmuşdu. Rəssam olan Rüxsarə xanım Tiflisdə gimnaziya bitirmişdi. Qızı Gülrux xanım atasının yolu ilə getmiş, 20 ildən artıq Bakı məktəblərində tədris işləri üzrə direktor müavini və biologiya müəllimi işləmişdir.

Prof.F.Rzabəyli onu tanıyanların yaddaşında intellektual zəkası, incə yumor hissi, yaraşıqlı xarici görünüşü, mənəvi saflığı, güclü və məlahətli səsi ilə qalıb. Araşdırma zamanı Natiq Rəsulovun prof. F.Rzabəyli ilə bağı kiçik

həcmli xatirəsində çox maraqlı bir məqama rast gəldim. Onun xatirəsindən belə məlum olur ki, P.Sapsayın M.F.Axundovun adını daşıyan bağda ucaltdığı abidənin naturşiki məhz Fətulla bəy Rzabəyli olub.

Prof. Fətulla bəy Rzabəyli 10 oktyabr 1968-ci ildə 83 yaşında Bakıda vəfat edib və Fəxri Xiyabanda dəfn olunub.



**Ədəbiyyat**


1. Ali Pedaqoji İnstitutun salnaməsi. Bakı,1924
2. Ali Pedaqoji İnstitut. Beş illik. Bakı, 1926
3. Rzayev A. Azərbaycanda sovet hakimiyyəti illərində ali pedaqoji təhsilin inkişaf tarixindən. Bakı, Azərnəşr, 1960, s.30-37
4. Rüstəmov F.Azərbaycan pedaqogikaşünaslığı. Bakı, Elm və təhsil, 2016, s.34
5. Sadıqov Ş., Əzimov H., Salahov M. V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutu 50 ildə. Bakı, 1972, s.14-30
6. Hacıyev M. Görkəmli pedaqoq, nəcib insan, əsl vətəndaş. ”Gənc müəllim” qəzeti, 30 oktyabr 1971-ci il.
7. Fətulla bəy Rzabəyli. Azərbaycan pedaqoji antologiyası. 3 cilddə. II c. (XIX əsr-XX əsrin əvvəlləri). (Tərtib edəni və çapa hazırlayanı: akademik Hüseyn Əhmədov). Bakı, 2011
8. İnstitutumuzun ilk rektoru. ”Gənc müəllim”, 26 fevral 1973-cü il
9. Nəcəfov C. Biologiya elmi insanın sağlamlığı keşiyində. ”Respublika” qəzeti, 26 may 2010-cu il
10. Hacıyev H.Mənim tələbəlik illərim.”Gənc müəllim” qəzeti, 26 fevral 1973-cü il


***Fətulla Əziz oğlu Rzabəyli***



**MƏMMƏD BƏY RƏŞİD OĞLU ƏFƏNDİYEV**
*Əməkdar elm xadimi, professor (1887-1977)*

Məmməd Rəşid oğlu Əfəndiyev 5 oktyabr 1887-ci ildə Nuxada (Şəkidə) Azərbaycanın görkəmli maarifçisi Rəşid bəy Əfəndiyevin ailəsində anadan olub. 1908-1913-cü illərdə Peterburq Universitetinin fizika-riyaziyyat fakültəsində təhsil alıb. Ali təhsilini başa vurduqdan sonra qısa bir müddətdə Tiflisdə müəllimlik edib, sonra Azərbaycana qayıdaraq Nuxa gimnaziyasında pedaqoji fəaliyyətə başlayıb. ADR dövründə və sovet hakimiyyətinin ilk illərində o, həmin gimnaziyanın milliləşdirilməsində yaxından iştirak edib, gimnaziyanın aşağı siniflərində bütün fənlərin, yuxarı siniflərdə isə riyaziyyat fənninin ana dilində tədrisinə nail olub. Həmin dövrdə yuxarı siniflərdə ayrı-ayrı ümumtəhsil fənlərindən dərs deyə biləcək milli kadrlar tapmaq çox çətin idi. Fizika və riyaziyyat üzrə cəmi üç nəfər ali təhsilli müəllim (Məmməd Əfəndiyev, Bəhram Mirzəyev, Rəhim Məlikov) var idi. Sovet hakimiyyətinin ilk illərində milli məktəblərin yaradılması, mövcud orta məktəblərin milliləşdirilməsi, yeni pedaqoji seminariyaların və kursların açılması sahəsində səmərəli işlər görüldü. Dövlət sovet mədəniyyətinin yaradılmasında məktəb və müəllimin rolunu yüksək dəyərləndirirdi. Azərbaycanın bütün ərazisində, o cümlədən Nuxada savadsızlığın aradan qaldırılması uğrunda ciddi mübarizə gedirdi. Həmin dövrdə Məmməd Əfəndiyev Nuxa qəza xalq maarif şöbəsinin məktəblər bölməsinin müdiri vəzifəsində çalışırdı. Bununla yanaşı o, həm də təşkil etdiyi klubda böyük ictimai - mədəni iş aparır, məktəbyaşlı uşaqların məktəbə, yaşlı əhalinin savad kurslarına cəlb edilməsində əsl fədakarlıq göstərirdi. O, Nuxa maarif işçiləri həmkarlar ittifaqının sədri kimi də müəllimlər arasında geniş maarif işləri aparır, onlara metodik köməklik göstərirdi. Müəllimlər arasında böyük nüfuzu olan Məmməd Əfəndiyev



*Məmməd bəyin atası*
*Rəşid bəy Əfəndiyev*

o dövrdə Bakıda çağırılan Azərbaycan Həmkarlar İttifaqı qurultayının nümayəndəsi olmuşdu. Həmin illəri Məmməd Əfəndiyev belə xatırlayırdı: *"1913-1914-cü dərs ilində Peterburq Universitetini bitirdikdən sonra doğma Nuxaya qayıtmışdım. Gimnaziyada müəllimlik edirdim...Sovet hakimiyyətinin ilk günlərindən Nuxa qəza maarif şöbəsində məktəb bölməsinin müdiri vəzifəsində işləyirdim*".

Azərbaycanın digər şəhərlərində olduğu kimi Nuxada da xeyli anadilli ibtidai məktəblər (I dərəcəli məktəblər) açılmışdı. Burada həm də bir kişi, bir qadın seminariyası və bir ibtidai nümunə məktəbi fəaliyyət göstərirdi. Müəllim kadrları hazırlığında ciddi çətinliklər var idi. İbtidai məktəblərdə dərs deyən müəllimlərin çoxunun pedaqoji savadı və metodik hazırlığı yox idi. Həmin müəllimləri pedaqoji cəhətdən hazırlamaq məqsədi ilə Məmməd Əfəndiyev Nuxada üç aylıq müəllimlər kursunun açılmasının təşəbbüskarı oldu və həmin kursun idarə edilməsini öz öhdəsinə götürdü. Bu kursa təkcə Nuxa qəzasından deyil, Ağdaş, Göyçay və Zaqatala qəzalarından da müəllimlər cəlb edilmişdi. Kursun təşkili və idarə edilməsi sahəsində qazandığı təcrübə onun Ali Pedaqoji İnstitutdakı fəaliyyətində önəmli rol oynadı. Bu institutda pedaqoji fəaliyyətə dəvət olunan ilk 7 müəllimdən biri Məmməd Əfəndiyev olub. Dəvət olunanların heç birinin elmi adı və elmi dərəcəsi yox idi. Bu haqda onun xatirələrində oxuyuruq: *"1921-ci ildə Azərbaycan Xalq Maarif Komissarlığı məni Bakıya çağırdı. Əvvəlcə müəllim hazırlayan qısa müddətli kurslarda fizika və riyaziyyat dərsi dedim. Sonradan isə həmin il Azərbaycanda təşkil edilən ilk pedaqoji instituta müəllim təyin olundum. İnstitutun yaradılmasında mən də əlimdən gələni əsirgəməmişəm"*.

M.Əfəndiyev Ali Pedaqoji İnstitutda riyaziyyat fənnindən Azərbaycan dilində mühazirə söyləyən ilk müəllim olmaqla yanaşı, həm də institutun təşkilində mühüm rol oynayıb. Fətulla bəy Rzabəyli Xalq Maarif Komissarlığına idarə müdiri vəzifəsinə irəli çəkiləndə, onun yerinə Məmməd Əfəndiyev direktor təyin olunub. O, bu vəzifədə çox az - bir ilədək işləyib.

Pedaqoji İnstitutun fəaliyyətə başladığı illərdəki çətinliklərin bir hissəsi hələ də qalırdı. Həmin çətinlikləri Məmməd Əfəndiyev sonralar belə xatır-

layırdı: *"İnstitutda dərs demək üçün müəllim çatışmırdı. Habelə institutda oxumaq üçün orta məktəb həcmində təhsili olan gənclər az idi. Ana dilində dərsliklər və əyani vəsaitlər hələ yaradılmamışdı. Bu çətinlikləri tədricən aradan qaldırdıq. Bir sıra müəllimlərin, xüsusilə Fətulla Rzabəyli, Həbib bəy Mahmudbəyov, Rəhim Məlikov, Sadıq Hüseynov, Abdulla Şaiq və başqalarının fədakar əməyi bu işə az kömək etmədi. Ali pedaqoji təhsilin genişləndirilməsində A.O.Makovelski və P.P.Fridolin kimi görkəmli rus alimləri Azərbaycan zəhmətkeşlərinə çox böyük kömək göstərmişlər"*. Onun dövründə institut 4 illik tədris planı ilə işləməyə başladı. Azərbaycan SSR Xalq Maarif Komissarlığı Kollegiyasının 1923-cü il qərarına uyğun olaraq 1924-1925-ci tədris ilində ayrı-ayrılıqda fəaliyyət göstərən Ali Pedaqoji Kişi İnstitutu və Ali Pedaqoji Qadın İnstitutu inzibati cəhətdən birləşdirildi. İnstitutda tələbələrin ümumi sayı və digər yerlərdən gələnlərin sayı xeyli artdı. 6 tələbə ilə fəaliyyətə başlayan institutda 142 tələbə təhsil alırdı. İnstitutun yataqxanasında yaşayan tələbələrdən 125-i Azərbaycanın bölgələrindən, 12 -si Dağıstandan, 5 -i Türkmənistandan, 8 -i Krımdan, 3 -ü Ermənistandan, 1 -i Gürcüstandan gəlmişdi.



Pedaqoji məktəblər (texnikumlar), fəhlə fakültələri, sənaye, inşaat, kənd təsərrüfatı, maliyyə texnikumları, ikinci dərəcəli məktəblər (orta məktəblər) üçün riyaziyyat-fizika müəllimləri APİ-də hazırlanırdı. Bu dövrdə respublikanın ali məktəblərində elmi və elmi-pedaqoji kadrların olmaması səbəbindən Rusiyadan dəvət olunmuş akademik heyətdən istifadə olunurdu. Milli müəllim kadrları hazırlığında ciddi çətinliklər qalmaqda idi. Bu çətinliklərə baxmayaraq 1926-1927-cı tədris ilində Ali Pedaqoji İnstitut Azərbaycan Dövlət Universitetinin Pedaqoji fakültəsinin tərkibinə verildi. Universitetin fakültələri (tibb fakültəsi istisna olmaqla) ümumtəhsil məktəbləri üçün müəllim kadrları hazırlığına istiqamətləndirildi.

1930-cu ildə ali təhsil müəssisələrinin, o cümlədən Ali Pedaqoji İnstitutun həyatında yeni bir mərhələ başladı. Azərbaycan Dövlət Universiteti



ləğv olundu, onun ayrı-ayrı fakültələrinin bazasında müstəqil institutlar təşkil olundu. Ali Pedaqoji İnstitut dövrün ehtiyac və tələbi ilə yenidən quruldu. Pedaqoji institutda tədris prosesini və elmi işləri nizama salmaq kimi ciddi təşkilatçılıq işləri həyata keçirildi.

Pedaqoji İnstitutun 1931-ci il sentyabrın 29-da keçirilən ilk Elmi Şurasında 26 kafedra yaradıldı ki, onlardan da biri Ali riyaziyyat kafedrası idi. Kafedraya Məmməd Əfəndiyev müdir təyin olundu. Az sonra o, Riyaziyyat və təbiyyat elmləri fakültəsinin dekanı vəzifəsinə seçildi və üç il (1934-1936-cı illərdə) bu vəzifədə səmərəli fəaliyyət göstərdi. 1935-ci ildə Azərbaycan SSR Xalq Maarif Komissarlığı tərəfindən riyaziyyat elmləri sahəsindəki böyük xidmətlərinə və səmərəli pedaqoji fəaliyyətinə görə ona dosent elmi adı verildi.

Məmməd Əfəndiyev 1938-ci ildə Azərbaycan Dövlət Universitetinin Riyazi analiz kafedrasına dəvət edilir. Üç il sonra həmin kafedraya müdir təyin edilir və 1965-ci ilə kimi həmin kafedraya rəhbərlik edir. Həmin illər onun elmi və pedaqoji fəaliyyətində daha yadda qalan olub. 1943-cü ildə Azərbaycan SSR Ali Sovetinin Rəyasət Heyətinin qərarı ilə Məmməd Əfəndiyevə Əməkdar elm xadimi fəxri adı, 1944-cü ildə professor elmi adı verilib.

O, 1948-1949-cu illərdə kafedra müdiri olmaqla bərabər, həm də Azərbaycan Dövlət Universitetinin nəzdindəki Fizika - Riyaziyyat Elmi Tədqiqat İnstitutunun direktoru vəzifəsində işləyir. Prof.M.Əfəndiyevin rəhbərlik etdiyi bu institut yüksək ixtisaslı elmi kadrların yetişdirilməsində əhəmiyyətli rol oynayır. Prof.M.Əfəndiyevin ali məktəbdə dərs dediyi tələbələrindən Cəlal Qasımov, Maya Hacıyeva, Tahir Abdullayev, Məcid Rəsulov, Qoşqar Əhmədov, Şərif Kazımov, Musa Əzimov, Əsgər Axundov fizika-riyaziyyat elmləri üzrə namizədlik, İbrahim İbrahimov, Əşrəf Hüseynov isə doktorluq dissertasiyalarını bu institutun əməkdaşları kimi müdafiə ediblər.

Prof.Məmməd Əfəndiyev ADU-da çalışsa da, ömrünün sonuna kimi Azərbaycan Pedaqoji İnstitutu ilə əlaqəsini kəsməmiş, burada Riyaziyyat fakültəsinin tələbələrinə diferensial tənliklərdən mühazirələr oxumuş, dövlət

imtahan komissiyasının sədri olmuş, tələbələrinin riyaziyyatçı alim kimi yetişmələrinin xeyirxahlarından biri olmuşdur.

Professor Məmməd Əfəndiyevin yaradıcılığı çoxşaxəlidir. Ali Pedaqoji İnstitutda ana dilində riyazi analiz, analitik həndəsə, riyaziyyatın metodikası fənlərindən mühazirə oxumaq ilk dəfə ona nəsib olub. İnstitutda fizika və riyaziyyata aid laboratoriya və kabinələrin təşkili və təchizi Məmməd Əfəndiyevin fəaliyyətinin önəmli bir hissəsi olub. O, fizika və riyaziyyat müəllimlərinin həm də sənət məktəblərində işləyəcəklərini nəzərə alaraq tədris planına nəzəri və təcrübi fənlərlə yanaşı, emalatxana məşğələlərinin daxil edilməsinə nail olub. Bu xüsusda akademik Əşrəf Hüseynovun fikirləri maraq doğurur. O yazır: *"Əfəndiyevin rəhbərliyi altında o zaman (XX əsrin 20-ci illəri nəzərdə tutulur- F.R.) institutda təşkil edilmiş riyaziyyat kabinəsi, onun təchiz qaydası və həm də iş üslubu indi belə (1957-ci il nəzərdə tutulur- F.R.), ali məktəblərin riyaziyyat kafedralarının yanında olan riyaziyyat kabinələri üçün nümunə hesab edilə bilər. Bu kabinədə tələbələr həndəsi modellər, diaqramalar, qrafik üsul ilə məsələ həlli, bina planları və başqa nümunələr düzəldirdilər. Müasir politexnik tələbatı təmin edəcək hazırlıqlı müəllimlərin yetişdirilməsində o zaman fizika-riyaziyyat şöbəsinin dekanlığının, xüsusən şöbənin rəhbəri M.Əfəndiyevin son dərəcə müstəsna xidməti olmuşdur"*.

XX əsrin 20-ci illərinə kimi Azərbaycanda milli orta və ali məktəblər olmadığından bu dildə riyaziyyat kitabları (ibtidai məktəblər üçün nəzərdə tutulan "Hesab" dərslikləri istisnalıq təşkil edir) da olmamışdır. Ali məktəbdə riyaziyyatdan milli dildə mühazirə oxuyan Məmməd Əfəndiyev ilk dəfə olaraq riyazi terminlərin istifadə və şərhində beynəlxalq terminologiyaya üstünlük verib. Riyazi ifadələrin Yaxın Şərqdə yayılmış yazılış formaları əvəzinə latınca yazılışını ilk dəfə M.Əfəndiyev işlədib. O, hesab, cəbr, həndəsə, triqonometriya fənləri üzrə formalaşdırdığı terminləri toplayaraq 1925-ci ildə kitab şəklində nəşr etdirib. Məhz onun və həmkarlarının elmi və metodiki yaradıcılığı nəticəsində Azərbaycanda riyazi terminologiya formalaşmağa başlayıb.

Azərbaycan Dövlət Elmi Tədqiqat İnstitutunin dil və ədəbiyyat şöbəsi 1931-ci ildə "Riyaziyyat terminləri" layihəsini nəşr edib. Bu layihə elementar riyaziyyat terminlərini əhatə edirdi. Respublikamızda riyazi təhsilin sürətlə inkişafı, riyaziyyatla bağlı kitabların, dərslik və dərs vəsaitlərinin, iş kitablarının rus dilindən Azərbaycan dilinə tərcüməsi riyazi terminologiyanın təkmilləşdirilməsini və stabilləşməsini tələb edirdi. Bu məqsədlə SSRİ Elmlər Akademiyasının Azərbaycan filialında riyaziyyat terminləri ilə bağlı

geniş müşavirə keçirilib. Orta və ali məktəbdə çalışan riyaziyyat müəllimlərinin və nəşriyyat işçilərinin  iştirakı ilə keçirilən müşavirə bir neçə gün davam edib. İrəli sürülən təklif və iradlar ciddi müzakirə olunub. Ərəb və fars dillərindən  dilimizə keçən riyazi anlayış və terminlərin  əvəzlənməsi tövsiyə olunub. M.Əfəndiyev, Ə.İ.Hüseynov, M.Cavadov, T.Abdullayev, C.Qasımov, B.Ağayev və başqalarının iştirakı ilə 1939-cu ildə “Matematika terminləri” lüğəti nəşr olunub. Onu da qeyd edim ki, riyazi terminlərin sabitləşməsi uzun müddət davam edib. 1931-ci layihə kimi nəşr olunan “Riyaziyyat terminləri”, 1939-cu ildə “Matematika terminləri” kimi nəşr edilib. 1958-ci ildə yenidən “Riyaziyyat terminləri” adı ilə təkmilləşdirilmiş şəkildə işıq üzü görüb.

Prof.Məmməd Əfəndiyev 1941-1946-cı illərdə Azərbaycan Riyaziyyatçılar Cəmiyyətinin sədri olub. Azərbaycanda riyaziyyatın tədrisi metodikasının  elmi sahə kimi təşəkkülü və inkişafında onun  mühüm  xidmətləri olub.

1944-cü ilin iyun ayında Xalq Maarif Komissarlığı  tərəfindən ümumtəhsil, peşə, orta ixtisas və ali məktəblərdə çalışan həndəsə, riyaziyyat və fizika müəllimlərinin  iştirakı ilə geniş müşavirə keçirilib. Müşavirənin əsas məqsədi riyaziyyat və fizikanın tədrisinin təkmilləşdirilməsi, təlim prosesində səmərəli metodların tətbiqi ilə keyfiyyətin yüksəldilməsi idi. Müşavirənin əsas məruzəçilərindən biri də Məmməd Əfəndiyev idi. O, “Eyni çevrilmələrin prinsip və metodları” mövzusunda məruzə ilə çıxış edib. Həmin məruzə “Orta məktəbin riyaziyyat kursuna daxil olan eyni çevrilmələrin prinsip və metodları haqqında” adı ilə “Fizika və riyaziyyat müəllimlərinin I Respublika müşavirəsinin materialları”nda (“Azərnəşr”,1944, s.30-42) nəşr olunub.

Ölkədə riyazi təhsilin məzmununu müəyyənləşdirənlərdən biri olmuş prof.M.Əfəndiyev “Adi diferensial tənliklər” (1950), “Matematik analizdən material və tapşırıqlar” (Ə.Hüseynovla birlikdə) (1939), “Diferensial tənliklər kursu” dərsliklərinin müəllifidir. Bu kitablar uzun illər riyaziyyat və fizika  ixtisaslarında təhsil alan tələbələrin  stolüstü kitabı olub.

Prof. Məmməd Əfəndiyev  nümunəvi müəllim və bacarıqlı elmi  işçi olmaqla  yanaşı, həm də fəal ictimaiyyətçi olub, bütün qüvvə və bacarığını Respublikada savadsızlığın ləğvinə, pedaqoji və elmi pedaqoji kadr hazırlığına, dərslik və dərs vəsaitlərinin tərtibinə sərf edib. Müəllimlərin ixtisasartırması ilə bağlı Azərbaycan SSR Maarif Nazirliyinin təşkil etdiyi qısamüddətli kurslarda riyaziyyatın tədrisinin müxtəlif məsələləri ilə bağlı mühazirələr oxuyub, metodik tövsiyələr verib. Dəfələrlə Bakı Sovetinə deputat seçilib. Lenin ordeni (1958) və 2 dəfə "Qırmızı Əmək Bayrağı" ordeni ilə təltif olunub.

***Məmməd bəy  Rəşid  oğlu  Əfəndiyev***

Akademik Əşrəf Hüseynovun “fədakar müəllim, ictimai xadim, böyük elm təşkilatçısı, misilsiz insanlıq sifətlərinə malik” ziyalı kimi hörmət və ehtiramla yad etdiyi prof. Məmməd Əfəndiyev elmi məktəb yaradan alimlərimizdəndir.

Akademik Zahid Xəlilov, akademik İbrahim İbrahimov, akademik Əşrəf Hüseynov, AMEA-nın müxbir üzvü Mais Cavadov, professor Bəylər Ağayev, profesor T.Abdullayev, professor Qoşqar Əhmədov, professor Əmir Həbibzadə, dosent Bəhram Yusifzadə, dosent Ə.İbrahimov, baş müəllim Aqil Salayev və onlarla digər tanınmış riyaziyyatçı alimlər həmin məktəbi inkişaf etdirərək daha yüksək səviyyəyə qaldırmış, keçmiş SSRİ-də riyaziyyat sahəsində səlahiyyətli söz sahibləri kimi tanınmışlar.

Prof. Misir Mərdanovun "müəllimlər müəllimi" adlandırdığı Məmməd Əfəndiyev 1 iyun 1977-ci ildə 89 yaşında Bakı şəhərində vəfat edib. Bakıdakı küçələrdən biri 1992-ci ildən görkəmli riyaziyyatçı alim Məmməd Əfəndiyevin adını daşıyır.

### Ədəbiyyat


1. Ali Pedaqoji İnstitutun salnaməsi. Bakı,1924
2. Ali Pedaqoji İnstitut. Beş illik. Bakı, 1926
3. Rzayev A. Azərbaycanda sovet hakimiyyəti illərində ali pedaqoji təhsilin inkişaf tarixindən. Bakı, Azərnəşr, 1960, s.37-39
4. Ə.Hüseynov. Məmməd Rəşid oğlu Əfəndiyev// Fizika-riyaziyyat tədrisi məcmuəsi, 1957, I buraxılış, s.33- 36
5. Ə.Hüseynov, M.Cavadov. Sovet Azərbaycanında riyaziyyat elminin inkişafı (1920-1950-ci illər). Bakı, Azərnəşr, 1962
6. Danışır qocaman xalq maarifi xadimi M.Əfəndiyev. "Azərbaycan müəllimi" qəzeti, 29 noyabr 1959-cu il
7. Марданов М, Асланов Р. Предшественники современной математики Азербайджана. Москва, 2016, с. 304-305
8. Məmməd Rəşid oğlu Əfəndiyev. https://az.wikipedia.org/wiki/
9. Ф.З.Велиев, Г.М.Набиев. Первый педагог-математик советского Азербайджана (к 90-летию со дня рождения М.Р.Эфендиева). Успехи математических наук (Russian Mathematical Survey).1978, том 33, выпуск 3(201), s.205-207


***Məmməd bəy Rəşid oğlu Əfəndiyev***



**HƏBİB BƏY İBRAHİMXƏLİL OĞLU MAHMUDBƏYOV**
*(1864- 1928)*

Həbib bəy Mahmudbəyov 1864-cü ildə iyun ayının 16-da Şamaxı şəhərində anadan olmuşdur. Atası İbrahimxəlil xeyirxah və maarifpərvər adam idi. O, oğlu Həbibi səkkiz yaşı olanda məhəllə məktəbinə oxumağa göndərir. Mirzə Hüseyn adlı molladan ərəb əlifbasını və Quran oxumağı öyrənən Həbib bəy Mahmudbəyov sonralar yazırdı:"*Məktəb məsciddə geniş və natəmiz bir otaqda yerləşirdi. İri yaşlı şagirdlər taxt üstündə, kiçiklər isə yerdə otururdular. Sinifdən səs-küy heç bir zaman əskik olmurdu. Çünki molla hamının Quranı bərkdən oxumasını tələb edirdi. Kim pis cavab verirdisə, molla əvvəlcə onun əllərini, sonra da kürəyini insafsızcasına çubuqlayırdı. Biz ana dili dərsi keçmirdik, dərsliyimiz də yox idi. Bir tərəfdən dərslərin başa düşmədiyim dillərdə keçilməsi, digər tərəfdən şagirdlərə hər gün cəza verilməsi məktəbə olan həvəsimi tamamilə söndürdü və mən oraya getməkdən boyun qaçırdım".*

Mollaxanada verilən dini-sxolastik təlim onu qane etmədiyindən o, Şamaxı şəhər məktəbinə daxil olur. Şamaxı zəlzələsi zamanı məktəb tamamilə dağılır. Həbib bəy təhsilini davam etdirmək üçün Bakıya köçür və burada realni məktəbə daxil olur. 1873-1881-ci illərdə Bakı realni məktəbində təhsil alır. Ali təhsil almaq arzusu ilə Tiflisə gedir və burada 1882-ci ildə Aleksandrovski Müəllimlər İnstitutuna qəbul olunur. Haqqında danışdığımız ali məktəbə qəbul olunmaqdan ötrü dörd imtahan verilirdi: riyaziyyat, coğrafiya, rus dili (şifahi), rus dili (yazılı). Həbib bəy Mahmudbəyov imtahandan yüksək bal toplayaraq "xəzinə hesabına" instituta qəbul edilib və 1887-ci ilə kimi orada təhsil alıb. Aleksandrovski Müəllimlər İnstitutunun zəngin ənənələri və yaxşı kollektivi var idi. Bir tədris, təhsil və elm ocağı kimi burada qa-

baqcıl ziyalılar, müəllimlər, maarif və mədəniyyət xadimləri toplaşmışdı. Müəllim və tələbələr müxtəlif regionları təmsil etdiklərindən həmin regionun xüsusiyyət və adət-ənənələrini özündə yaşadır və təzahür etdirirdi. Onların milli tərkibi, bilik səviyyəsi, etiqadı, həyata baxışı, sinfi mənsubiyyəti, siyasi əqidəsi müxtəlif olsa da mehriban və səmimi idilər. Belə bir mühitdə təhsil almaq Həbib bəyin mənən zənginləşməsinə, daha çox şeyləri görüb götürməsinə müsbət təsir göstərdi. İnstitut onun üçün yalnız təhsil ocağı yox, həm də həyat məktəbi oldu. O, burada rus, Avropa mədəniyyəti və ədəbiyyatı ilə, həmçinin monarxiya və siyasi rejim əleyhinə yönəlmiş inqilabi fikirlərlə tanış ola bildi. Həbib bəy institutda Y.A.Komenskinin, İ.H.Pestalossinin, K.D.Uşinskinin pedaqoji irsini dərindən mənimsədi və sonralar onların tövsiyə və göstərişlərindən əməli işində tətbiq etdi. Yaxşı müəllim kimi yetişməkdən ötrü Aleksandrovski Müəllimlər İnstitutunda münbit şərait var idi. Əsas məqsəd xalq məktəbləri üçün müəllim kadrları hazırlamaqdan ibarət idi. Həbib bəyin peşəkar bir pedaqoq kimi yetişməsinə onun praktika rəhbəri V.İ.Nasidzenin mühüm təsiri olub. V.İ.Nasidze milliyyətcə minqirel olub savadlı, qayğıkeş, səmimi müəllimlərdən biri idi. Tarix və ədəbiyyat fənlərindən təcrübə rəhbəri olduğuna görə H.Mahmudbəyov dostu S.M.Qənizadə ilə tez-tez onun yanına gedib nümunə dərsləri üçün məsləhətlər alar, dərs planlarını, tədris sənədlərini yoxladar, müxtəlif məsələlər, o cümlədən “çar hökumətinin istibdadı altında əzilən məhkum millətlərin qəmnak yaşayışından mehriban söhbətlər edərdilər”.

İnstitutda gizli inqilabi qruplar fəaliyyət göstərirdi ki, Həbib bəy Mahmudbəyov da tələbə yoldaşı S.M.Qənizadə ilə birlikdə belə qrupların birində iştirak edirdi. Qrupun rəhbəri Mixail Beğanov idi. O, ali məktəbi qurtardıqdan sonra həmin qrupa Niko rəhbər seçilmişdi. Tələbələrin hər ikisi milliyyətcə gürcü idi. İnqilabi siyasi mübarizə meydanında milli ayrı-seçkilik olmasa da ictimai mühitdə velikorus şovinizmi, rus millətindən olanların digər xalqın nümayəndələrinə qarşı milli həqarəti, etnik zəmində ayrı-seçkilik tez-tez müşahidə edilirdi. Bunun ən bariz nümunəsi odur ki, H. Mahmudbəyov dostları S.M.Qənizadə və S.Əbdürrəhmanbəyovla birlikdə “Şəhər məktəbi müəllimi” adı alsalar da islam dininə mənsub olduqları səbəbindən təyinatdan kənarda qaldılar. Azərbaycanlı tələbələrə qarşı milli ayrı-seçkiliyin, həqarətli münasibətin zirvəsi 1887-ci ilin iyun ayının 20-də məzunların təyinat bölgüsündə baş verdi. Əvvələn, bu münasibət məzunlara medal verilərkən üzə çıxdı. Ənənəyə görə hər il Aleksandrovski Müəllimlər İnstitutunu daha yaxşı qiymətlərlə bitirən tələbələrdən birinə qızıl, ikisinə isə gümüş medal verilirdi.

***Həbib bəy İbrahimxəlil oğlu Mahmudbəyov***

1887-ci il məzunları arasında ən yaxşı qiymət göstəricisi Süleyman Əbdürrəhmanbəyovun olduğu, əvvəldən qızıl medalın ona verilməsi nəzərdə tutulduğu halda təntənəli mərasim zamanı imperiyanın Qafqaz canişinliyi üzrə maarif popeçiteli (qəyyumu) K.P.Yanovskinin və mərasimin rəsmi heyətində iştirak edən çar Rusiyasının irticaçı dövlət xadimi, sinodun baş prokuroru K.P.Pobedonostsevin (1827-1907) bacısı, yaşlı bir rus qadınının təklifi ilə qızıl medal rus millətindən olan başqa birinə verildi. S.Əbdürrəhmanbəyova isə gümüş medal təqdim edildi. Bundan əlavə ali məktəbi bitirən 27 nəfər məzundan 24-nə təyinat verilsə də, yalnız 3 nəfər azərbaycanlı tələbə təyinatdan məhrum oldu. Buna səbəb 1882-1887-ci illərdə imperiyanın maarif naziri olmuş İ.D.Delyanovun (1818-1897) 6 oktyabr 1885-ci il tarixli fərmanı idi. Həmin fərmanın tələblərinə görə S.M.Qənizadə, H.Mahmudbəyov və S.Əbdürrəhmanbəyov islam dininə mənsub olduqları səbəbindən təyinatdan kənarda qaldılar. Ali tipli şəhər məktəblərində işləmək onlara qadağan idi.Təyinat ala bilməyən S.Əbdürrəhmanbəyov tezliklə evlərinə qayıtdı. S.M.Qənizadə və H.Mahmubdəyov isə nəyəsə nail olmaq ümidilə bir neçə gün Tiflisdələngidilər. Onlar yenidən İnstitutun direktoru D.V.Kolloviçin qəbulunda oldular. Kolloviç onları ehtiramla qarşıladı. Popoçitellə danışıb bir şey etməyə çalışacağını, ancaq bu işin xeyli çəkəcəyini söylədi. Tələbələrə məsləhət gördü ki, Tiflisdə qalıb vaxt itirməyin mənası yoxdur. Onlar Şamaxıya, öz vətənlərinə gedib, orada gözləsinlər. Bir nəticə olan kimi onlara xəbər veriləcək.

Qənizadə və Mahmudbəyov son ümid yeri kimi Zaqafqaziya Müsəlman Ruhani İdarəsinin müftisi Hüseyn Əfəndi Qayıbova (1830-1917) və Zaqafqaziya Müsəlman Ruhani İdarəsinin Şeyxülislamı Əbdüssəlam Axundzadəyə (1843-1907) müraciət etməyi qərara aldılar. Lakin hər iki şəxs məzuniyyətə çıxıb yaylağa istirahətə getdikləri üçün onları evlərində tapa bilmədilər. Hər yerdən əlləri üzüldüyünə görə Şamaxıya qayıtdılar.

Az sonra H.Mahmudbəyov dostu S.M.Qənizadə ilə birlikdə Bakıya gəlir və burada 1887-ci ildə ilk "rus-müsəlman" ("rus-tatar") məktəbi açırlar. G.Məmmədova yazır ki, *S.M.Qənizadənin 1887-ci ildə həmkarı və dostu H.Mahmudbəyovla birlikdə açdığı "rus-müsəlman" məktəbi bütün Rusiya müsəlmanları coğrafiyasında, o cümlədən Qafqaz və Azərbaycanda milli dildə başlanan yeni tipli təhsil və məktəb işinin başlanğıcı, müasir dünyaya inteqrasiyaya yönəlmiş "üsuli-cədid" hərəkatının böyük hadisəsi idi. Əqidə dostlarının təşəbbüsündən sonra tədricən "rus-müsəlman" məktəblərinin sayı artdı, şəbəkəsi genişləndi, məktəblərdə ana dilində tədrisdə mühüm yeniliklər baş verdi, milli dilin tədrisdə mövqeyi tədricən genişləndi və möhkəmləndi. Bu isə öz növbəsində milli ruhlu və əqidəli, vətən və xalq mənafeyini düşünən, bu yolda çalışan*

*ziyalıların sayının artmasına, milli oyanışın daha da qol-qanad açmasına səbəb oldu".*

Məktəbdə Həbib bəy hesab və rus dilini, S.M.Qənizadə ana dili və fars dilini tədris edirdi. Şəxsi məktəbin uğurları o qədər böyük olur ki, Bakı Duması dövlətin vəsaiti hesabına 1891-ci ildə Çəmbərəkənddə və Zərgərbazarda "rus-tatar" məktəbləri açır. Həbib bəy Mahmudbəyov 1-ci "rus-tatar" məktəbinə müdir təyin olunur. O, həm də 1889-cu ilin sentyabrından 1891-ci ilin sentyabrına kimi Mixaylovski Bakı şəhər məktəbində müəllimlik etmişdir. 1896-cı ildə S.M.Qənizadə, İ.Məlikov və başqaları ilə birlikdə rus-müsəlman kitabxanası təşkil etmişdi. Qafqaz Təlim Dairəsinin 1905-ci il 17 sentyabr 1386 saylı əmrinə əsasən o, 2 sinifli şəhər məktəbinə müdir vəzifəsinə təyin olunur, 1916-cı ilə qədər həmin vəzifədə çalışır.

Həbib bəy Mahmudbəyov Bakıda nəşriyyat yaratmaq uğrunda mübarizəsi ilə də diqqəti cəlb edir. O zaman Bakıda kitablar nəşr edən professional texniki imkanlara malik mətbəənin olmaması kitab yazan müəlliflər üçün ciddi problemlər yaradırdı. Bu səbəbdən də o, Sultan Məcid Qənizadə və Əbdülxalıq Axundovla birlikdə Bakıda kitab çap etmək məqsədilə nəşriyyat yaratmaq istəyirlər. H.Mahmudbəyov, Ə.Axundov və S.M.Qənizadə 1897-ci ilin yanvarında rəsmi icazə almaq üçün Bakı qubernatoruna müraciət edirlər. Lakin onların xahişi müxtəlif bəhanələrlə rədd edilir. 1898-ci ildə öz plan və layihələrində bəzi dəyişikliklər edən dostlar nəşriyyatın açılmasına icazə almaq məqsədilə yenidən Bakı qubernatoruna ərizə təqdim edirlər. Bu dəfə qubernator və polismeystr şirkəti təşkil edən ziyalıların tərkibini, "siyasi etibarlılığını" diqqətlə yoxlayıb, Mahmudbəyov ilə Qənizadənin bu işə rəhbərlik etməsini məqsədəuyğun hesab etmədilər. 1898-ci ilin iyulunda şirkət Əbdülxalıq Axundovun rəhbərliyi altında fəaliyyət göstərməyə başladı.

Həbib bəy Mahmudbəyov teatr həvəskarı olmuş, teatr truppasına rəhbərlik etmişdir. Onun adı "Azərbaycan teatr tarixi" kitabına düşüb. Kitabda Həbib bəy Mahmudbəyovun və müasirləri olan Ağa Kərim Şərifov, Əsgər ağa Gorani, Qaflan Muradov, Sultan Məcid Qənizadə kimi şəxsiyyətlərin teatr sənətinin inkişafındakı xidmətləri tarixi faktlar əsasında açıqlanır.

Həbib bəy Mahmudbəyovun xeyirxahlığı nəticəsində gələcəyin məşhur aktyoru Hüseyn Ərəblinski "Üçüncü rus-tatar" məktəbinə qəbul olunmuşdu.

1878-ci ildə Bakıda Dumaya seçkilər zamanı Həbib bəy Mahmudbəyov Dumaya qlasnı seçilmişdi. Duma üzvünə o zaman "qlasnı" deyilirdi. Dumaya yaşı 25-dən yuxarı olan, daşınmaz əmlak sahibləri və ya 1500 manatlıq məbləğdə ticarət və sənaye müəssisələrinə malik şəxslər seçilə bilərdilər.

*Həbib bəy İbrahimxəlil oğlu Mahmudbəyov*

Həbib bəy Mahmudbəyov Dumaya əmlak sahibi kimi deyil, başçısı ölmüş varlı ailələrin qəyyumu kimi seçilmişdi. Fərmanda varlı ailələrinə qəyyumların Dumaya seçilə biləcəyinə icazə verilirdi. Həbib bəy qlasnı kimi bir çox ictimai işlərdə fəal iştirak etmişdi. 1906-cı ildə Bakı şəhər dumasında məktəb komissiyasının üzvü kimi Azərbaycan müəllimlərinin I qurultayına hazırlıq işlərində və onun keçirilməsində yaxından iştirak edir. Burada o, müəllimlərin, xüsusilə rus-müsəlman məktəblərində dərs deyən Azərbaycan dili müəllimlərinin əmək haqqının artırılması üçün xüsusi səy göstərmişdir.




*2 saylı Texniki-Humanitar Elmlər liseyində H.Mahmudbəyovun büstü*

XX əsrin 20-ci illərində Azərbaycanda ictimai-pedaqoji həyatda, xalq təhsilinin yeni istiqamətdə inkişafında, ali pedaqoji təhsilin təşkilində Həbib bəy Mahmudbəyovun mühüm xidmətləri olmuşdur

O, pedaqoji kursların, yaşlılar üçün axşam kurslarının təşkilində fəallıq göstərmişdir. Bu kurslar Həbib bəy Mahmudbəyovun müdir olduğu məktəbdə təşkil olunmuşdu. Ali Pedaqoji Kişi İnstitutunun təşkilat komissiyasının üzvü kimi pedaqoji institutun təşkilində fəal iştirak edib. 1921-ci ildə Ali Pedaqoji İnstitut yaradılarkən əvvəl həmin ali məktəbdə direktor müavini, 1924-cü ildə qısa bir müddətdə direktor vəzifəsində çalışmışdır.

H.Mahmudbəyovun sonrakı fəaliyyəti əsasən 1887-ci ildə yaratdığı məktəblə (indiki 2 saylı Texniki-Humanitar Elmlər liseyi) bağlı olub. O, burada rus dili və ədəbiyyatından dərs deyib.

Həbib bəy Mahmudbəyov 1928-ci ildə Bakıda vəfat edib. Hazırda Bakıdakı 2 saylı Texniki-Humanitar Elmlər liseyi Həbib bəy Mahmudbəyovun adını daşıyır.

Oğlu Şamil Mahmudbəyov 1898-ci ildə anadan olmuş, Bakı realnı məktəbini (1916), Kiyev Politexnik İnstitutunu bitirmişdir. N.Nərimanovun şəxsi katibi olmuş, Şuşa İcraiyyə Komitəsinin sədri, Qarabağ və Zəngəzurun fövqəladə komissarının müavini, Naxçıvan Daxili İşlər Xalq Komissarı, Naxçıvan SSR-in Xalq Komissarları Şurası sədrinin müavini və sədri, Azər-



*Həbib bəyin oğlu Şamil Mahmudbəyov*

baycan Mərkəzi İcraiyyə Komitəsinin işlər müdiri olub.

1924-1928-ci illərdə "Azərbaycan Dövlət Kino"sunun rəhbəri, 1931-ci ilə kimi Kənd Təsərrüfatı İnstitutunun tədris işləri üzrə prorektoru vəzifələrində çalışıb.

1931-ci ildə Şamil Mahmudbəyov Moskvada Qırmızı Professorlar İnstitutunda oxuyub. 1933-cü ildə Qorki şəhərinə Marksizm-Leninizm İnstitutuna oxumağa göndərilib. 1936-cı ilin martında Marksizm-Leninizm İnstitutunun IV kursunda təhsil alarkən əks-inqilabi fəaliyyətdə ittiham edilərək bir neçə tələbə yoldaşı və onlara dərs deyən professorla birlikdə həbs olunub.

Ona ünvanlanan ittihamları qətiyyətlə rədd edən Şamil Mahmudbəyov 1936-cı ildə güllələnib.

SSRİ Ali Məhkəməsinin Hərbi kollegiyasının qərarı ilə 30 aprel 1957-ci ildə Şamil Mahmudbəyova tam bəraət verilib.

**Ədəbiyyat**


1. Ali Pedaqoji İnstitutun salnaməsi. Bakı,1924
2. Ali Pedaqoji İnstitut. Beş illik. Bakı, 1926
3. Rzayev A. Azərbaycanda sovet hakimiyyəti illərində ali pedaqoji təhsilin inkişaf
4. taixindən. Bakı,Azərnəşr, 1960, s.30-37
5. Əhmədov H. Azərbaycanda məktəb və pedaqoji fikir tarixi.Bakı, Elm və təhsil, 2014
6. Məmmədov Y. Azərbaycan Dövlət Pedaqoji Universiteti.Bakı, Elm və təhsil, 2012
7. Mustafayeva D. Görkəmli maarifpərvər müəllim Həbibbəy Mahmudbəyov //"Azəbaycan məktəbi" jurnalı, 1961, № 6
8. Məmmədova G. Pedaqoji irsimizdən:Sultan Məcid Qənizadə. Bakı, "Elm və təhsil", 2016
9. https://ru.wikipedia.org/wiki


***Həbib bəy İbrahimxəlil oğlu Mahmudbəyov***



## ŞARİF ƏHMƏDZYANOVİÇ MANATOV
*(1887-1936)*

Tanınmış ictimai-siyasi və dövlət xadimi, başqırd milli hərəkatının görkəmli nümayəndəsi Şarif Əhmədzyanoviç Manatov 20 oktyabr 1887-ci ildə (bəzi mənbələrə görə, 1892 ci ildə) Orenburq quberniyasının Çelyabinisk qəzasının Katay nahiyəsinin Manatovo kəndində (indi Kurqan vilayətinin Almenev rayonu ərazisində yerləşir) molla ailəsində anadan olub. İlk təhsilini imkanlı maarifpərvər başqırdın köməyi ilə Ufa şəhərindəki "Haliyə" mədrəsəsində alıb, burada ərəb və fars dillərini, şəriət qayda-qanunlarını və Quran oxumağı öyrənib. Sonra təhsilini üç əsas və bir hazırlıq sinfindən ibarət olan Semipalatiniski Müəllimlər Seminariyasında davam etdirib.

1910-cu ildə seminariyanı uğurla bitirən Şarif Manatov Peterburq Psixonevroloji İnstitutunun Pedaqoji fakültəsinin "Ümumi tarix" ixtisasına daxil olub. Təhsil illərində tələbə dərnəklərinin fəal üzvü olub, bolşeviklərin "Ulduz"("Звезда") qəzeti ilə əməkdaşlıq edib. 1914-cü ildə üçüncü kursda oxuyarkən təhsilini yarımçıq qoyaraq Ufada nəşr olunan "Həyat" ("Tormoş") qəzetində jurnalistlik fəaliyyətinə başlayıb. Ali təhsil almaq məqsədilə həmin il İstanbul Universitetinə qəbul olunub.

"Ulduz" qəzetindəki məqaləsində inqilabi ideyaları təbliğ etdiyinə görə həbs olunmaq təhlükəsi ilə üzləşdiyindən Avropaya mühacirət etməli olur. 1915-ci ilin yanvar ayından 1916-cı ilin mart ayına kimi Cenevrə şokolad fabrikində, sonra isə şəhərdən kənarda yerləşən One fermasında işləyir. İsveçrənin Sürix şəhərində mühacirət həyatı yaşayan V.İ.Leninlə tanış olur. Sonralar Şarif Manatov bu görüşün kafelərin birində baş tutduğunu, V.İ.Leninlə bir yerdə kofe içdiklərini və başqırd xalqının milli idealları barədə xey-

li söhbət etdiklərini yazırdı. 1917-ci ilin yanvarında Şarif Manatov menşevik-beynəlmiləlçilər partiyasına üzv qəbul olunur. Fevral inqilabından sonra Rusiyada yaranan ictimai-siyasi vəziyyətlə əlaqədar olaraq o, Orenburqa qayıdır, Başqırdıstan milli hərəkatının və Başqırdıstan muxtariyyəti uğrunda hərəkatın liderlərindən birinə çevrilir.

Başqırdıstan vilayət şurası 20 iyul 1917- ci ildə Orenburqda I Ümumbaşqırdıstan qurultayı keçirtdi. Qurultayda 6 nəfərdən ibarət icra komitəsinin Mərkəzi Şurası yaradıldı ki, Şarif Manatov da həmin Şuraya sədr seçildi. Şuranın əsas vəzifəsi Rusiyanın tərkibində Başqırdıstanın muxtariyyəti ilə bağlı danışıqlar aparımaq idi. 1917 -ci ilin avqustun 25-29 -da Ufa şəhərində II Ümumbaşqırdıstan qurultayı keçirildi. Qurultay iştirakçıları Rusiyanın federativ-demokratik quruluşuna tərəfdar çıxmaqla yanaşı, 12 nəfərdən ibarət Vilayət Şurası seçdi. Şuranın sədri yenidən Şarif Manatov, müavini isə Əhməd Zəki Validov (Əhməd Zəki Vəlidi Toğan) seçildi. 1917-ci ildə oktyabr inqilabından sonra Şarif Manatov Şura ilə birgə Orenburqa köçdü və burada Şura "Vətənin və inqilabın xilası komitəsi"nə qoşuldu. Orenburqda yerləşən Başqırd Hökuməti 11 noyabr 1917-ci ildə ilk fərmanı ilə başqırdlar üçün xüsusi milli idarəetmənin zəruriliyini təsdiq etdi. 4 gün sonra Başqırd Vilayət Şurası Başqırdıstanın muxtariyyətini elan etdi. Başqırdıstanın muxtariyyəti ilə bağlı fərmanı şuranın sədri Şarif Manatov, onun müavini Əhməd Zəki Validov, şuranın katibi Seyidzadə Babiş və şuranın 6 şöbə müdiri imzaladı. Fərmanda yazılırdı: *"Başqırd Vilayət Şurası başqırd ərazisini Orenburq, Ufa, Samara, Perm quberniyaları olmaqla 15 noyabrdan Rusiya Respublikasının muxtar hissəsi elan edir"*. Şarif Manatov Başqırd Hökümətinin sədri kimi Rusiya Xalq Komissarları Soveti ilə Başqırdıstanın muxtariyyəti ilə bağlı danışıqlar aparmaq üçün Başqırd parlamenti tərəfindən səlahiyyətli şəxs kimi təsdiq edildi. 8-20 dekabr 1917-ci ildə Orenburqda III Ümumbaşqırd qurultayı keçirildi. Burada Başqırdıstanın müstəqilliyi haqqında qərar qəbul edildi və ərazi 9 kantona bölündü. Qurultayda muxtar idarəçiliyin orqanları yaradıldı, 25 nəfərdən ibarət (22 nəfər üzv, 3 nəfər namizəd) parlamentqabağı tərkib müəyyən edildi. Gizli səsvermədə səlahiyyətli səslərdən parlamentqabağı üzvülüyə ilk 2 yeri Şarif Manatov və Əhməd Zəki Validov tutdu. Şarif Manatov 6 (19) yanvar 1918-ci ildə Başqırdıstanın muxtariyyəti ilə bağlı danışıqlar aparmaq üçün səlahiyyətli şəxs qismində Petroqrada getdi. O, RSFSR Xalq Komissarları Sovetində Başqırdıstanın muxtariyyatı ilə bağlı məsələnin təsdiqinə nail olmalı idi. Şarif Manatov Petroqradda olarkən ona Başqırdstanın muxtariyyətı ilə bağlı danışıqlar aparmaq üçün xüsusi səlahiyyət vermiş Təsisçilər iclası artıq buraxılmışdı.

***Şarif Əhmədzyanoviç Manatov***



*Başqırdıstanın müstəqilliyini elan edən III Ümumbaşqırd qurultayının iştirakçıları*

7 yanvar 1918-ci ildə Şarif Manatovun Smolnıda V.İ.Leninlə görüşü baş tutdu. Görüşdə V.İ.Lenin ondan tatar və başqırdlar arasında milli hərəkatın gedşi, müsəlman liderlərinin sovet hökumətinin tərəfinə cəlb etmək imkanı barədə xeyli söhbət etdi. Şarif Manatov bildirdi ki, bir qrup insanlar var ki, başqırd hərəkatının inqilabın əleyhinə yönəldiyini iddia edirlər, bu həqiqətə uyğun deyil. Əgər bizim muxtariyyət tanınarsa, başqırd milli hərəkatı sovetlərə deyil, Dutova qarşı mübarizədə böyük bir qüvvə olacaq. V.İ.Lenin Başqırdıstanın muxtariyyət məsələsinə ciddi reaksiya verdiyindən Şarif Manatov Petroqradda qalmalı oldu. Şarif Manatov sonralar xatirələrində yazırdı ki, V.İ.Lenin söhbət zamanı mərkəzi müsəlman müəssisəsi yaratmaq təklifini verdi və mənə üzünü tutaraq dedi:“*Əgər İ.V.Stalinlə bir yerdə fəaliyyət göstərərsinizsə, onda arzuladığınız hər şeyə nail ola bilərsiniz. Söhbət zamanı məndə muxtariyyətin təsdiqinə böyük inam yarandı”* (3).

V.İ.Leninin təklifi ilə RSFSR Xalq Komissarları Sovetinin nəzdində Rusiya müsəlmanlarının işləri üzrə komissarlıq yaradıldı. Kazan quberniyasından Molla Nur Vahitov sədr, Ufa quberniyasından Qalimcan İbrahimov və Orenqburq quberniyasından Şarif Manatov isə sədr müavinləri təsdiq edildi. Komissarlığın aparatının formalaşması çox tez başa çatdı. Komissarlığın xüsusi orqanı - “Çulpan” (“Səhər ulduzu”) qəzeti nəşrə başladı. Şarif Manatov komissarlıqdakı işinin çox olmasına baxmayaraq tatar dilində nəşr olunan “Çulpan” qəzeti ilə sıx əməkdaşlıq edirdi.

4 fevral 1918-ci ildə Başqırdıstan Müvəqqəti İnqilab Şurası yaradıldı. Onların tələbi ilə 1917-ci ilin dekabr ayında Başqırd qurultayında seçilmiş

Başqırd höküməti və Şura üzvləri həbs edildi. Müvəqqəti İnqilab Şurası elə həmin gün RSFSR Xalq Komissarları Sovetinə Şarif Manatovun həbs edilməsi ilə bağlı teleqram göndərdi. Başqırdıstan Müvəqqəti İnqilab Şurasının Ş.Manatovun həbsi ilə bağlı müraciətini İ.V.Stalin belə cavablandırmışdı: "*Ş.Manatov XKS yanında millətlər komissarlığının üzvü təsdiq edilmişdir. O, sizin teleqramla nə həbs olunacaq, nə də tutduğu vəzifədən azad ediləcəkdir"*. Az sonra (23 mart 1918) "Pravda" qəzetində Şarif Manatovun İ.V.Stalin, M.N.Vahitov, Q.Q.İbrahimovla birgə imzaladığı "Tatar-Başkırd Muxtar Sovet Respublikasının təşkili haqqında Əsasnamə"nin layihəsi dərc olundu. Ümumiyyətlə, o dövrdə Şarif Manatov Rusiyada yaşayan müsəlmanlarla bağlı dekretlərin hazırlanmasında fəal iştirak etmişdir.

1918-ci ildə Şarif Manatov RSDF(b)P sıralarına qəbul edilir. Elə həmin il Türkiyədə Kommunist Partiyasının yaradıcısı Mustafa Subhi (1883-1921) ilə tanış olur. Tarixçilər belə ehtimal edirlər ki, Sarif Manatovu Türkiyədə gizli inqilabı işə məhz M.Sübhi dəvət etmişdir.

O, 1918-ci ilin mayında Ufada səfərdə olarkən millətlər komissarlığının üzvü və səfər yoldaşı Qalimcan İbrahimov tərəfindən həbs etdirilir. Şarif Manatov həbsi ilə bağlı İ.V.Stalinə məktub göndərir. Onun göstərişi ilə o, dərhal həbsdən azad olunur.

1919-cu ilin yanvarında Kommunist Partiyasının yaradılmasına köməklik göstərmək məqsədilə İ.V.Stalin tərəfindən Türkiyəyə göndərilir. Ankara Kommunist Partiyasının rəyasət heyətinə seçilir, burada "Yeni dünya" qəzeti təsis edir və ona rəhbərlik edir. 1920-ci ilin payızında kommunizm ideyalarını təbliğ etdiyinə görə Ankarada həbs edilsə də, qaçmağa müvəffəq olur. Türkiyədən qayıdan Şarif Manatov Xalq Komissarları Sovetinin 21 dekabr 1920-ci il dekreti ilə Başqırdıstan MSSR-ə Millətlərin işi üzrə Xalq Komissarlığının səlahiyyətli nümayəndəsi təyin edilir.

1923-cü ilin mart ayında Türküstan Xalq Maarif Komissarlığının Dövlət Elm Şurasına rəhbər təyin olunur. 1923-cü ilin dekabrından 1925-ci ilin may ayınadək Başqırdıstan MSSR Xalq Maarif Komissarlığı yanında Akademik Mərkəzə rəhbərlik edir.

1924-cü ilin sentyabrında sovet müəssisələrinin "arzuolunmaz elementlərdən" təmizlənməsi kompaniyasında o da "millətçi" kimi işdən azad edilir. V.İ.Lenin və İ.V.Stalinlə şəxsi münasibəti onu ölüm təhlükəsindən xilas edir. Yenidən ictimai-siyasi və pedaqoji fəaliyyətini davam etdirir. Az bir müddət Yaroslavl Pedaqoji İnstitutunda işləyir, Azərbaycan Kommunist Partiyasının dəvəti ilə Bakıya - Xalq Maarif Komissarlığına işə dəvət olunur. 1924-cü ildə Azərbaycan Dövlət Kişi Pedaqoji İnstitutuna direktor (rektor) təyin edilir. Sonra Azərbaycan KP MK-nın mətbuat şöbəsinin müdiri vəzifəsində çalışır. Həmin

***Şarif Əhmədzyanoviç Manatov***

dövrdə Bakıda onun müdirliyi (redaktorluğu) ilə “Məktəb məcmuəsi” jurnalı nəşr olunur. Təhsil tariximizin yorulmaz tədqiqatçısı, əməkdar müəllim N.Nəsrəddinovun araşdırmalarına görə, 1925-ci ildə nəşrə başlayan jurnalın cəmi 1 sayı nəşr olunmuşdur. İlk nömrəsi 2000 nüsxə tirajla çıxan “Məktəb məcmuəsi”nin birinci səhifəsindəki “İdarədən” qeydindən məlum olur ki, o, tətil edən “Məktəb” dərgisinin davamçısıdır.

Dərginin fəal müxbirlərinin cərgəsində 1911-1920 ci illərdə Bakıda nəşr olunan “Məktəb” jurnalının redaktorunun adının görünməsi də bunu təsdiq edir. Jurnalın əsas əməkdaşları Şarif Manatov (redaktor), Xəlil Fikrət, İsmayıl Hikmət, Kərim İsmayılzadə, Abdulla Şaiq, Məhəmməd Kərimzadə idi. Onların hamısı nüfuzlu ali məktəb və mədrəsələrdə təhsil almışdılar. Jurnalın son səhifəsində oxuculara ünvanlanmış müraciətdən aydın olur ki, jurnal *“Hər on beş gündən bir müntəzəm surətdə çıxacaqdır. Məcmuədə ən dəyərli və bilikli müəllimlər ədəbi-elmi yazılarla iştirak edəcəkdir. Həvəskar məktəblilərin də yazıları məcmuəmizdə məmnuniyyətlə dərc ediləcəkdir. Məcmuəmiz məktəblilərin olduğu üçün bütün məktəblilər almalı və yazı yazmalıdırlar”*. Təəssüf ki, “Məktəb məcmuəsi”nin ikinci nömrəsi işıq üzü görmədi. Şarif Manatovun Bakıdan getməsi jurnalın fəaliyyətinin dayandırılmasına səbəb oldu.




*Şarif Manatovun redaktorluğu ilə Bakıda nəşr olunan "Məktəb məcmuəsi"nin ilk və son sayı, 1925, №1*

O, Bakıda olarkən geniş ictimai-siyasi fəaliyyət göstərməklə yanaşı dövri mətbuatda maraqlı məqalələrlə çıxış etmişdir. Onun “Şuralar İttifaqının sənaye dövriyyəsi” (“Kommunist yolu”, 1925, №9-10), “Qızıl Şərq ölkələrində” (“Dan ulduzu”, 1926, №4, s.9-10), “Kəndin iki qüvvəsi” (“İqtisadi xəbərlər”, 1927, №9-10, s.33-41), “Şuraların kütləvi işlərdəki təcrübəsi“ (“İqtisadi xəbərlər”,1927, №11-12, s.64-71) adlı məqalələri məhz Azərbaycan mətbuatında işıq üzü görmüşdür.

***Şarif Əhmədzyanoviç Manatov***

1925-1931-ci illərdə Zaqafqaziya Kommunist İnstitutunda "Bolşevizmin və leninizmin tarixi" fənnindən mühazirələr oxuyur, Zaqafqaziya Partiya Vilayət Komitəsinin təbliğat- təşviqat şöbəsinə rəhbərlik edir.

1926-cı ildə Bakıda tarixi hadisə baş verdi. 1926-cı il fevralın 26-dan martın 6-dək Bakıda keçirilən Birinci Türkoloji Qurultay türk xalqlarının həyatında müstəsna rol oynadı.Türkoloji Qurultay türk xalqlarının mədəni inteqrasiyasında yeni bir mərhələnin təməlini qoydu. Qurultayda əsaslı müzakirə predmetinə çevrilmiş problemlərlə bağlı böyük perspektiv əhəmiyyətə malik qərarlar qəbul edildi, latın qrafikalı yeni əlifbaya keçidin elmi-metodik prinsipləri işlənib hazırlandı. Həmin əlifbanın ilk kütləvi tətbiqinə türkdilli respublikalardan məhz Azərbaycanda başlanılması hələ XIX əsrdən etibarən burada mütərəqqi ziyalıların əlifba islahatı uğrunda fəal şəkildə apardıqları mübarizənin nəticəsi idi. Türkoloji Qurultayın keçirilməsində fəallıq göstərən başqırd ziyalılarından biri də Şarif Manatov idi.

Ş.Manatov 1931-ci ildə səhhətinin pisləşməsi səbəbindən Krıma köçmək məcburiyyətində qalır. Burada o, həm müalicə olunur, həm də Simferopol Ali Kommunist Məktəbində professor işləyir, həmçinin Tarix kafedrasına rəhbərlik edir. 1 oktyabr 1932 - ci ildə ÜİK(b)P MK-nın göndərişi və məşhur rus şərqşünası, akademik S.F.Oldenburqun təqdimatı ilə SSRİ Elmlər Akademiyasının Şərqşünaslıq İnstitutunun aspiranturasının "Türkiyə tarixi" ixtisasına qəbul olunur və akademik İ.Y.Kraçkovski ona elmi rəhbər təyin edilir. 9 oktyabr 1933- cü ildə Siyasi kitabxananın elmi ədəbiyyat şöbəsinə yarım ştat baş kitabxanaçı təyin edilir. Həmin ilin noyabrından aspiranturaya qəbul olunduğu üçün siyasi kitabxanadan işdən azad edilir. 1933-cü ildə SSRİ Elmlər Akademiyasının Şərqşünaslıq İnstitutunun arxivində araşdırdığı mövzu üzərində işləyir. Onun arzusu klassik ərəb ədəbiyyatı üzrə ixtisaslaşmaq idi. İ.Y. Kraçkovski onun bu sahədəki ilkin biliyini yoxlayandan sonra belə qərara gəlmişdi ki, Manatovun mədrəsədə aldığı məhdud biliklər onun klassik ərəb ədəbiyyatından mühazirə oxuması üçün yetərli deyil. Ona görə də İ.Y. Kraçkovski Manatova ənənəvi müsəlman məktəblərində müxtəlif türk və ərəb dillərinin tədrisi məsələlərini öyrənməyi tövsiyə etdi. İnqilabdan əvvəlki dövrdə Rusiya müsəlmanlarının (Qafqaz, Türküstan və Başqırdıstanda yaşayan) yazılı və tədris ədəbiyyatına ərəb mədəniyyətinin təsirinin araşdırılması dissertasiya mövzusu kimi müəyyənləşdirildi. Səhhətində yaranmış problemlər Ş.Manatova aspiranturada təhsilini davam etdirməyə imkan vermədiyinə görə, o, 1 may 1934 -cü ildə aspiranturadan azad olundu.

Qırgız Pedaqoji İnistitutuna professor vəzifəsinə işə dəvət olunan Manatov Frunze şəhərinə köçür və institutda "Ümumi tarix" fənnindən mühazirələr oxuyur. Frunzedə olarkən xəstəliyi şiddətləndiyindən 1935-ci ildə

Başqırdıstana müalicə olunmağa qayıdır. O, burada olarkən xüsusi xidmət orqanlarına xəbər verilir ki, Ş.Manatov özünü "xəstə hesab etsə" də əslində Ufa şəhərində olmağından istifadə edərək, partiyadan qovulmuş və işdən çıxarılmış məhbuslarla görüşür.

Bu xəbərdarlıq Manatova baha başa gəlir, onu 31oktyabr 1935-ci ildə Frunze şəhər Partiya Komitəsinin qərarı ilə "əksinqilabi burja-milliy- yətçi ideologiyasından azad olunmadığı üçün" ÜİK(b)P üzvlüyündən və işdən azad olunur. Ona qarşı edilən haqsızlıqla barışmayan Ş.Manatov Vilayət Kommunist Partiyasına ərizə ilə müraciət edərək onun üzərindən ittihamın götürülməsini xahiş edir. Bu elə bir dövr idi ki, siyasi rejim ziyalılara qarşı çox amansız idi. Hər yerdə "siyasi düşmən" axtarılırdı, repressiya maşını işə düşmüşdü. Təhlükəni hiss edən Şarif Manatov ailəsi ilə birlikdə (həyat yoldaşı və 4 övladı) Çelyabinsk vilayətinin Smorodinka kəndinə qardaşının yanına köçür. 1936-cı ilin martında səyyar partiya üçlüyü Ş.Manatovun ərizəsinin Vilayət Partiya Komitəsinin kollegiyasında baxılması razılığına gəldilər, lakin Manatov məsələyə yenidən baxılmasınadək yaşamadı. 1936-cı ildə dünyasını dəyişdi və kənd qəbristanlığında təmtəraqlı şəkildə dəfn edildi.

Yalnız SSRİ-də "mülayimləşmə"dən sonra Şarif Manatovun həyat yoldaşının ərinin günahsız yerə partiyadan və işdən çıxarılması ilə bağlı ərizəsinə 21 iyun 1962 -ci ildə Sov.İKP MK Vilayət Partiya Komitəsinin iclasında baxılır və ona bəraət verilir. Vəfatından sonra ailəsi Litvaya köçüb və orada yaşayıb. Oğlu Şamil müharibə illərində hərbi təyyarəçi olub, sonra mülki aviasiyada çalışıb.

## Ədəbiyyat


1. Ali Pedaqoji İnstitutun salnaməsi. Bakı,1924
2. Ali Pedaqoji İnstitut. Beş illik. Bakı, 1926
3. Уральская Историческая Энциклопедия. http://www.ural.ru/spec/ency/encyclopaedia
4. Давлетшин Р.А., Исхаков С.М. Манатов Шариф Ахметзянович // Политические деятели России 1917 г. Биографический словарь. – М., 1993, с. 203
5. Давлетшин Р.А., Исхаков С.М. Манатов Шариф Ахметзянович // Уральская историческая энциклопедия. – Екатеринбург, 2000
6. Манатов Шариф Ахметзянович. – http://www. hrono.info/biograf/manatov.html
7. Кем был Шариф Манатов? http://ufa-gid.com/ocherki/kem-byl-sharif-manatov.html
8. https://ru.wikipedia.org/wiki /Манатов Шариф Ахметзянович


***Şarif Əhmədzyanoviç Manatov***



## CƏLİL MƏMMƏD OĞLU MƏMMƏDZADƏ
*(1888- 1934)*

XIX əsrin sonu, XX əsrin əvvəllərində Şuşa Azərbaycanın elm, təhsil, mədəniyyət və sənət beşiyi idi.”Zaqafqaziyanın konservatoriyası” adlanan Şuşada dini və dünyəvi məktəblər, kitabxanalar, mətbəələr, muğam evləri, xeyriyyə cəmiyyətləri, şeir-sənət məclisləri fəaliyyət göstərirdi. Cənubi Qafqazda ilk dünyəvi məktəb-qəza məktəbi 1830-cu ildə məhz Şuşada açılmışdı. Burada yeni tip məktəblərin fəaliyyəti üçün münbit şərait var idi, açılan dünyəvi məktəblər Şuşanın maarifpərvər insanları tərəfindən rəğbətlə qarşılanır, maddi və mənəvi dəstək qazanırdı. Şuşada dünyəvi məktəblərin (qəza, real və şəhər məktəbinin) yaranması yeni ziyalı nəslinin yetişməsində müstəsna rol oynadı. Şuşalı gənclərin buradan başlanan təhsil yolu Türkiyə, Ukrayna, Rusiya və Avropa universitetlərinə qədər uzanaraq onları şöhrətin uca zirvəsinə yüksəltdi.

Adını Azərbaycanın təhsil və mədəniyyət tarixinə yazmış belə ziyalılardan biri də Kiyev Politexnik İnstitutunun məzunu Cəlil Məmmədzadədir. O, çox gənc ikən böyük şöhrət sahibi olmuş, eyni vaxtda Xalq Maarif Komissarının müavini, Ali Pedaqoji İnstitutun direktoru, “Maarif və mədəniyyət” jurnalının redaktoru, “Azərnəşr”in direktoru, teatr idarəsinin sədri vəzifələrində çalışmışdır.

Böyük vəzifə sahibi olmasına baxmayaraq tale üzünə gülməmiş, həyatının ən qaynar, ən məhsuldar dövründə dünyasını dəyişmişdir. Repressiya olunmasa da ölümündən sonra heç vaxt adı çəkilməmiş, zəngin fəaliyyəti haqqında yazılmamış, unudulmuş, bəlkə də unutdurulmuşdur...

Cəlil Məmməd oğlu Məmmədzadə 1888-ci ildə Şuşada tacir ailəsində anadan olub. 7 yaşında məhəllə məktəbinə gedən Cəlil Məmmədzadə (bəzi mənbələrdə Məhəmmədzadə yazılır, əslində onun ilk soyadı Sadıqov olub)

iki il müddətində burada oxumağı, yazmağı və hesabı öyrənib, sonra təhsilini Şuşa realnı məktəbində davam etdirib. Həmin məktəbin əsası 1881-ci il sentyabrın 20-də qoyulmuşdu. Realni məktəb 6 sinifli idi. O dövrdə Azərbaycanda cəmi bir realni məktəb (Bakıda) və bir klassik progimnaziya (Gəncədə) fəaliyyət göstərirdi. Bu isə bir tərəfdən əhalinin orta təhsilə olan ehtiyacını, digər tərəfdən isə sənaye və ticarətin artmaqda olan tələbini qətiyyən ödəmirdi. Bu tələb və ehtiyac Şuşada özünü xüsusilə büruzə verirdi. Burada orta məktəbə olan ehtiyac get-gedə artırdı. Şuşada progimnaziya yaradılması tələbinin nəticəsiz qalmasını görən şəhər əhalisi 1880-ci il iyunun 30-da Peterburqa-*Qafqaz komitəsinə yazırdı:"Şuşa şəhər sakinlərinin təhsilə olan cidd-cəhdinə, (Şəhər məktəbində 400-dən artıq şagirdin oxuması bu cəhdi bir daha təsdiq edir) və şəhər ictimaiyyətinin arzusuna əsaslanan Gəncə qubernatoru Şuşa şəhərində 6 sinifli realni məktəb açmağı xahiş edir. Şəhər ictimaiyyəti həmin məktəbi müvafiq bina ilə təmin etməyi və bu ildə 7500 manat pul ilə kömək etməyi öhdəsinə götürür".*

Cəlil Məmmədzadə sonralar tərcümeyi -halında yazırdı:"Realni məktəbin 5-ci sinfində oxuyana qədər çox az dini bilgim, bir az da təsərrüfatla bağlı bacarığım var idi. 5-ci sinifdə oxuyanda özünütəhsillə məşğul olmağa başladım. Məqsədim Gəncə gimnaziyasında oxumaq idi. İki il Gəncə gimnaziyasında oxuduqdan sonra Kiyev gimnaziyasına köçürüldüm. Həmin illərdə



*Soldan: Qəzənfər Musabəyov, Əbülfətxan Talışınski, Cəlil Məmmədzadə, Yusif Vəzir Çəmənzəminli, Azad bəy Axundov, Qambay Rəfibəyov. Kiyev, 1913.*

***Cəlil Məmməd oğlu Məmmədzadə***



*Cəlil Sadıqov (Məmmədzadə) tələbəlik illərində*

ailəmizin maddi vəziyyəti kəskin şəkildə pisləşmişdi. Gimnaziyada oxuduğum üç il müddətində onlar mənə maddi kömək edə bilmədilər. Müstəqil yaşamağa və işləməyə başladım". O dövrdə ailənin bütün çətinlikləri Cəlilin üzərinə düşmüşdü. Həyat yoldaşının, kiçik qardaşının və atasının Kiyevə - onun yanına göndərdiyi qohumlarının qayğısına qalmaq da Cəlilə həvalə olunmuşdu.

O dövrdə Kiyev şəhəri Azərbaycandan nə qədər uzaqda olsa da, azərbaycanlı ziyalılar üçün doğma və yaxın idi. Şəhərdə müsəlmanlara xüsusi hüsnrəğbət vardı. Həmin illərdə Kiyevdə 17 yaşından 29 yaşınadək təqribən 200 azərbaycanlı tələbə təhsil alırdı. 1910-1914-cü illərin yeni inqilabi yüksəlişi dövründə Kiyev şəhərinin məhz azərbaycanlı tələbələrinin təşəbbüsü ilə 1913-cü il aprelin 17-də Ümumrusiya Müsəlman Tələbə Təşkilatı yaratmağa cəhd göstərilmişdi. Lakin imperiyanın başqa şəhərlərindəki ali məktəblərin müsəlman cəmiyyətlərinin üzvü olan tələbələrin iştirakı ilə təşkil edilmiş yığıncaq polis və mühafizəçilər tərəfindən zorla dağıdılmışdı.

Kiyev gimnaziyasını bitirən C. Məmmədzadə Kiyev Politexnik İnstitutuna daxil olur. Burada o, mühəndis-texnoloq ixtisasına yiyələnməklə yanaşı, həm də fərdi dərslər verməklə pul qazanır. Onun 9 illik gimnaziya, 5 illik ali təhsili vardı. Kiyevdə yaşayarkən o ictimai-siyasi fəallığı ilə seçilib.

"Kiyev şəhəri müsəlman tələbələr təşkilatı"nın fəal üzvlərindən biri olub. Cəlil Məmmədzadənin üzvü olduğu "Kiyev şəhəri müsəlman tələbələr təşkilatı"nın qarşısında iki məqsəd dururdu:1) qarşılıqlı kömək; 2) müsəlman tələbələrinin mədəni səviyyəsinin yüksəldilməsi. Həmin təşkilatda onunla birgə Möhsün İsrafilbəyov (Qədirli), Hüseyn bəy Axundov, Mustafa Quliyev də səmərəli fəaliyyət göstərib. Fevral-burjua inqilabından sonra həmin təşkilat iki yerə bölünüb:1) bolşevizmi dəstəkləyənlər; 2) millətlərin öz müqəddəratını təyin etməsini dəstəkləyənlər.

Cəlil Məmmədzadə ikincilərin yanında olmuş, "Müsavat" partiyasının ideyasını dəstəkləmiş, "bərabərlik, qardaşlıq, sülh" şüarı altında mübarizə aparmış, Y.V.Çəmənzəmənlinin sədri olduğu Türk Ədəbi Mərkəziyyə firqəsi "Musavat"in fəal üzvlərindən biri olmuşdur.

***Cəlil Məmməd oğlu Məmmədzadə***

1920-ci ildə Moskvada tələbə yoldaşı Möhsün İsrafilbəyovla (Qədirli) (o, Kiyev Müqəddəs Vladimir Universitetində oxumuşdu) görüşü onun bolşevizmə meyil etməsinə səbəb olur. Həmin vaxt Möhsün Qədirli Azərbaycan Xalq Hərbi Dəniz İşləri Kommisarlığı siyasi idarəsinin rəisi vəzifəsində işləyirdi. Ürəkdən istəməsə belə C.Məmmədzadə 1920-ci ildə Bakıya gəlir, yeni hakimiyyətlə əməkdaşlıq edir. Azərbaycan SSR Siyasi İdarənin nəzdindəki mədəniyyət şöbəsinin müdiri vəzifəsində (iyun 1920 - dekabr 1920) çalışır. Eyni zamanda partiya kurslarının mühazirəçisi kimi 120 nəfərin siyasi hazırlıq keçməsində mühüm rol oynayır. Rus və ukrayn dillərini mükəmməl bilən C.Məmmədzadə partiya siyasi kurslarında inqilab hərəkatının tarixindən, siyasi iqtisadın əsaslarından mühazirələr oxuyur. İctimai-siyasi fəallığı ilə seçilən C.Məmmədzadə 17 iyul 1920-ci ildə bolşevik partiyası sıralarına qəbul edilir. 5 dekabr 1920-ci ildən 5 noyabr 1921-ci ilə kimi xalq ictimai təminat komissarının şəxsi katibi olur. 1921-ci ilin fevralında Rusiya ilə ictimai təminatla bağlı əlaqələri genişləndirmək məqsədilə Moskvaya, oradan isə ailəsini Bakıya gətirmək üçün Kiyevə ezam olunur. Anasının Kiyevdə xəstələnməsi ilə əlaqədar olaraq üç ay orada qalmalı olur. Burada da siyasi fəaliyyətdən ayrılmır, əksinə bu sahədəki fəaliyyətini daha da genişləndirir. 1923-cü ildə Azərbaycan K(b)P MK-nın Bakı şöbəsinin katibinin müavini təyin edilir. Bir müddət Xalq Komissarları Sovetində işlər idarəsində çalışır.

1923-1928-ci illər Cəlil Məmmədzadənin həyatının ən məhsuldar dövrüdür. 1923-cü ilin dekabrında o, Azərbaycan xalq maarif komissarının müavini təyin olunur və 1928-ci ilə kimi həmin vəzifədə çalışır. Həmin dövrdə onunla birlikdə Kiyevdə təhsil alan Mustafa Quliyev (o, Kiyev Müqəddəs Vladimir Universitetində oxumuşdu) xalq maarif komissarı idi.

"Весь Азербайджан" (1924) ünvan və sorğu kitabında Azərbaycan Xalq Maarif Komissarlığı haqqında verilən məlumatda oxuyuruq:

Xalq Maarif Komissarı- M.Quliyev

Xalq Maarif Komissarının müavini - **C.Məmmədzadə**

Xalq Maarif Komissarlığının Kollegiyası:

Sədr -M.Quliyev, üzvlər: **C.Məmmədzadə**, M.Şahbazov, B.Bünyatov, Ə.Pepinov, S.Blyaxun, Manuçyan.

XMK-nın Kollegiya katibi: O.A. Cəlalbəyov

XMK-nın işlər idarəsi – M. Əhmədov

Azərbaycan Dövlət Universitetinə V.İ.Leninin adının verilməsi haqqında Xalq Maarif Komissarlığı kollegiyasının 23 yanvar 1924-cü ildə keçirilən növbədənkənar iclasının protokolunu xalq maarif komissarının müavini kimi Cəlil Məmmədzadə və kollegiyanın katibi O. Cəlalbəyov imzalamışdır. Cəlil Məmmədzadə 1925-ci ildə Bakıda keçirilən Azərbaycan müəllimlərinin IV

qurultayında I-II dərəcəli məktəblərdə latın əlifbasının tətbiqi ilə bağlı xalq maarif komissarının müavini kimi geniş məruzə etmişdir.

1924-1926-cı illərdə o, həm də ölkədə maarif və mədəniyyətin yayılmasında, mədəni inqilabın həyata keçirilməsində, savadsızlığın ləğvində mühüm rol oynayan "Maarif və mədəniyyət" jurnalının məsul katibi (redaktoru) olmuşdur. O, redaktor olduğu illərdə prof.P.P.Fridolin, Ə.Pepinov redaksiya heyətinin üzvü, Hacınski isə katib olmuşdur. Jurnalın 1924-cü il (12 №-si), 1925 -ci il (8№-si), 1926-cı il (12 №-si) onun redaktorluğu ilə nəşr edilmişdir.Maraqlıdır ki, həmin dövrdə C.Məmmədzadə həm də "Azərnəşr"in direktoru, teatr idarəsinin sədri olub.1926-cı ildə o,daha bir məsul vəzifəyə - Ali Pedaqoji İnstituta direktor təyin olunur və institut ADU-nun Pedaqoji fakültəsinə birləşənə kimi ona rəhbərlik edir.

Məlumdur ki, I Bakı Türkoloji Qurultay 1926-cı il fevralın 26-dan martın 6-dək davam etmişdir. Türkoloji qurultayın ilk günündə partiya fraksiyasının ilk iclası keçirilib. İclasda 35 nəfərin çıxışı nəzərdə tutulsa da 22 nəfər məruzə edib. Xalq maarif komissarının müavini kimi çıxış edən C.Məmmədzadə latın əlifbasının əhəmiyyətindən danışıb, ərəb əlifbasının texniki çətinliklərini əsaslandırıb, tatar və özbək nümayəndələrinin əlifba ilə bağlı fikirlərinə münasibət bildirib. Cəlil Məmmədzadənin Səmədağa Ağamalıoğlu, İsmayıl Hikmət, Bəkir Çobanzadə ilə birlikdə Türkoloji qurultayın rəhbərliyində təmsil olunması onun elmi-siyasi nüfuzuna dəlalət edir. Qurultayda o həm də mandat komissiyasının sədri olub, 131 nəfər iştirakçı (onlardan cəmi 1 nəfəri –A.Sultanova qadın idi) haqqında geniş məlumat verib. Qurultayın işində fəal iştirak edən C.Məmmədzadə qəbul edilən qətnamələrin redaktəsi məqsədilə yaradılan komissiyanın 26 nəfər üzvündən biri olub. Qurultayda latın əsaslı yeni türk əlifbasına keçid, ədəbi dilin formalaşması, çap və nəşriyyat işinin Avropa standartlarına uyğunlaşdırılması və terminologiyadan istifadə qaydaları, ortaq türkcənin yaradılması kimi böyük əhəmiyyəti olan məsələlərin müzakirəsində fəal iştirak edib. Bu məqsədlə 5 nəfərdən ibarət yaradılan xüsusi komissiyanın üzvü olub. Türkoloji qurultayın 3 mart səhər iclasında o, yeni türk əlifbası məsələsi ilə bağlı geniş məruzə edib.

Ağamalıoğlunun sədrliyi ilə keçən iclasda prof. Jirkovdan sonra Azərbaycan dilində edən çıxış edən Cəlil Məmmədzadə sonra məruzəsinin məğzini rus dilində iştirakçıların diqqətinə çatdırıb. O, çıxışını əlifba məsələsi üzərində quraraq deyir:"Qurultayımız qarşısında bir əsas məsələ, əlifba məsələsi durur ki, terminologiya, orfoqrafiya və ibtidai məktəblərimizdə tədrisin üsullarının əsas əməli məsələlərinin həlli də ondan asılıdır". Sonra ərəb əlifbasının genezisindən, yayılmasından, türk-tatar xalqlarının onu qəbul etməsindən bəhs edir. Əsaslandırır ki, ərəb əlifbası türk-tatar xalqlarının bütün tələblərinə

cavab vermədiyindən islahatçıların ərəb əlifbasının təkmilləşdirilməsi ilə bağlı təşəbbüsləri heç bir fayda verməyəcək. Ərəb hərflərinin sözün əvvəlində, ortasında, axırında və ayrılıqda fərqli yazılması, sağdan sola yazılması çətinliklər yaradır. Histologiya, riyaziyyat və tibb fənləri üzrə dərsliklərin nəşrində çoxlu problemlər yaranır. Türk-tatar dilində olan "o", "u","i" səsləri burada yoxdur. Ərəb dilində "cümə axşamı" sözünü yazmaq üçün düz 10 nöqtə qoyulmalıdır, əgər nöqtələr düzgün qoyulmasa, "cümə axşamı" sözü "çərşənbə" oxunacaq. Xeyli belə nümunələr verdikdən sonra o, yeni türk əlifbasının (latın qrafikalı əlifbanın) üstünlüklərindən bəhs edir, "əcdadlarımızdan, ulu babalarımızdan miras qalan ədəbiyyatı itirməmək, kənara atmamaq" şərti ilə yeni əlifbanın qəbul edilməsinin vacibliyini əsaslandırır:"Hazırda elə bir vəziyyətdə yaşayırıq ki, artıq əlifba islahatı, ərəb əlifbasından xilas olmaq məsələsi ilə



*Soldan:A.Samoyloviç, S. Oldenburq, C.Məmmədzadə, A.Qulyayev (ADU-nun rektoru), V.Tomaşevski, V.Mentsel. Bakı, 1926*

müəyyən dərəcədə məşğul olmuşuq. Biz iki məsələni izləməliyik: birincisi, Avropa mədəniyyətinə yaxınlaşmaq məsələsini və ikincisi, bizdə fəhlə-kəndli kütləsi arasında olan, bizə köhnə hökumətdən miras qalan savadsızlığın tezliklə aradan qaldırılması vəzifəsini. Bunu yalnız yeganə yolla - mükəmməl, yaxud mükəmməlliyə yaxın olan, həmin xalqın fonetikasına cavab verən texniki baxımdan rahat əlifba vasitəsilə nail olmaq mümkündür. Belə əlifba isə latın əsaslı yeni türk əlifbasıdır". Sonra Cəlil Məmmədzadə yeni əlifba məsələsinin yarandığı illərə diqqət çəkir. Xalq maarif komissarının müavini

kimi savadsızlığın ləğvi sahəsində görünən işlərdən danışır, yeni əlifbanın qəbulunu savadsızlığın ləğvinin ən yaxşı yolu hesab edir, məktəblərdə birinci qruplarn (1-ci siniflərin) yeni əlifba ilə təhsil aldıqlarını bildirir.

Savadsızlığın ləğvindən danışan Cəlil Məmmədzadə qeyd edir ki, iki il ərzində savadsızlığı aradan qaldıran 70 minə yaxın adam var. Bizim bütün fəhlə rayonlarımızı gəzmək və orada savadsızlığını ləğv edən on minlərlə fəhlə görmək olar...Bu kütlələr başa düşüblər ki, onların yeganə xilası fonetikaların texnikalarına uyğun gələn və onlara mədəniyyətə qovuşmağa imkan verən yeni əlifbadır. Güman edirəm ki, bu cəbhədə ikinci Oktyabr meydana gətirmək, fəhlə-kəndli kütlələrini əsrlərlə davam edən ərəblilikdən, savadsızlıqdan azad etmək üçün qurultay bu məsələni yalnız fəhlə-kəndli kütlələrinin mənafeyinə müvafiq araşdıracaq".

Türkoloji qurultayda əlifba, imla, terminologiya məsələlərinin müzakirəsində fəal iştirak edən Cəlil Məmmədzadə redaktoru olduğu "Maarif və mədəniyyət" jurnalında "Yeni əlifba və türk xalqları" adlı (1926, №2, s.21-25) məqalə ilə çıxış etmişdir. Maraqlıdır ki, jurnalda bütün materiallar əski əlifba ilə verildiyi halda o, öz məqaləsini yeni əlifbada (latın) vermişdir. Cəlil Məmmədzadə məqaləsində Azərbaycan, türkmən, özbək, Krım, Dağıstan, tatar və başqa türk xalqlarının mədəni səviyyəsinin aşağı olmasının səbəbini təhsilsizlikdə görərək yazırdı:"..*türk xalqlarının mədəni qüvvələrini nəzərdən keçirməli olsaq görərik ki, onların savadlıları olsa-olsa 10-12%-dir, onların da 4-5 %-i ali və orta təhsillilərdir".Məktəblərin milliləşdirilməsi məsələsinə toxunan Cəlil Məmmədzadə yazır:".. məktəbləri aşağıdan yuxarıya qədər milliləşdirmək istədikdə qarşımıza ərəbin dini ilə bərabər içərimizə soxulan dilimizdə, imlamızda və əlifbamızda olan ərəbçilik çıxıyor, cəhalətimizin əsas səbəbi haman bu ərəbçilikdir"*.

1921-ci ildə Xalq Komissarları Soveti tərəfindən Dadaş Bünyadzadənin başçılığı ilə Əlifba Komitəsi yaradıldı. 1922-ci ildə N.Nərimanovun başçılıq etdiyi xüsusi komissiya geniş müzakirələrdən sonra latın qrafikalı yeni Azərbaycan əlifbasının layihəsini hazırladı.1922-ci ildə latın qrafikalı ilk yeni türk əlifbası işıq üzü gördü. Əlifbanın hazırlanmasında C.Axundzadə, F.Ağazadə ilə yanaşı Cəlil Məmmədzadə də iştirak edirdi. 1923-cü il oktyabrın 20-də Azərbaycan Mərkəzi İcraiyyə Komitəsi "Yeni Azərbaycan əlifbasının dövlət əlifbası kimi tanınması haqqında" dekret verdi. Görülən bu işləri təqdir edən müəllif türkoloji qurultayda da 101 səs lehinə, 7 səs əleyhinə olmaqla həmin əlifbanın qəbul olunmasını alqışlayaraq yazır: *"Türk-tatar əməkçisinin tam mənası ilə azadə həyat yaratması, əski ərəbçilikdən əl götürüb yeniliyə doğru getməkdədir"*. Elə bu səbəbdən də öz məqaləsini nümunə kimi yeni əlifba ilə verir. Jurnalın "Oktyabr inqilabı və Azərbaycanda maarif" (1926, 10-11, s.2)

***Cəlil Məmməd oğlu Məmmədzadə***

adlı baş məqaləsində Cəlil Məmmədzadə qısa bir müddətdə Azərbaycanda ibtidai, orta və ali təhsil sahəsindəki nailiyyətlərdən bəhs edir, ümumi maarifi iqtisadi inkişafın əsas təməl prinsipi hesab edir. Qeyd edir ki, I dərəcəli məktəblərdə 100 mindən artıq oğlan və qız bir yerdə oxuyur, bu məktəblər üçün Bakıda və qəzalarda 14 pedaqoji texnikum fəaliyyət göstərir. Həmin texnikumları bu il (1926-cı il-F.R.) 450 nəfər müəllim bitirəcəkdir. Ölkədə 60 orta məktəb, 12 sənaye və kənd təsərrüfatı, 1 əczaçılıq, 2 mamaçılıq, 1 diş həkimliyi texnikumunun, Dövlət Darülfünunun tibb, pedaqoji, şərq fakültələrinin, Politexnikumun kənd təsərrüfatı, texnoloji və mühəndis fakültələrinin, Ali Pedaqoji İnstitutun, Dövlət Konservatoriyasının, rəssamlıq məktəbinin fəaliyyət göstərdiyini bildirir. Təhsil almağı zəhmətkeşlərin azadlıq yolu kim səciyyələndirən C.Məmmədzadə maarif və mədəniyyət cəbhəsindəki mübarizədə Zaqafqaziya Ali Kommunist Məktəbinin rolunu da yüksək dəyərləndirir.

Cəlil Məmmədzadə Ali Pedaqoji İnstitutun direktoru olarkən onun təşəbbüsü və pedaqoji ictimaiyyətin iştirakı ilə institutun ilk yubileyi keçirilmiş, “Azərbaycan Ali Pedaqoji İnstitutu" (1926) kitabı nəşr edilmişdir. Məcmuənin üz qabığında institutun yerləşdiyi binanın –indiki İqtisad Universitetinin əsas binasının şəkli verilmişdir. Mündəricatdan sonra V.İ.Leninin, N.Nərimanovun (institutun təşkilatçılarından biri kimi), fizika-riyaziyyat şöbəsinin dekanı Məmməd Əfəndizadənin, tarix-ədəbiyyat şöbəsinin dekanı İsmayıl Hikmətin, təbiyyat-aqranomi şöbəsinin dekanı Səlimə Osmanzadənin, tarix-ictimaiyyat şöbəsinin dekanı Əziz Ubaydulinin şəkilləri verilmişdir. Məcmuədəki materiallar 3 bölməyə ayrılmışdır: 1) Ali Pedaqoji İnstitutun tarixçəsi; 2) idarə və təşkilati işlər; 3) xatirələr və duyğular.

Jurnal institutun direktoru C. Məmmədzadənin “Tədris və tərbiyə- 5 il” məqaləsi ilə açılır. Məqalədə APİ-nin 5 illik tarixinə qısa nəzər salınır, ikinci dərəcəli məktəblər, pedaqoji məktəblər, peşə və sənaye məktəbləri üçün ali təhsilli müəllim hazırlamaq məqsədi ilə ilə açılan institutun ali məktəb kimi formalaşmasından bəhs edir. Sonra institutun ixtisasları, tədris laboratoriyaları, fənn kabinələri, kitabxana, tələbə kontingenti (cəmi 162 nəfər) haqqında məlumat verir. Məlum olur ki, institutda Kommunist Firqəsi Özəyi, LKGİ Özəyi, İcraiyyə Bürosu, Yeni Əlifba Dostları cəmiyyəti, Beynəlxalq İnqilabçılara Yardım cəmiyyəti, İşçi fakültəsi nəzdində fənni, ictimai və həmkarlar ittifaqları dərnəkləri, xüsusi qiraətxana, Lenin guşəsi fəaliyyət göstərir. İnstitutun fəaliyyətini təhlil etdikdən sonra C.Məmmədzadə yazır: *"Şuralar Azərbaycanının bu yolda 100% məqsədinə nail olduğunu iddia edə bilmərik, xeyr, görüləcək işlərimiz irəlidədir; bu beş yıl müddətində Darülfünun Pedaqoji fakültəsi adını qazanan Pedaqoji İnstitutunun qarşısında çox böyük və mühüm vəzifələr duruyor, bunlardan ən mühümü bu məktəbdə şura və proletar*

*məfkurəsinin daha dərinləşməsi, tədris işlərinin qüvvətlənməsi və məktəbin fənn və ictimai həyatına aid təchizatın mükəmməlləşməsidir. Proletar və zəhmətkeş kəndli düşmənləri artıq əmin olmalıdırlar ki, bu binanın meyvələri ən yaxın bir zamanda yalnız Azərbaycan şura və zəhmət məktəblərini deyil, bəlkə Şuralar Azərbaycanına göz dikən Şərq Şura Cümhuriyyətlərinin məktəblərini də qırmızı müəllimlər ilə təmin edə biləcəkdir".*

Sonra Tarix-ədəbiyyat (İsmayıl Hikmət), Təbiyyat-aqranomluq (S.Osmanzadə), Fizika-riyaziyyat (Məmməd Əfəndizadə), Tarix-ictimaiyyat (Ə.Ubaydulin) fakültələri (şöbələri), Qadın İnstitutu (S.Xuramoviç), Şaiq pedaqoji texnikumu (Q.Əfəndizadə) ilə bağlı məqalələr verilir."İdarə və təşkilat işləri" bölməsində institutun təsərrüfat həyatı (Həbib bəy Mahmudbəyov), tələbə təşkilatları (M.Həmzazadə), kommunist firqə təşkilatı (S.Ramazanov), Qadın İnstitutunda firqə işləri (Rəhimə Səlim) və komsomol təşkilatının (E.Əsgərzadə) 5 illik fəaliyyəti ümumiləşdirilir. "Xatirələr və duyğular" bölməsində Xəlil Fikrətin müəllimlərə tövsiyələri, Bəkir Çobanzadənin, Abdulla Şaiqin, Ə.Novruzinin, M.İbrahiminin, E.Sərdarlının xatirələri yer alıb. Məcmuədə Xalq Maarif Komissarı Mustafa Quliyevin, vaxtsız vəfat etmiş ədəbiyyat şöbəsinin məzunu M.İ.Mirəhmədzadənin və Mirzə Əlinaği Rəcaninin (institutun II buraxılışı), Qadın İnstitutunun müdiri Sara xanım Xuramoviçin, Şaiq pedaqoji texnikumunun müdiri Qafur Əfəndizadənin, institutun direktor müavini Həbib bəy Mahmudbəyovun, institutun ilk direktoru Fətulla bəy Rzabəylinin və müəllim-tələbələrin 16 kollektiv şəkli verilmişdir. Cəlil Məmmədzadənin "Mədəniyyət və maarif" jurnalının 1926 -cı ilin 5-6 sayında Ali Pedaqoji İnstitutla bağlı geniş məqaləsi nəşr olunmuş, institutun əməkdaşlarının şəkilləri verilmişdir.

Çox qızğın ictimai-siyasi və pedaqoji fəaliyyət göstərən C.Məmmədzadə 20-ci illərdə Azərbaycanda mədəni həyatın inkişafında mühüm rol oynamış, milli ziyalıların öncüllərindən biri olmuşdur. Həmin dövrdə teatr idarəsinin sədri olan C.Məmmədzadə fəhlə-kəndli teatrının yubileyi ilə bağlı maraqlı məqalə yazmış və onu "İşçi-kəndli teatrosunun yubileyi" ("Maarif və mədəniyyət",1926, №4, s.1-2) adı ilə nəşr etdirmişdir.

16 iyul 1926-cı ildə Azərbaycan SSR Xalq Komissarları Soveti "Ali Pedaqoji İnstitutun yenidən təşkili" ilə bağlı qərar qəbul etdi.
1926/27-ci tədris ilinin sonu, 1927/28-ci tədris ilinin əvvəlində Ali Pedaqoji Kişi İnstitutu, Ali Pedaqoji Qadın İnstitutu Bakı Dövlət Universitetinin Pedaqoji fakültəsi ilə birləşdirildi. Birləşmiş fakültənin ilk dekanı Cəlil Məmmədzadə oldu.

Cəlil Məmmədzadə 1929-1932-ci illərdə Gəncə dairə partiya komitəsində təşkilat şöbə müdiri kimi şəhərdə gedən tikinti və yenidənqurmu işlərinə rəhbərlik edir. Daha sonra Azərbaycan K(b)P MK-nın sosial-mədəni qrupunun

rəhbəri olur.Azərbaycan Respublikası Prezidentinin İşlər İdarəsi Siyasi Sənədlər Arxivində AK(b)P Nəzarət Komissiyasının 24 mart 1926-cı il tarixdə keçirilən iclasında Cəlil Məmmədzadənin "Maarif və mədəniyyət" jurnalında Ə.Cavadın "Göygöl" şeirini nəşr etdiyinə görə məsuliyyəti məsələsi müzakirə olunur. İclasın 21 saylı protokolundan aydın olur ki, bu məsələ əvvəlcə Azərbaycan K(b)P MK katibliyinin 13 dekabr 1925-ci il tarixli iclasında müzakirə olunduqdan sonra materiallar xüsusi şifrə ilə Nəzarət Komissiyasına göndərilib. Cəlil Məmmədzadə yoxlama komissiyasına təqdim etdiyi izahatında bildirir ki, Ə.Cavadın "Göygöl" şeirini redaksiyada iki dəfə oxuyub və müzakirə edib. Şair şeiri Gəncə ətrafında yerləşən, hər tərəfdən yaşıllıqla əhatə olunan Göygöldə dincələrkən yazıb. Şeir Göygölün gözəlliyinə həsr olunduğundan onu çap etməyə razı olub. Nəzarət Komissiyası Əhməd Cavadın "Maarif və mədəniyyət" jurnalında nəşr olunan "Göygöl" şeirini (1925,№ 2(22)) diqqətlə oxuyaraq belə qərara gəlir ki, şeirdə antisovet təbliğatı olmadığına görə, bu məsələ bağlansın və arxivə verilsin. Bunula da o, həbs olunmaq təhlükəsindən qurtarır.

Cəlil Məmmədzadə 1932-ci ilin yanvarından ömrünün sonuna kimi ASŞC MQQ - İKM ictimai-mədəni qrupun rəhbəri vəzifəsində və Şura Kontrolu Komissiyasının müvəkkili aparatında çalışıb.

Geniş ictimai-siyasi və mədəni-maarifçilik fəaliyyəti ilə seçilən Cəlil Məmmədzadə 1922-1924-cü illərdə Azərb.K(b)P Şəhər Komitəsinin üzvü, 1923-1928-ci illərdə Bakı Şurası üzvü, 1932-ci ildən Azərb.K(b)P MK Plenumu və Prezidiumu və Azərbaycan Sovet Şuralar Cəmiyyəti Xalq Komissarları Şurasının, Xalq Maarif Komissarlığı Kollegiyasının üzvü olub. Azərbaycan KP MK-nın üzvü seçilməsi ilə bağlı Cəlil Məmmədova verilən xasiyyətnamədə göstərilir ki, o, sovetləşmənin qızğın tərəfdarı (?!) olmuş, sovetləşmədən az sonra Moskvadan Bakıya gəlmiş, partiya sıralarına üzv yazılmış, partiya işində ləyaqətlə və vicdanla çalışmış, özünü kommunistlərin sadiq dostu kimi göstərmişdir. Əslində isə o, hələ Kiyevdə oxuyarkən bolşevik əqidəli tələbə yoldaşlarından ayrılaraq müsavatçıların ideyasını dəstəkləmişdi. AXC-nin süqutundan sonra bolşevik dostlarının təkidi ilə Bakıya gəlmiş və bolşeviklər partiyasına daxil olmuşdur.

Onun müsavatçı olması ilə bağlı öz əli ilə yazdığı tərcümeyi-halı Azərbaycan Respublikası Prezidentinin İşlər İdarəsi Siyasi Sənədlər Arxivində də saxlanılır. 1937-ci ildə onun dostlarını - Dadaş Bünyadzadəni, Mustafa Quliyevi, Möhsün İsrafilbəyovu cismən məhv edən repressiya maşını qətiyyən onu sağ buraxmazdı. Onu repressiyadan, Sibirin qarlı-çovğunlu çöllərindən yalnız ölüm qurtara bilərdi. Bu, belə də oldu. O, uzun sürən xəstəlikdən sonra 7 iyun 1934-cü ildə 46 yaşında Bakı şəhərində vəfat etdi. Onun ölümü ilə

bağlı "Kommunist" qəzetində Azərb.K(b)P MK və Bakı Komitəsinin, Azərbaycan Mərkəzi İcraiyyə Komitəsinin, Azərbaycan Sovet Şuralar Cəmiyyəti Xalq Komissarları Şurasının, Şura Kontrolu Komissiyasının, Azərbaycan Sovet Şuralar Cəmiyyəti Xalq Maarif Komissarlığının, Azərbaycan Həmkarlar İttifaqları Şurası prezidiumunun, Azərbaycan Maarif İşçiləri İttifaqının Mərkəzi İdarəsi və rayon şöbələrinin, Xalq Səhiyyə Komissarlığının, "Kommunist" qəzeti (türkcə) redaksiyası və əməkdaşlarının başsağlığı elanları və nekroloq verilmişdir. Cəlil Məmmədzadənin dəfninin təşkili ilə bağlı xüsusi komissiya yaradılmış, 8 iyun 1934-cü ildə onunla vida görüşü 26 Bakı Komissarı adına Mədəniyyət sarayında keçirilmiş, elə həmin gün də saat 4-də dəfn olunmuşdur.

## Ədəbiyyat


1. Azərbaycan Respublikası Prezidentinin İşlər İdarəsi Siyasi Sənədlər Arxivi. f.1., saxlama siyahısı 7, iş 3389 (Cəlil Məmmədzadənin şəxsi işi).
2. Azərbaycan Respublikası Milli Arxiv İdarəsi. f.1, siyahı 4, iş. 936, v.94
3. Azərbaycan Mərkəzi Dövlət Tarix Arxivi. f.411, sax.siy.4, iş 936, v.94
4. Ali Pedaqoji İnstitutun salnaməsi. Bakı,1924
5. Ali Pedaqoji İnstitut. Beş illik. Bakı, 1926
6. Məhəmmədzadənin məruzəsi."Yeni fikir" qəzeti, 5 mart 1926-cı il
7. 1926-cı il Bakı Türkoloji qurultayı (stenoqram materialları, biblioqrafiya və foto-sənədlər). (Ruscadan tərcümə, ön söz və şərhlərin müəllifləri: prof.Kamil Vəli Nərimanoğlu, Əliheydər Ağakişiyev). Bakı, 2006, s.217-221
8. Məhəmmədzadə yoldaşın məruzəsi: /Birinci Türkoloji qurultayın 3 mart iclasında istilah, imla, məktəblərdə ana dili və əlifba tədrisi haqqında. "Kommunist" qəzeti, 5 mart 1926
9. Məhəmmədzadə X. Əlifba məsələsi haqqında məruzə: /Türkoloji qurultay ərəfəsində. "Kommunist" qəzeti, 21 fevral 1926
10. Cəlil Məmmədzadə (nekroloq). "Kommunist" qəzeti, 8 iyun 1934
11. Rüstəmov F. Pedaqoji Universitetin direktoru Cəlil Məmmədzadə kimdir?. I-II-III məqalə."Qarabağa aparan yol" qəzeti,18,25 aprel, 8 may 2019
12. Заседания партфракции тюркологического съезда в г. Баку https://muse.jhu.edu/article/561481/pdf


<u>***Cəlil Məmməd oğlu Məmmədzadə***</u>



## PƏNAH ƏLƏKBƏR OĞLU QASIMOV
*(1881-1939)*

Pənah Qasımov 1881-ci il iyul ayının 22-də Cəbrayıl qəzasının Qarğabazar kəndində anadan olub. İlk təhsilini Qarğabazarda molla məktəbində alıb, sonra kənddəki üçsinifli məktəbi bitirib. 1901-1905-ci illərdə dövlət vəsaiti hesabına Zaqafqaziya (Qori) Müəllimlər Seminariyasının Azərbaycan şöbəsində, 1905-1907-ci illərdə isə Bakı müəllimlərinin xeyriyyə cəmiyyətinin vəsaiti hesabına Tiflisdə Aleksandrovski Müəllimlər İnstitutunda təhsil alıb. Qori və Tiflisdə aldığı təhsil onun dünyagörüşünün formalaşmasında mühüm rol oynayıb. Ali təhsilini başa vurduqdan sonra Lənkəran şəhər məktəbinə müəllim təyin edilib. 1907-1909-cu illərdə Lənkəran şəhər məktəbində, 1909-1920-ci illərdə Bakıdakı 6 sinifli şəhər məktəbində (bəzi mənbələrə görə, 6-cı rus-tatar məktəbində) və 3-cü ali ibtidai məktəbdə tarix müəllimi işləyib. Savadsızlığa və cəhalətə qarşı mübarizə aparan ziyalıların öncüllərindən biri olub.

Pənah Qasımov müəllimlik fəaliyyəti ilə yanaşı qızğın ictimai-siyasi fəaliyyətlə də məşğul olub. 1917-ci ildə "Əkinçi" partiyasının üzvlüyünə qəbul edilib. "Əkinçi" partiyası fevral inqilabından (1917) sonra sol eserlər partiyasının müsəlman bölməsi kimi təsis edilmiş, 1918-ci ilin martından isə sol eserlər partiyasının «Əkinçi» müsəlman təşkilatı kimi fəaliyyət göstərmişdir.

Pənah Qasımov 1918-ci ildə "Hümmət" təşkilatına, 1920-ci ildə Kommunist (bolşevikər) Partiyasına üzv qəbul edilmiş, mədəni inqilabın həyata keçirilməsində, təlimin ana dilində aparılmasında, qadın təhsili və azadlığı uğrunda mübarizədə, respublikada ali və orta ixtisas pedaqoji təhsilin təşkilində mühüm xidmətlər göstərmişdir.

Azərbaycan K(b)P MK bürosunun 1922-ci il 17 dekabr tarixli iclasında respublikada mədəni inqilabı həyata keçirəcək qərargah təşkil olunmuşdu. Həmin qərargaha Qəzənfər Musabəyov, Əliheydər Qarayev, Dadaş Bünyad-



*P.Qasımov tələbəlik illərində*

zadə kimi məşhur inqilabçılarla bərabər Pənah Qasımovun da adının salınması onun həm siyasi, həm də pedaqoji nüfuzunun təsdiqinin ifadəsidir. Pənah Qasımovun da üzvü olduğu həmin qərargah qısa müddətdə böyük bir təşkilata çevrilmiş, xalq arasında geniş hörmət və nüfuz qazanmışdı.

Mədəni inqilabın həyata keçirilməsində xüsusi xidmətləri olan Pənah Qasımov yazırdı ki, *sovet hakimyyəti çar sistemini birdəfəlik süpürüb atdığı kimi, mədəni inqilab da siğə, çadra, cadu, falçı, qız alıb-satmaq, çoxarvadlılıq və s. köhnə adətləri sel kimi yuyub, aparacaqdır.* O inanırdı ki, *mədəni inqilab Azərbaycan xalqını başdan-başa savadlılar ölkəsinə çevirib, Şərqin qapısına nümunə edəcəkdir.*

Pənah Qasımov 1920-ci ildə Bakı Kişi Müəllimləri Seminariyasına direktor təyin olunub. Məktəbə rəhbərlik etməklə yanaşı, o həm də ictimaiyyat fənnindən dərs deyib. O dövrdə darülmüəllimatda tədris-tərbiyə işləri qaneedici səviyyədə deyildi. Bunun səbəbini sonralar Camo Cəbrayılbəyli belə izah edirdi*:"Məktəbin müəllim kollektivi az hazırlıqlı adamlardan ibarət idi. Onlar məktəbdə möhkəm rejim yarada bilməmişdilər. Şagirdlər çox vaxt dərs buraxır, dərsə gecikirdilər. Hətta elə hallar olurdu ki, məktəb rəhbərliyi şagirdləri sinfə zorla toplaya bilirdilər. Təlim-tərbiyə işləri pozulmuş olan belə bir məktəbi yenidən qurmaq sahəsində Pənah Qasımov az iş görməmişdir. O, məktəbin işində dönüş yarada bildi".*

Pənah Qasımov darülmüəllimata müdir təyin olunan kimi tədris prosesini yaxşılaşdırmaq məqsədilə yeni proqram tərtib edir və Azərbaycan Xalq Maarif Komissarlığına təqdim edir. Xalq Maarif Komissarı Dadaş Bünyadzadə proqramı razılıqla qəbul edir, məktəbi yeni binaya (indiki Əlyazmalar İnstitutuna) köçürtdürür və onu zəruri avadanlıqla təchiz edir. Pənah Qasımovun səyi nəticəsində seminariya qısa bir zamanda Azərbaycanda qabaqcıl maarif ocağına çevrilir. Təlim-tərbiyə işlərini normal məcraya salmaq məqsədi ilə o, ilk növbədə ətrafına mütərəqqi ideyalı, demokratik fikirli pedaqoqları toplayır. Soltan Məcid Qənizadə, Hüseyn Cavid, Abdulla Şaiq, Azad bəy Əmirov, Əlibəy Qasımzadə, Nuruş Şahsuvarov, Məhəmməd Abdullayev, Əhməd Kərədi Zəkizadə, Qafur Rəşad və Sultanmurad Əliyev seminariyaya işə dəvət olunur. Bu ziyalılar seminariyanın nüfuzunun qaldırılmasında sözün həqiqi mənasında fədakarlıq göstərirlər. İlk buraxılışda seminariyanı 9 (yeni

proqramın tələbinə uyğunlaşa bilməyənlər təhsillərini yarımçıq qoyub gedirlər), ikinci buraxılışda 24, üçüncü buraxılışda 28, dördüncü buraxılışda 56 və beşinci buraxılışda 105 nəfər gənc təhsilini uğurla başa vurdu. İlk məzunlardan Mirəli Axundov, Məmməd Şıxlı, Fazil Seyidov, Allahverdi Namazov, Bəkir Əfəndiyev təyinatla Zaqatala, Cavanşir (Cəbrayıl) və Şuşa qəzalarına göndərildi. Həmin məzunların arasında sonradan həyatda yüksək nailiyyətlər qazanmış prof. Əli Quliyev, akademik Söhbət Sumbatzadə, prof. Əziz Ələsgərov, prof. Əli Sultanlı, bəstəkar Səid Rüstəmov, yazıçı Mehdi Hüseyn, Sabit Rəhman, əməkdar incəsənət xadimi Salam Salamov da vardı.

1926-cı ildə Bakıdakı kişi və qadın seminariyaları birləşdirilərək Bakı Müttəhid (Birləşmiş) Pedaqoji Texnikuma çevrildi. Görkəmli maarif xadimi Pənah Qasımov birləşmiş məktəbin direktoru, Camo Cəbrayılbəyli tədris işləri üzrə direktor müavini təyin olundu. Orta ixtisas təhsilli pedaqoji kadrlar hazırlığını həyata keçirən təhsil müəssisələri arasında Bakı Müttəhid (Birləşmiş) Pedaqoji Texnikumu ciddi nizam-intizamı, peşəkar müəllim heyəti və tələbələrinin təlim nailiyyəti ilə fərqlənirdi. Bu uğurlar Pənah Qasımovun gərgin zəhmətinin nəticəsi idi.

Həmin illəri xatırlayan görkəmli komediya ustası Sabit Rəhman xatirələrində yazır: *"Pənah Qasımov orta boylu, ağır yerişli, az danışan bir adam idi. Sifətində elə xüsusi cizgi yox idi ki, onu başqalarından fərqləndirsin. Ancaq baxışlarında qəribə təsir, zəhm vardı. Çox ciddi adam idi, gülməzdi, düşünməmiş söz danışmazdı, haray salmazdı, səsini ucaltmazdı, tələbələrə tez-tez acıqlanmazdı, ancaq buna baxmayaraq, məktəbdə böyük hörməti vardı".*

Pənah Qasımov həm də peşəkar jurnalist kimi tanınıb. Siyasi, ictimai, ədəbi, elmi, pedaqoji məcmuə olan "Maarif işçisi"nin ilk redaktoru (məsul müdiri) olub. Məcmuə 1926-1929 -cu illərdə Bakıda nəşr olunub. Jurnalda Pənah Qasımovun icbari ibtidai təhsilin həyata keçirilməsi, əhali arasında savadsızlığın aradan qaldırılması, təhsilin məzmununun yeniləşdirilməsi, təlimin təşkili xüsusiyyətləri və yeni məktəblərin tikilməsi ilə bağlı xeyli məqaləsi işıq üzü görüb. Geniş ictimai-siyasi və pedaqoji fəaliyyət göstərməsinə baxmayaraq o, yaradıcılıqla çox intensiv məşğul olub. Təkcə jurnalın 1927-ci il nömrələrində onun 11 məqaləsi ("Ümumi icbari təhsil barəsində", "Maarif evlərinin işi necə qurulmalıdır", "Azərbaycanda məktəb tarixinə dair", "Birinci dərəcəli məktəblərdə təbiət dərsləri haqqında", "Azərbaycan məktəblərinin sağlamlaşdırılması", "III sinif dərs kitabı necə olmalıdır", "Kənd məktəblərinin vəziyyəti", "Tərbiyənin təsiri", "Maarif işçilərinin VI qurultayı haqqında", "Şura pedaqogikası haqqında", "Lenin həmişə bizimlə yaşayır") nəşr olunmuşdur.

***Pənah Ələkbər oğlu Qasımov***

Pənah Qasımovun 1926-ci ildə Bakıda keçirilən I Türkoloji qurultayda iştirak edən 19 nəfər azərbaycanlıdan biri olması da onun elmi-siyasi nüfuzundan, vətəndaşlıq mövqeyindən xəbər verir.

O, 1928-ci ildə Azərbaycan SSR Xalq Maarif Komissarının müavini vəzifəsinə irəli çəkilib. Azərb.K(b)P MK-da və Azərbaycan SSR Xalq Maarif Komissarlığında Ali Pedaqoji İnstitutun yenidən təşkili ilə bağlı keçirilən müzakirə və diskussiyalarda (o dövrdə APİ ləğv edilərək ADU-nun Pedaqoji fakültəsi ilə birləşdirilmişdi) əsl fədakarlıq göstərib. Elə buna görə də Azərbaycan SSR XMK-nın 1929-cu il 28 sentyabr tarixli 74 saylı əmri ilə yenidən təşkil edilən Ali Pedaqoji İnstitutuna Pənah Qasımov direktor, prof.B.B.Komarovski direktor müavini təyin olunub. Pənah Qasımov həmin dövrdə həm də Xalq Maarifi Kadrlarının Təkmilləşdirmə İnstitutunun direktoru idi. O, ADU-nun Pedaqoji fakültəsinin əməkdaşlarının böyük əksəriyyətini yenidən təşkil edilən instituta işə dəvət etməklə institutda yüksək elmi-pedaqoji potensialın formalaşmasına nail oldu.

Həmin dövrdə Azərbaycan K(b)P MK və Xalq Maarif Komissarlığı pedaqoji kadr hazırlığına xüsusi diqqət verirdi. Bu məqsədlə ali pedaqoji təhsillə bağlı xüsusi müşavirə çağrıldı. Müşavirədə Ali Pedaqoji İnstitutun təşkili ilə bağlı direktor Pənah Qasımovun məruzəsi, P.P.Fridolinin məlumatları dinlənilib müzakirə edildi və müəllim kadrları hazırlığının perspektivləri müəyyənləşdirildi. Qısa bir vaxtda ADPİ öz inkişafının ikinci mərhələsinə qədəm qoydu, elmi-pedaqoji fikrin əsas mərkəzinə, bütün ixtisaslar üzrə müəllim kadrları hazırlayan ali pedaqoji təhsil ocağına çevrildi.

1924-cü ildən V.İ.Leninin adını daşıyan Azərbaycan Dövlət Universiteti ləğv edildiyindən, 1930-cu ildə V.İ.Leninin adı Azərbaycan Pedaqoji İnstitutuna verildi. 1 yanvar 1929-cu ildə instituta direktor təyin olunan Pənah Qasımov 10 dekabr 1930-cu ildə vəzifəsindən azad olundu. Azərbaycan K(b)P MK-nın xüsusi tapşırığı ilə Zaqatala və Nuxa qəzalarında, Qarabağ dairəsində partiyanın kollektivləşdirmə ilə bağlı göstərişlərinin həyata keçirilməsində mühüm rol oynadı.

Pənah Qasımovun 1920-1929-cu illərdə Azərbaycan SSR Maarif İşçiləri Həmkarlar İttifaqının sədri kimi Maarif İşçiləri Həmkarlar İttifaqının möhkəmlənməsində, xalq arasında nüfuzunun artmasında böyük xidmətləri olub. Həmin illərdə o, bütün ictimai-siyasi və elmi-pedaqoji hadisələrin mərkəzində olub. Azərbaycan müəllimlərinin 1925-ci ildə keçirilən IV qurultayını Pənah Qasımovun açması, iclaslara sədrlik etməsi və geniş məruzə ilə çıxış etməsi onun cəmiyyətdəki nüfuzunun real göstəricisidir.

Pənah Qasımov elmi ictimaiyyət arasında böyük nüfuza malik olub. O, Azərbaycan Dövlət Elmi Tədqiqat İnstitutunun 12 oktyabr 1929-cu il tarixində seçilmiş ilk 52 nəfər həqiqi üzvündən biri olub. 1932-ci ildə həmin institutun

bazası əsasında SSRİ Elmlər Akademiyası Zaqafqaziya filialının Azərbaycan şöbəsi təşkil edilib. 1935-ci ilin oktyabrında şöbə SSRİ EA Azərbaycan filialına çevrilib. SSRİ Xalq Komissarları Sovetinin 1945-ci il 23 yanvar tarixli qərarı ilə SSRİ EA Azərbaycan filialı Azərbaycan Elmlər Akademiyasına çevrilib.

Pənah Qasımov Azərbaycan və Zaqafqaziya Mərkəzi İcraiyyə Komitələrinin, Azərbaycan K(b)P MK-nın və Bakı Komitəsinin üzvü, Bakı sovetinin deputatı olub. Partiya işindəki fəallığına görə 1935-ci ildə Azərbaycan K(b)P MK-nın Fəxri fərmanı ilə təltif edilib.

Pedaqoji jurnalistikanın inkişafında xüsusi xidmətləri olan Pənah Qasımov 1935-1936-cı illərdə "Müəllimə kömək" jurnalının (indiki "Azərbaycan məktəbi" jurnalının sələfi) redaktoru olub.



*Pənah Qasımovun qızı Nigar xanım*

Pənah Qasımov Əminə xanım Terequlovla ailə qurmuşdu. Hidayət adlı oğlu, Ədilə xanım və Nigar xanım adlı qızları vardı. O, Üzeyir Hacıbəyov və Müslüm Maqomayevin bacanağı idi.

Pənah bəy Qasımov Hüseyn Cavidlə qonşu olmuşdu. Onlar Cavid əfəndinin indiki İstiqlal küçəsindəki ev-muzeyi yerləşən binanın (keçmiş Kommunist küçəsi №8) üçüncü mərtəbəsində ailəliklə çox mehriban qonşuluq şəraitində yaşayıblar. Üzeyir bəy də o biri bacanağı, bəstəkar Müslüm Maqomayevlə tez-tez Pənah bəygilə gələrdilər. H.Cavidin də iştirak etdiyi bu görüşlərdə daha çox yaradıcılıq işlərindən danışılarmış. H.Cavidin həyat yoldaşı Müşkinaz xanım xatirələrində yazır ki, yadımdadır... 1936-cı ilin sentyabr ayının 27-də Pənah bəyin kiçik qızı **Nigarın** ad günü idi. Yenə də dostlar ora toplaşmışdı. Söhbət zamanı Üzeyir bəy üzünü Cavidə tutub dedi:

-Cavid əfəndi, özün bilirsən "Koroğlu" üzərində işləyirəm. Yaman vuruşdayam. İnşallah, "Koroğlu"nu qurtarandan sonra ürəyimdə tutmuşam ki, sənin "Şeyx Sənan"ına opera yazım.

Cavid dedi:

-Üzeyir bəy, mən sənin qulluğunda həmişə hazıram. Nə vaxt istəsən "Şeyx Sənan"a libretto yazaram. Sonra Üzeyir bəy yarıkədərli bir halda dedi ki, özün bilirsən də, mənim "Şeyx Sənan" operamın librettosu o qədər də xoşuma gəlmir. Sənin "Şeyx Sənan"ın mənim ürəyimcədir.

Allah sənə də, mənə də cansağlığı versin. Yaxşı bir əsər yazarıq". Təəssüf ki, "Şeyx Sənan" operası üzərində bərabər işləmək niyyəti bu sənətkarlara



*H.Terequlov, H.Cavid, M.Maqomayev, P.Qasımov, Ü.Hacıbəyli və Ərtoğrul*

nəsib olmadı. Cavid əfəndinin repressiya olması bütün arzuları alt-üst etdi. H.Cavidin Ev Muzeyində saxlanılan "İblis operasının yaranması" tablosunda (müəllif: Ənvər Əliyev) Hənəfi Terequlov, Hüseyn Cavid, Ərtoğrul, Pənah Qasımov, Müslüm Maqomayev və Üzeyir Hacıbəylinin birlikdə təsvir edilməsi onların arasında olan mehribançılığın, səmimiyyətin və sədaqətin rəmzi kimi dəyərləndirmək mümkündür.

Repressiya qurbanlarından biri də Pənah Qasımov olub. O, həbs ediləndə həyat yoldaşı Əminə xanımın 56, oğlu Hidayətin 25, qızı Nigarın 25 yaşı var idi.

Azərbaycan SSR Xalq Maarif Komissarlığının İxtisasartırma və Qiyabi Pedaqoji Təhsil İnstitutunun direktoru P. Qasımovun həbs edilməsinin səbəbi nə idi? Arxiv sənədlərindən məlum olur ki, P. Qasımovun direktoru olduğu institutun metodisti Məiş Hüseynov ekskursiya zamanı təsadüfən Yusif Qasımovla (az sonra anti-sovet sağçılar təşkilatının iştirakçısı ittihamı ilə həbs olunmuşdur) görüşür. Bu görüşün təsadüfi deyil, P. Qasımovun göstərişi ilə baş tutması, Yusif Qasımovdan anti-sovet təbliğatı ilə bağlı tapşırıqların alınması haqqında danos verilir. Pənah Qasımov həbs edilir, instituta xüsusi yoxlama göndərilir. 15 gün müddətində İxtisasartırma və Qiyabi Pe-

***Pənah Ələkbər oğlu Qasımov***

daqoji Təhsil İnstitutunda yoxlama aparan M.Kasparyan 19 iyul 1937-ci ildə Azərbaycan Xalq Komissarları Sovetinin sədri M.Əfəndiyevə, Azərbaycan KP MK-nın I katibi M.Bağırova ünvanladığı arayışda P.Qasımovu casusluq fəaliyyətində və mədəni cəbhədə ziyankarlıqda ittiham edərək yazır:"P. Qasımov ziyankarlıq fəaliyyəti ilə məşğul olub. O, M.Hüseynovdan tələb edib ki, ekskursiyada olduqları obyektlər haqqında məlumat versin. Onun fəaliyyəti yarıtmazdır. Bəy oğlunu Təbiət fakültəsinə dekan təyin edib. İnstitutda tədris prosesi tamam pozulub. Qiyabiçi tələbələrə material verilməyib. Keçilən dərslərin səviyyəsi aşağıdır. İndiki direktorun fəaliyyəti də yarıtmazdır. İnstitutda dövlətin malı dağıdılır".




Məktubun sonunda M.Kasparyan məktəbi belələrindən təmizləməyi Xalq Komissarları Sovetindən və Azərbaycan K(b)P MK-dan xahiş edir.

Şüurlu həyatını millətin mədəni inkişafına həsr edən P.Qasımov istintaq zamanı ona ünvanlanan ittihamları rədd edərək günahsız olduğunu bildirir. Azərbaycan K(b)P MK-nın I katibi M.Bağırova müraciət etmək məcburiyyətində qalır. Arxivdə onun M.Bağırova yazdığı məktubun həm əlyazması, həm də makina nüsxəsi saxlanılır. Əlyazmasında P. Qasımovun imzası olduğu halda, makina nüsxəsində ancaq onun adı (Pənah) və məktubun yazıldığı tarix (4.02.37) göstərilib. Əlyazmasının üstündə heç bir qeyd yoxdur. Bütün qeydlər - məktubun daxil olma tarixi (26.03.37), M.Bağırovun qeydləri (5.07.37) məktubun makina nüsxəsinin üzərində aparılıb. Pənah Qasımov məktubda yazırdı:

***Pənah Ələkbər oğlu Qasımov***

*“Əziz dostum Cəfər!*

*Mən sənə bu məktubla müraciət edərək səndə narahatlıq yaratmaqla yanaşı, elə bir insanın vaxtını alıram ki, onun hər dəqiqəsi qiymətlidir.Bu sətirləri yalnız ona görə yazıram ki, sənin mənə həmişə yaxşı münasibətin olmuşdur. Sənin diqqətini və səmimiyyətini yüksək qiymətləndirərək əmin edirəm ki, üzərimə atılan böhtanlara və ağır ittihamlara layiq deyiləm.*

*Mən ciddi bir xalq müəllimi kimi ömrümün yarısından çoxunu əməksevər Azərbaycan xalqının maariflənməsi işinə sərf etmişəm. Bunlar mənim nail olduqlarımdır və mənim bunlarla fəxr etməyə haqqım var. Həqiqətən, çox ağırdır ki, üzvü olduğum partiyanın səmimi hörmət bəslədiyim üzvləri və rəhbərliyi mənim keçmişimin üstündən xətt çəkməklə məni ləkələmək istəyir. Partiya sıralarında olduğum vaxtdan onun əsas xəttindən az da olsa kənara çıxmamışam. Bu illər ərzində heç bir qrupun üzvü olmamışam. Bu müddətdə partiya vicdanımın səsinə qulaq asmışam, bunu mənim düzgün və kəskin çıxışlarım sübut edir. İndi mənim avantüraya qoşulmaq nəyimə lazımdı? O insanlar mənim üçün nüfuz sahibi olmayıb, hərəkət və davranışlarını tənqid etmişəm və indi də edirəm. Soruşula bilər: mənə nə lazımdır? Məgər mən narazı olmuşam? Məgər mən karyera üçün həris olmuşam? Xalqıma 30 illik xidmətimə görə partiya mənə yüksək məsuliyyətli bir iş - 13 milyonluq mədəni cəbhə ordusunun ixtisasartırmasını həvalə edib. Məgər bu xalq müəlliminə böyük hörmət deyilmi? Mən heç vaxt bundan artığına can atmamışam, olduğundan artıq heç nə istəməmişəm. Bunun pisini də özüm üçün qəbul etmirəm.*

*Sənin və partiyanın mənə olan inamına şübhə yaranıb. Sənə və partiyama qəti şəkildə bildirirəm ki:*

*1.Heç bir avantürist, ikiüzlü xalq düşmənlərinin qruplaşmasında olmamışam, keçmişdə onlarla heç bir əlaqəm olmayıb, indi də yoxdur. Mənim partiya vicdanım tamamilə təmizdir.*

*2.Sevimli yoldaş Stalinin rəhbərlik etdiyi partiyanın baş xəttindən heç vaxt kənara çıxmamışam.*

*3.Xalq Maarif Komissarlığı tərəfindən təsdiq edilən plan əsasında müəllimlərin ixtisasını artırmaq məqsədilə həyata keçirilən coğrafiya ekskursiyalarına aylarla hazırlıq işləri görülmüş, onun rəhbəri metodist kimi Hüseynov (Zaqafqaziya müəllimlər seminariyasının son məzunlarından olan Məiş Hüseynov nəzərdə tutulur. P.Qasımov həbs ediləndə onun yerinə M.Hüseynov təyin olunub - F.R.) təyin edilmişdi. Bütün məsuliyyətimlə bildirirəm ki, mən M.Hüseynova Y.Qasımovla (Zaqafqaziya müəllimlər seminariyasının məzunu, Azərbaycan SSR ədliyyə naziri, Azərb.K(b)P-nin ikinci katibi olub, anti-sovet sağçılar təşkilatı iştirakçısı kimi ittiham edilərək*

***həbs olunub –F.R.) görüşməyi tapşırmamışam, mənim bu görüşdən xəbərim olmayıb, bu görüş mənim tərəfimdən çox kəskin tənqid olunub və mən onun haqqında ciddi ölçü götürmüşəm. Belə olmasaydı mən vaxtında bunları sənin nəzərinə çatdırardım. Sənin sözündən sonra məsələ mənə aydın olanda mən təhqiqat apardım, nəticəsi haqqında şifahi və yazılı şəkildə sənə məlumat verə bilərəm. Bununla bağlı sərəncamınızı gözləyirəm.***

***Hörmətli yoldaş Cəfər! Sənə səmimi şəkildə bəyan edirəm ki, sən partiya rəhbəri kimi lazımı şəkildə hərəkət etdin, lakin səni aldatdılar. Sizdən yeganə xahişim odur ki, ən ciddi istintaq aparmağa göstəriş verəsininz, əgər mən günahkar olsam, belə hallarda nə tələb olunursa mənimlə də o cür hərəkət edin.***

***Sizi səmimiyyətlə sevən Pənah***

**4.02.37"**

M.Bağırov Pənah Qasımovun məktubunu dərkənarla dövlət təhlükəsizlik orqanına - Atakişiyevə ünvanlayır. Ciddi yoxlamadan sonra onun, həqiqətən də, günahkar olmadığı aşkarlanır və ona bəraət verilir. Maddi və mənəvi sıxıntı, ciddi cəza tədbirləri Pənah Qasımovun səhhətinə ağır təsir göstərdiyindən həbsdən azad olunduqdan sonra o, çox yaşamadı.

1939-cu ildə vəfat edən Pənah Qasımov Füzuli rayonunun Qarğabazar kəndində dəfn olunmuşdur.

## Ədəbiyyat


1. Azərbaycan Respublikası Prezidentinin İşlər İdarəsi Siyasi Sənədlər Arxivi. f.1., siyahı 8, iş 2830 (Qasımov Pənah Ələkbər oğlunun şəxsi işi).
2. Dövlət Təhlükəsizlik Xidmətinin Arxivi. Qasımov Pənah Ələkbər oğlunun şəxsi işi.
3. C.Cəbrayılbəyli. Pənah Qasımov. "Azərbaycan müəllimi" qəzeti, 22 noyabr 1959-cu il
4. Mərdanov M. Azərbaycan təhsil tarixi. IV cilddə. II cild.Bakı, Təhsil, 2011, s.245-249
5. Əhmədov H., Həmidov S. 100 yaşlı Qarğabazar məktəbi. Bakı, Maarif, 1983, s.31-32
6. Ələsgərov C. Görkəmli maarif xadimi //"Azərbaycan məktəbi" jurnalı, 1966, № 6,
7. Seyidov F. Görkəmli maarif xadimi //"Azərbaycan məktəbi" jurnalı 1970, № 7


***Pənah Ələkbər oğlu Qasımov***



**MƏMMƏD ABBAS OĞLU BAYRAMOV**
*(1898-1938)*

Məmməd Abbas oğlu Bayramov 1898-ci ildə Gəncə şəhərində (Bəzi sənədlərdə Nərimanov rayonunun (indiki Göygöl rayonunun) Zurnabad kəndi göstərilir) muzdur ailəsində anadan olub.1913-1917-ci illərdə Gəncə Müəllimlər Seminariyasında oxuyub. Bir müddət Gəncədə müəllimlik edib. 1918-1920-ci illərdə Milli Ordunun əsgəri olub. 1920-ci ilin iyun – dekabr aylarında Qızıl Orduda pulemyot dəstəsinə rəhbərlik edib.

1921-1922-ci illərdə Gəncədə xalq maarif şöbəsinin inspektoru olub. 7 ay Gəncədəki hərbi hissədə məktəb işlərinə rəhbərlik edib. Ali təhsil almaq məqsədilə Bakıya göndərilən Məmməd Bayramov 1923-1928-ci illərdə Azərbaycan Dövlət Universitetinin Tarix-filologiya fakültəsinin tarix şöbəsində ali təhsil alıb. Təhsil illərində ictimai-siyasi və pedaqoji fəaliyyətini davam etdirib. 1924-1928-ci illərdə Azərbaycan diviziyasında məktəb işləri şöbəsinin rəisi vəzifəsində çalışıb.

Onun həyatının 20-ci illər dövrü əsasən Qızıl Ordu ilə bağlı olub. Hansı vəzifədə işləməsindən və təhsil almasından asılı olmayaraq, həm də Bakıda Qızıl Ordunun siyasi şöbəsində təlimatçı (1920-1929) kimi fəaliyyət göstərib.

Ordudan tərxis olunduqdan sonra 1929-1930-cu illərdə Azərbaycan Dövlət Elmi Tədqiqat İnstitutunun tarix şöbəsində elmi fəaliyyətlə məşğul olub, sinfi mübarizə tarixi ilə bağlı araşdırmalar aparıb, Rusiyada sinfi mübarizə tarixi kafedrasına dosent vəzifəsinə seçilib.

Azərbaycan K(b)P MK-nın qərarı ilə 1 yanvar 1931-ci ildə Ali Pedaqoji İnstituta direktor təyin edilib. O, 1933-cü ilin mart ayına kimi həmin vəzifədə çalışıb. Həmin illər institut üçün çox mürəkkəb bir dövr idi.

İnstitut yeni bərpa olunmuşdu, struktur tam formalaşmamışdı. Fakültələrin, kafedraların strukturunun müəyyənləşdirilməsində, elmi dərəcəsi olanların instituta cəlb edilməsində, stabil tələbə kollektivinin formalaşdırılmasında müəyyən problemlər var idi.

1931-ci ilin oktyabr ayının 29-da V.İ.Lenin adına ADPİ-nin direktorluğunda Məmməd Bayramovun sədrliyi ilə keçən iclasda 29 kafedranın strukturu və professor-müəllim heyəti təsdiq olundu. Nüfuzlu alimlər kafedra müdirləri vəzifəsinə təyin edildi.

ADPİ-də müəllim kadrları hazırlığının səviyyəsinin yüksəldilməsi məqsədilə pedaqoji təhsilin məzmununun ciddi şəkildə dəyişdirilməsi müzakirə olundu. Müzakirə zamanı direktor Məmməd Bayramov institutun tədris planları və proqramlarının məzmunundakı nöqsanların aradan qaldırılması məqsədilə görüləcək işlərdən danışdı. O dövrdə ali pedaqoji təhsildə briqada-laborator metodu geniş yayılmışdı. Həmin metodun tələbinə görə mühazirə və seminar məşğələlərində müəllimin rolu azaldılır, tələbələrin qrup və briqadalarda işləməsinə üstünlük verilirdi. Bu isə tədris prosesinin pozulmasına səbəb olurdu. Təlim işinə rəhbərlik edilməsi briqada və qrup rəhbərlərinin ixtiyarına verilmişdi. Həmin metodun tətbiqi ali məktəb müəllimlərinin tədris prosesində rolunu azaltmaqla yanaşı, həm də onların elmi-pedaqoji fəaliyyətini məhdudlaşdırırdı. Direktorluğun iclasında təlim prosesində laborator-briqada metodunun ləğv edilməsi, yenidən mühazirə metodunun bərpası qərara alındı. Belə bir tədbir ali pedaqoji məktəbdə təlim prosesinin keyfiyyətinin yüksəldilməsinə, onun istehsalatla əlaqəsinin möhkəmlənməsinə səbəb oldu.

Məmməd Bayramovun təşəbbüsü ilə 7 yanvar 1933-cü ildə ADPİ-də geniş müşavirə keçirildi. Bu müşavirə pedaqoji kadr hazırlığında mühüm dəyişikliklərə səbəb oldu, ayrı-ayrı fənlərə ayrılan saatlar ciddi şəkildə redaktə olundu, saat bölgüsündə yol verilən nöqsanlar aradan qaldırıldı.

İxtisaslı kadrlara olan ehtiyacı nəzərə alan Azərbaycan Xalq Maarif Komissarı M.Cuvarlinskinin 12 mart 1933-cü il 69 saylı əmri ilə ADPİ-nin direktoru Məmməd Bayramov həm də institutun SSRİ xalqları tarixi kafedrasına müdir vəzifəsinə təyin olundu.

Onun təşəbbüsü ilə institutda yeni bir fakültə - *siyasi maarif fakültəsi* açıldı. Əvvəlki illərə nisbətən institutda çalışanların arasında elmi dərəcəlilərin sayı artdı. Həmin dövrdə institutun 180 nəfər professor-müəllim heyətindən 17 nəfəri professor, 46 nəfəri dosent idi. Belə ciddi artım ADU-nun ləğvi ilə əlaqədar olaraq onun Pedaqoji fakültəsinin elmi dərəcəli əməkdaşlarının ADPİ-də elmi-pedaqoji fəaliyyətə cəlb edilməsi ilə bağlı idi.

***Məmməd Abbas oğlu Bayramov***

İnstituta tələbə qəbulu artırıldığı kimi, ildən-ilə məzunların sayı da artmağa başladı. 1932-1933-cü tədris ilində institutu 256 nəfər bitirdiyi halda, elə həmin ildə I kursa 583 nəfər qəbul olunmuşdu. Həmin dövrdə digər mühüm bir hadisə 1933-cü ilin əvvəlində Azərbaycan Qiyabi Pedaqoji İnstitutunun V.İ.Lenin adına ADPİ-nin tərkibinə verilməsi idi. Azərbaycan Qiyabi Pedaqoji İnstitutu 1929-cu ildə Azərbaycan Dövlət Universitetinin nəzdində təşkil olunmuşdu. 1930-cu ildə ADU ləğv ediləndə o da müstəqil institut kimi təşkil edilmiş, 1932-ci ildə Xalq Maarif Kadrlarının İxtisasını Artırma İnstitutuna verilmişdi.

Məmməd Bayramov ADPİ-nin direktoru olarkən müəllim kadrları hazırlığında institutun statusunun yüksəltmək məqsədilə xeyli tədbirlər həyata keçirmiş, partiya komitəsinin sədri S.Qəniyev, həmkarlar təşkilatının sədri H.Hüseynovla birlikdə 15 sentyabr 1931-ci ildə Azərbaycan Dövlət Pedaqoji İnstitutunun V.İ.Lenin adına Azərbaycan Pedaqoji Akademiyasına çevrilməsi haqqında vəsatət qaldırmışdır. Bu məqsədə o, ÜİK(b)P-nin Zaqafqaziya Vilayət katibi ***Kartvelişviliyə***, Azərb. K(b)P MK-nın katibi ***Ağa Sultanova***, Azərbaycan SSR Xalq Komissarları Sovetinin sədri ***Dadaş Bünyadzadəyə,*** Xalq Maarif Komissarı ***Maqsud Məmmədova*** məktub ünvanlamışdır. Məktubda Azərbaycanda müəllim kadrları hazırlığında Azərbaycan Dövlət Pedaqoji İnstitutunun xidmətlərindən bəhs olunur, məzunların ibtidai, natamam orta (yeddiillik), doqquzillik məktəblərdə, pedaqoji texnikumlarda fədakarlıqla çalışdıqları bildirilir. Müəllim kadrları hazırlığını təkmilləşdirmək, tədrisi səmərəli təşkil etmək, tədrisin keyfiyyətini yüksəltmək məqsədilə V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutunu ***V.İ.Lenin adına Azərbaycan Pedaqoji Akademiyası*** kimi yenidən təşkil etməyi xahiş edir. «Бакинский рабочий» qəzetinin 15 sentyabr 1931-ci il tarixli sayında dərc edilmiş həmin məktubda yazılır: "Böyük ictimai-siyasi əhəmiyyət daşıyan bu tədbir (Azərbaycan Pedaqoji Akademiyasının yaradılması- R.F.) Şərqdə güclü pedaqoji təhsil mərkəzinin yaradılmasına səbəb olacağı şübhə doğurmur. İnstitutda 4485 tələbə təhsil alır ki, onlardan 680 nəfəri payız qəbulunda götürülmüşdür. Bu da nəzərdə tutulan planın 112 % yerinə yetirilməsidir. Qəbul olunanların sosial-siyasi vəziyyətləri belədir: -fəhlə 56 % (1930/31-ci tədris ilində 25,5 % olub), kolxozçu - 15% (1930/31-ci tədris ilində 1 % olub), partiya və komsomol üzvü olanlar - 68 % (1930/31-ci tədris ilində 40,5 % olub), türklər (azərbaycanlılar -F.R.) - 95%, azsaylı xalqlar 5% (1930/31-ci tədris ilində 0,5 % olub). Qəbul olunanların 25 %-i türk (Azərbaycan-F.R.) qızlarıdır (1930/31-ci tədris ilində 15 % olub). Pedaqoji işçi fakültəsinə götürülən 354 nəfərdən 264 nəfəri azərbaycanlı (onlardan da 38 nəfəri azərbaycanlı

qız), 89 nəfəri azsaylı xalqların nümayəndələridir.İşçi fakültəyə qəbul olunanların hamısı ya fəhlə, ya da fəhlə və kəndlilərin övladlarıdır. Partiya və hökumətin türkləşdirmə siyasəti V.İ.Lenin adına ADPİ-də uğurla həyata keçirilir. Professor-müəllim heyətinin tərkibi əsasən kommunistlərdən ibarətdir.

1930/31-ci tədris ilində onlar akademik heyətin 6,4 %-ni təşkil etdikləri halda, 1931/32-ci tədris ilində 23,8 %-ə yüksəlmişdir. Tədris dili Azərbaycan dilidir. İnstitutun 200 nəfər elmi əməkdaşından 189 nəfəri ya türkdür, ya da türk dilini bilir. Fakültələrin tədris planları işlənərkən Azərbaycan SSR-in neft, pambıq, kənd təsərrüfatının kollektivləşdirilməsi siyasəti nəzərə alınmışdır. 1930/31-ci tədris ilində 578 məzunun hamısı rayonlara göndərilmişdir. Hər cür şovinizmə və millətçiliyə qarşı barışmaz olan V.İ.Lenin adına APİ-nin kollektivi Lenin milli siyasətinin həyata keçirilməsi istiqamətində var gücləri ilə çalışırlar. Bunları nəzərə alaraq V.İ.Lenin adına ADPİ-nin əsasında ***V.İ.Lenin adına Ali Pedaqoji Akademiya*** yaratmağınızı xahiş edirəm. Fəhlə və kəndlilərlə bir cəbhədə olaraq AK(b)P MK və Bakı Komitəsinin rəhbərliyi altında sinfi düşmənlərə, agentlərə, simasını gizlətmiş opportinistlərə qarşı bundan sonra da mübarizə aparacağıq".

Təəssüf ki, məktubun «Бакинский рабочий» qəzetinin 15 sentyabr 1931-ci il tarixli sayında çapından az sonra Məmməd Bayramov Azərbaycan K(b)P MK-nın qərarı ilə 1931-ci ilin oktyabr ayında institutunun direktoru vəzifəsindən azad olunaraq, Tovuz rayon xalq maarif şöbəsinə müdir təyin edilir. Bir müddət rayonda işlədikdən sonra Bakıya qayıdan Məmməd Bayramov Xalq Maarif Komissarlığında pedaqoji kadr hazırlığı idarəsində işləyir, sonra Azərbaycan Mərkəzi İcraiyyə Komitəsinin Prezidiumunun 26 sentyabr 1935-ci il tarixli qərarı ilə Azərbaycan Mərkəzi Arxiv idarəsinin müdiri təyin edilir. Təyinatdan az sonra - 11 dekabr 1935-ci ildə 10 gün müddətinə arxiv sənədlərinin saxlanılması vəziyyətini öyrənmək məqsədilə Kirovabad (Gəncə), Şamxor (Şəmkir), Tovuz rayonlarına ezam olunur. Həmin rayonlarda arxiv işi sahəsində dövlət siyasətinin formalaşdırılması və həyata keçirilməsi, arxiv fondu sənədlərinin komplektləşdirilməsi, uçotu, mühafizəsi və onlardan istifadə qaydalarına əməl olunmasına nəzarət, arxivdə elmi tədqiqat və metodiki işlərin aparılması qaydası haqqında əməkdaşlara tövsiyələr verir. 16-20 iyun 1936-cı ildə yenidən Kirovabad (Gəncə) arxiv idarəsinə ezam olunur, sənədlərin arxivə verilməsi, onların fondlaşdırılması və saxlanılması vəziyyəti ilə tanış olur. Həmin dövrdə həm Mərkəzi Arxiv İdarəsində, həm də rayonlardakı arxiv idarələrində arxiv fondunun formalaşdırılması, mühafizəsi və istifadəsi ilə bağlı xeyli işlər görülür.

***Məmməd Abbas oğlu Bayramov***

Məmməd Bayramov həmin illərdə pedaqoji fəaliyyətlə də məşğul olur. Azərbaycan SSR XMK İxtisasartırma və Qiyabi Pedaqoji Təhsil İnstitutunun direktoru Pənah Qasımovun 14 iyun 1936-cı il tarixində ona ünvanladığı məktubda bildirilir ki, o, Azərbaycan K(b)P MK-nın və Xalq Maarif Komissarlığının razılığına əsasən, Nuxada keçirilən Qiyabi Pedaqoji İnstitutun tarix fakültəsinin yay imtahan sessiyasına mühazirəçi kimi cəlb edilib.



№ ______ 193 il г. СЬQARЬŞ ВЫПИСКА

Kimə—Кому Ц А У АССР.
Ц А У АССР тов. БАЙРАМОВУ Мамеду

PROTOQOL—ПРОТОКОЛ № 8

Umum Azərbajçan Mərkəzi Içraijjə Qomitəsinin Prezidiumunun Içlasь
Заседания Президиума Всеазербайджанского Центрального Исполнительного Комитета

От „26„ сентября 1935 il г.

СЛУШАЛИ:

Об Управляющем Центральным Архивным Управлением А.С.С.Р.

ПОСТАНОВИЛИ:

Управляющим Центральным Архивным Управлением АССР назначить тов. БАЙРАМОВА МАМЕДА

СЕКРЕТАРЬ АзЦИК М.ШАМСАДИНСКИЙ.

ВЕРНО: ЗАВ.ПРОТ.ЧАСТЬЮ АзЦИК"а (МУСАЕВ)

Тип. „Серп и Молот"—Зак. 437. Тираж 1000. 2-VI 35

*M.Bayramovun Azərbaycan Mərkəzi Arxiv İdarəsinin rəisi təyin edilməsi haqqında*

1936-cı ildə Mərkəzi Arxiv İdarəsinin müavini Qaragözovun imzaladığı ailə tərkibi haqqında arayışdan məlum olur ki, Məmməd Bayramov 1903-cü il təvəllüdlü Cənnət xanımla ailəlidir. Onların 1923-cü il təvəllüdlü Adilə və 1928-ci il təvəllüdlü Tamilə adlı qızları var.

SSRİ MİK Mərkəzi Arxiv İdarəsinin müdir vəzifəsini icra edən Maltsev tərəfindən 20 avqust 1936-cı ildə Azərbaycan Mərkəzi Arxiv İdarəsinin müdiri Məmməd Bayramovun ünvanına gələn məktubda onun valideynlərinin 1917-ci ilə kimi nə işlə məşğul olmaları ilə bağlı təcili məlumat verməsi xahiş edilir. Məmməd Bayramov Moskvaya 2 sentyabr 1936-cı ildə göndərdiyi cavab məktubunda valideynlərinin muzdur olmaları və 1905-ci ildə vəfat etmələri ilə bağlı məlumat verir. İctimai-siyasi fəallığı, elmi erudisiyası ilə seçilən Məmməd Bayramov ona qarşı təzyiqlərin başlamasını hiss etsə də vicdanla öz fəaliyyətini davam etdirir, Azərbaycan Mərkəzi Arxiv İdarəsinin işini yenidən qurur.11 fevral 1937-ci ildə Azərbaycan Mərkəzi İcraiyyə Komitəsinin maliyyə-təsərrüfat şöbəsinə məktub yazaraq bildirir ki, Azərbaycan Mərkəzi Arxiv İdarəsinin müdiri olmaqla yanaşı, faktik olaraq arxivdə sənədlərin saxlanılmasına da nəzarət edir. Bu iş üçün 400 rubl. vəzifə maaşı nəzərdə tutulsa da indiyə kimi bir qəpik almayıb, iyun ayının 1-dən etibarən əvəzçiliklə həmin pulunun ona ödənilməsi ilə bağlı sərəncam verilməsini xahiş edir.

Məmməd Bayramovun işdən azad edilməsi ilə bağlı arxiv sənədləri içərisində Azərbaycan Mərkəzi İcraiyyə Komitəsinin Rəyasət Heyətinin 11 fevral 1937-ci ildə keçirilən iclasın 28 saylı protokolunu həyəcansız oxumaq olmur. O, Azərbaycan Mərkəzi İcraiyyə Komitəsinin maliyyə-təsərrüfat

şöbəsinə əməkhaqqının artırılması ilə bağlı müraciət etdiyi gün işdən azad edilir və xalq düşməni kimi həbs olunur. Əks-inqilabi təşkilatın üzvü olduğunu könüllü olaraq boynuna "almadığına" görə ona verilən işgəncələrə və əzab-əziyyətə dözməli olur.



СПРАВКА.-

Дана сия БАЙРАМОВУ Мамеду Абасовичу в том, что он действительно является Управляющим Центральным Архивным Управлением АССР при Аз.ЦИК"е и на его иждивении находятся:

1. Джанет, 1903 г. - жена
2. Адила 1923 г. - дочь
3. Тамиже 1928 г. - дочь

Настоящая справка выдана для представления в Паспортный Отдел.-

Зам.Управляющ.Центр.
Архивн.Управлением АССР
при Аз.ЦИК"е

/ТЮЛЬНАЗАРОВ/

M.Bayramovun ailə tərkibi haqqında arayış

1938-ci il yanvarın 13-də Məmməd Bayramovun işi üzrə istintaqın başa çatması haqqında İttihamnamə aktı tərtib olunub. Həmin akt Azərbaycan SSR xalq daxili işlər komissarının müavini Borşov tərəfindən təsdiq edilib. İttihamnamə aktında (10297№-li) bildirilir: Məmməd Abbas oğlu Bayramov silahlı yolla Azərbaycanı SSRİ-dən ayırmağa çalışan əksinqilabi təşkilatın üzvü olmaqda, millətçilikdə, ziyankarlıqda, casusluqda, partiya və hökumət rəhbərlərinə qarşı terror hazırlamaqda günahkar bilinərək Azərbaycan SSR CM-nin 64, 69, 70 və 73-cü maddələri üzrə ittiham olundu, ondan ötrü ki:

1.Azərbaycan milli əks-inqilabi təşkilatın üzvü olmaqla onun işində fəal iştirak edib.

2.Elm cəbhəsində ziyankarlıqla məşğul olmuş, tədris planlarında pantürkizm ideyalarını təbliğ etmişdir.

3.Sovet hakimiyyətinə qarşı silahlı üsyan mövqeyində olmuşdur.

4.Pantürkist təşkilatının üzvləri Ubaydulin və Tixomirovla sıx əlaqə yaratmış, onların əks-inqilabi fəaliyyətini dəstəkləmişdir.

Məmməd Bayramov istintaqın bütün əzab və əziyyətinə mərdliklə dözmüşdür. Bütün sənədlərdə qeyd olunur ki, Məmməd Abbas oğlu Bayramov ona elan olunan ittihamları özünü müqəssir bilməmişdir. 12-ci şöbənin rəisi




Şelevun imzaladığı arayışdan məlum olur ki, o, 3 iyul 1938-ci ildə Bakı şəhərində güllələnib.

Ailəsi sürgün həyatı yaşamış, yalnız o, bəraət aldıqdan sonra Bakıya gəlmişdir. 1955-ci ildə SSRİ Ali Məhkəməsi Hərbi Kollegiyasının qərarına görə Məmməd Abbas oğlu Bayramov işi ilə əlaqədar SSRİ Ali Məhkəməsi hərbi kollegiyasının çıxardığı hökm ləğv edilmiş və cinayət tərkibi olmadığına görə işə xitam verilmişdir.

## Ədəbiyyat


1. Azərbaycan Respublikası Prezidentinin İşlər İdarəsi Siyasi Sənədlər Arxivi. f.1., saxlama siyahısı 8, iş 1182 (Məmməd Abbas oğlu Bayramovun şəxsi işi).
2. Azərbaycan Respublikası Prezidentinin İşlər İdarəsi Siyasi Sənədlər Arxivi. f.6.,saxlama siyahısı 9, iş 365
3. Dövlət Təhlükəsizlik Xidmətinin Arxivi. Məmməd Abbas oğlu Bayramovun şəxsi işi.
3. Azərbaycan Respublikası Dövlət Arxivi. f.167, siyahı, 2, sax.siy.209
4. Рапорт Азербайджанского педагогического института им. В.И.Ленина. «Бакинский рабочий», 15 сентября 1931 г.


***Məmməd Abbas oğlu Bayramov***



**BƏŞİR NURƏLİ OĞLU BÜNYATOV**
*(1895- 1967)*

Bəşir Nurəli oğlu Bünyatov 1895-ci ildə Gəncə quberniyasının Zəngəzur qəzasının Yuxarı Kiratağ kəndində (Qafan rayonu) yoxsul kəndli ailəsində anadan olub. 9-10 yaşında kənd uşaqları ilə birlikdə iş dalınca Bakıya gəlib. Məşhur neft sahibkarlarından olan Mantaşev qardaşlarının Ramanadakı mədənlərində əmək fəaliyyətinə başlayıb. Bəşir Bünyatov xatirələrində həmin illəri belə xatırlayır: *"1905-1907-ci illərdə həmin mədənlərdə ayda 8 rubla vedrə ilə neft daşımışam. 1907-1913-cü illərdə "Moskva-Qafqaz əməkdaşlığı" mədənlərində, 1913-1915-ci illərdə isə Rotşildin mədənlərində işləmişəm. O illər çox ağır zamanlar idi. Fəhlələrin iş və yaşayış şəraiti olduqca dözülməzdi. Ona görə də tez-tez tətil edirdilər.1914-cü ildəki Balaxanı mədənlərinin tətilində iştirak etdiyimizə görə, 50 nəfərə yaxın fəhlə, qardaşım Nəcəfqulu, uşaqlıq dostum Musa, o cümlədən mən işdən qovulduq. Bir müddət işsiz qaldıq. Sonra yenidən Rotşildin mədənlərində telefonçu vəzifəsinə qəbul olundum. 1917-ci ilə kimi həmin mədəndə çalışdım. Ancaq tətil hərəkatından kənarda qalmadım. Fevral ayından sonra fəhlələrin tətil hərəkatı daha da genişləndi, artıq bu hərəkata partiya rəhbərliyi mövcud idi və hakimiyyəti ələ almaq uğrunda mübarizə gedirdi. Nəhayət, 1917-ci ilin 31 oktyabrında bolşeviklər hakimiyyəti ələ aldılar və Bakı Sovetini təşkil etdilər. Lakin axıra kimi saxlaya bilmədilər.1918-ci ilin 31 iyulunda öz mövqelərini ələdən verdilər. Biz gəmiyə minib Lənkərana getdik. Uşaqlıq dostum Əlpənah Rzayevlə bir müddət Kosalar kəndində yaşadıq. 1918-ci ilin dekabr ayında yenidən Bakıya qayıtdıq."*

Fəhlə hərəkatının fəallarından olan Bəşir Bünyatov təhsil almağı da unutmayıb, 1913-1915-ci illərdə Sabunçudakı ibtidai məktəbdə oxuyub.

1915-1917-ci illərdə pedaqoji kurslarda təhsil alıb. O dövrdə bolşevik mətbuatının və "Molla Nəsrəddin" jurnalının ideyalarının fəhlələr arasında yayılmasında mühüm rol oynayıb.

Onu da qeyd edək ki, 1917-ci ilin aprelində Bəşir Bünyatov Ramanı fəhlələri tərəfindən Bakı Sovetinə üzv seçilmişdi. Həmin ilin iyun ayında Ramanı rayonu üzrə ərzaq komissarı təyin olunmuşdu. 1917-ci ilin iyul ayında bolşevik partiyasına daxil olan Bəşir Bünyatov elə həmin il də Ramanı rayon partiya komitəsinin katibi, 1918-ci ilin mart ayında isə Bakı qəzası Kəndli Deputatları Şurası İcraiyyə Komitəsinin üzvü seçilib. Suraxanı neft sənayesi işçiləri ittifaqının və Suraxanı "Hümmət" təşkilatının yaradıcılarından biri olub.

1919-1920-ci illərdə Suraxanı rayon "Hümmət" təşkilatının məsul katibi, Suraxanı fəhlə klubunun sədri olub.

Bəşir Bünyatov 1920-ci ilin fevralında gizli şəkildə keçirilən Azərbaycan Kommunist Partiyasının I qurultayının iştirakçısı olub.

1920-ci ilin aprel ayının 28-də bolşeviklər hakimiyyəti ələ aldıqdan dərhal sonra Bakının bütün rayonlarında sovet hökumətinin yerli orqanları təşkil edildi. AK(b)P Suraxanı komitəsi 5 nəfərdən ibarət müvəqqəti hərbi-inqilabi komitə təşkil etdi ki, onların da rəhbəri Bəşir Bünyatov idi. Az sonra o, Suraxanı rayon milis idarəsi rəisinin siyasi işlər üzrə müavini təyin olunub.

Bəşir Bünyatov 1921-1923-cü illərdə Bakı Sovetində inzibati şöbənin rəisi, 1923- 1925-ci illərdə Şuşa qəza İcraiyyə Komitəsinin sədri vəzifəsində çalışıb. SSRİ rəhbərliyinin təzyiqi nəticəsində Azərbaycan Mərkəzi İcraiyyə Komitəsi və Azərbaycan Xalq Komissarları Sovetinin birgə qərarı ilə yaradılan Dağlıq Qarabağ Muxtar Vilayəti İnqilab Komitəsinin 5 üzvündən yeganə azərbaycanlı üzvü Bəşir Bünyatov olub. 1923-cü ildə Şuşa qəza İcraiyyə Komitəsinin sədri seçilən Bəşir Bünyatov sentyabr ayında S.M.Kirova ərizə ilə müracət edərək onun mənəvi terrordan azad olunmasına köməklik göstərməsini xahiş edir. Belə ki, o, Şuşada işləyərkən erməni millətçiləri ilə ciddi mübarizə aparmaq məcburiyyətində qalır. Digər tərəfdən Şuşanın şəhər əhalisi Qarabağın dağlıq hissəsinə muxtariyyət verilməsinin tamamilə əleyhinə idi. Ona görə şuşalılar Bəşir Bünyatova xain kimi baxırdı. O, xatirələrində ermənilərlə işləməyin çətinliyindən bəhs edərək yazırdı: "*Erməni millətindən olan adamlarla işləmək o qədər də asan deyildi. Onların iç üzünü 1905-ci ildə görmüşdüm. Bizim kənddən bir kişini öldürmüşdülər. Mənim fəhlə yoldaşım Qədimalının əmisi idi. Bu hadisəni eşidən kimi o, kəndə qayıtmış, həmin erməniləri tapıb, qisasını almışdı. Ancaq faydası nə oldu? Ermənilərin təhriki ilə tutuldu və çar kazakları onu kəndin içində güllələdilər".*

Bəşir Bünyatov AK(b)P MK Azərbaycan SSR Xalq Komissarları Soveti yanında "Savadsızlığı ləğvetmə komitəsi"nin üzvü olub. Komitənin tərkibi

***Bəşir Nurəli oğlu Bünyatov***

adları aşağıda göstərilən nüfuzlu partiya və hökumət üzvlərindən təşkil edilmişdi:1) Q.Musabəyov (sədr); 2) B.Bünyatov (sədr müavini); 3) M.Şahbazov; 4) M.Quliyev; 5) A.Sultanova; 6) T.Şahbazov; 7) Bliyaxin; 8) Kasparov; 9) D.Bynyadzadə.

Bəşir Bünyatov 1924-1925-ci illərdə Azərbaycan SSR XMK Baş siyasi maarif idarəsinin müdiri vəzifəsində çalışıb. 8 mart 1924-cü ildə Azərbaycan SSR XMK Baş siyasi maarif idarəsinin savadsızlığı ləğv etmək sahəsində gördüyü işlər haqqında məruzə edib.

1926-ci ildə Azərbaycan KP MK-nın birinci katibi seçilən L.Mirzoyan onu Şuşa qəza İcraiyyə Komitəsinin sədri vəzifəsindən uzaqlaşdırır. 1926-1927-ci illərdə Zaqatala qəza partiya komitəsinin katibi vəzifəsində işləyir. Azərbaycan SSR Xalq Maarif Komissarlığında təşkilat şöbəsinin müdiri olur.

Bəşir Bünyatov ciddi ictimai-siyasi fəaliyyət göstərməklə yanaşı ali təhsil almağı da unutmur, 1930-cu ildə Azərbaycan Dövlət Universitetinin Sovet hüququ şöbəsini bitirir. O, qısa bir müddətdə (fevral –dekabr 1933) Azərbaycan Dövlət Pedaqoji İnstitutun direktoru olub. (30-cu illərin əvvəllərində institutun tədris işləri üzrə prorektoru Fətulla bəy Rzabəyli idi. Onun başqa işə geçməsi ilə əlaqədar olaraq 26 mart 1933-cü ildə tədris şöbəsinin müdiri Əbülfəz Axundov tədris işləri üzrə direktor müavini təyin olunmuşdu).

Bəşir Bünyatov Azərbaycan Həmkarlar İttifaqları Şurasında mədəniyyət şöbəsinin müdiri (1934), Azərbaycan KP MK -da təlimatçı (1935) vəzifələrində işləyib.

1936-cı ildə o, tamamilə yeni bir sahəyə - Baş Ət Birliyi idarəsinə rəis təyin edilir. Üç il burada uğurla çalışır. 1939-1941-ci illərdə Partiya Arxivində baş elmi işçi kimi fəaliyyət göstərir.

Azərbaycan Qiyabi Pedaqoji İnstitutunun direktoru H.Hacıyev onunla bağlı 24 iyun 1941-ci ildə Azərb.KP MK-nın təbliğat şöbəsinə göndərdiyi xasiyyətnamədə yazır:*"Bünyatov Bəşir Nurəli oğlu 1895-ci ildə anadan olub.1917-ci ildən partiyanın üzvüdür. 1931-ci ildə (əslində 1930-cu ildə-F.R.) Azərbaycan Dövlət Universitetinin Sovet hüququ fakültəsini bitirib. Qiyabi Pedaqoji İnstitutda birinci ildir ki, işləyir. Siyasi iqtisaddan mühazirə oxuyur. Elmi-tədqiqat işi yazır, hələ bitirməyib"*. Həmin illərdə o, həm də Piyada qoşunları məktəbində dərs deyir, 44-cü ordunun təşviqatçısı olur. Sonra fəaliyyətini Azərbaycan Sənaye İstitutunda davam etdirir, təqaüdə çıxana kimi orada siyasi iqtisad fənnindən mühazirə oxuyur.

Bəşir Bünyatovun ictimai-siyasi və pedaqoji fəaliyyəti hökumət və dövlət tərəfindən yüksək qiymətləndirilib. O, Lenin və Qırmızı Əmək Bayrağı ordenləri, 8 medalla təltif olunub. Pedaqoji sahədəki uğurlu fəaliyyətinə görə ona "Əməkdar müəllim" fəxri adı verilib. Ümumittifaq dərəcəli fərdi

təqaüdçü olub. Azərbaycan KP MK-nın və Bakı Komitəsinin, Azərbaycan Mərkəzi İcraiyyə Komitəsinin üzvü olub. O, 1922-ci ildə Kominternin IV konqresində Azərbaycan Kommunist Partiyasını təmsil edib.

Bəşir Bünyatov ömrünün sonuna kimi fəal həyat mövqeyi nümayiş etdirib, həmişə ictimai-siyasi hadisələrin mərkəzində olub. Partiya yoldaşları haqqında xatirələr yazıb, inqilabçılarla bağlı ali və orta məktəblərdə, rayon və şəhər partiya komitələrində keçirilən müxtəlif səviyyəli görüşlərin iştirakçısı olub. Partiya qurultaylarında və elmi konfranslarda məruzələrlə çıxış edib. 17-20 sentyabr 1963-cü ildə Bakıda RSDFP-nin II qurultayının 60 illiyinə həsr olunmuş elmi sessiyada maraqlı məruzə ilə çıxış edərək RSDFP-nin II qurultayının keçirildiyi ərəfədə Bakıdakı ictimai-siyasi vəziyyəti təhlil edib, Bakı bolşeviklərinin inqilabi fəallığından, qurultayın qərarının fəhlələr arasında təbliğinin əhəmiyyətindən danışıb. Məruzədə diqqəti cəlb edən xüsusi bir məqamı xatırlatmaq istərdim. Bəşir Bünyatov məruzəsində özünün də iştirak etdiyi Kominternin IV konqresində V.İ.Leninin çıxışından sitat gətirir:”*Bu gün həm rus, həm xarici yoldaşlar üçün ən vacib məsələ oxumaqdır. Hazırda biz yalnız inqilab sayəsində oxumaq imkanı əldə etmişik.”* Və sonra o, əlavə edir ki, bizim gənclər mütləq oxumalıdır. Özü də yalnız tədris müəssisələrinin divarları arasında yox, təcrübəni öyrənmək lazımdır, yaşlı nəslin təcrübəsini öyrənmək lazımdır. Bakı proletariatının inqilabi mübarizəsinin fəal iştirakçısı və canlı şahidi olan Bəşir Bünyatov sağlığında xatirələrini qələmə almış, 1966-cı ildə “Keçmişin qəhrəmanlıq səhifələri (Xatirələr)” adı ilə “Azərnəşr”də çap etdirmişdir. “Xatirələr” həm də avtobioqrafik xarakter daşıyır.




Onun haqqında ilk material axtaranda xeyli çətinliklə rastlaşdım. Azərbaycan Respublikası Prezidentinin İşlər İdarəsi Siyasi Sənədlər Arxivində, nə də ADPU-nun arxivində onun şəxsi işi yoxdur. Xeyli axtarışdan sonra Azərbaycan Respublikası Prezidentinin İşlər İdarəsi Siyasi Sənədlər Arxivinin Kitabxanasında mənə P.Qasımovun “Azərbaycanda sovet hakimiyyəti uğrunda fəal mübarizlər” kitabını verdilər. Təəccübümü gizlədə bilmədim. Bu kitabda Nəriman Nərimanov, Dadaş Bünyadzadə, Qəzənfər Musabəyov, Mustafa Quliyev və digər məşhur inqilabçılarla birlikdə Bəşir

Bünyadov haqqında da iki səhifəlik oçerk verilmişdi. Bu, onun siyasi nüfuzuna, partiya quruculuğundakı xidmətlərinə verilən dəyərdir.

1967-ci ilin aprelin 13-də dünyasını dəyişən Bəşir Bünyatov Fəxri Xiyabanda dəfn olunub.

**Ədəbiyyat**


1. Azərbaycan Respublikası Prezidentinin İşlər İdarəsi Siyasi Sənədlər Arxivi. f.1., siyahı 26, iş 713 (Azərbaycan Qiyabi Pedaqoji İnstitutunun direktoru H.Hacıyevin Azərb.KP MK-ya məktubu)
2. Təhməzoğlu R. Bünyatlılar. Bakı, 2011,s.57-60
3. П.А.Касимов. Активные борцы за советскую властъ в Азербайджане. Баку,1957, с.299-300
4. Газ. "Известия ВРК Азербайджанской ССР", 20 мая 1920
5. Дж.Гулиев. Борба Коммунистической Партии за осуществление ленинской националъной политики в Азербайджане. Баку,1979, с.537
6. Джамиль Гасанлы. Вопрос о Нагорном Карабахе на Кавказском Бюро ЦК РКП(Б) В 1920—1923 годах https://www.ca-c.org/c-g/2011/journal_rus/c-g-1-2/12.shtml
7. Буниятов Б.Н.Страницы героического прошлого (Воспоминания). Баку, Азернешр, 1966
8. Славные страницы борьбы и побед. Материалы научной сессии, посвященной 60-летию II РСДРП и всеобщих забастовок в Ваку и на юге России летом 1903 г. Баку,1965, с.25-26


***Bəşir Nurəli oğlu Bünyatov***



**MİRZƏ SULTAN OĞLU MƏMMƏDOV**
*(1901- 1938)*

Mirzə Sultan oğlu Məmmədov 1901-ci ildə Bakıda anadan olub. Atası Süleyman kişi 1905-ci ildən 1921-ci ilə kimi Bakı şəhər Dumasında, sonralar isə Partiya kurslarında və məktəbində kuryer işləyib.

Mirzə Məmmədov 1914-1918-ci illərdə Bakıda ali ibtidai məktəbdə oxuyub. 1918-ci ildə Bakı Politexnik Məktəbinə daxil olub. Həmin məktəb 1888-ci ildə şəhər sənət məktəbi kimi fəaliyyətə başlamış, 1917-ci il mayın 30-da üç şöbədən (neft sənayesi, elektromexanika və memarlıq-inşaat) ibarət politexnikuma çevrilmiş və Bakı Politexnik Məktəbi adlandırılmışdı.

Mirzə Məmmədov 1917-ci ildə fevral inqilabı ərəfəsində inqilabi hərəkata qoşulub. Azərbaycanda və bütün islam dünyasında ilk milli sosial-demokrat təşkilat olan "Hümmət"in üzvü seçilib. Həmin illərdə müəllim kimi fəaliyyət göstərməklə yanaşı, həm də ictimai-siyasi fəallığı ilə seçilib. "Hümmət" təşkilatının tapşırığına uyğun olaraq Bakı şəhərində və ətraf kəndlərdə (xüsusilə Buzovna kəndində) partiyanın ideyalarını təbliğ etməklə məşğul olub. Fəhlə hərəkatının genişlənməsində, tətillərin, nümayiş və konfransların təşkilində peşəkar partiya işçisi kimi çalışıb.

1918-ci ildə Bakı şəhərində erməni-daşnak birləşmələri və bolşeviklər dinc müsəlman əhalisinə qarşı misli görünməmiş cinayətlər törətdilər. Həmin günlərdə faciədən əzab çəkənlərə maddi və mənəvi yardım edənlərdən biri də Mirzə Məmmədov olub. 1920-ci ildə onun siyasi fəaliyyəti daha da genişlənir, "Ədalət", "Hümmət" və RK(b)P ilə sıx əməkdaşlıq edir. Azərbaycan sovetləşdirildikdən sonra AK(b)P-nin Zığ rayon komitəsinin katibi və Bakı komitəsinin hərbi şöbəsində təlimatçı işləyir. Ali təhsil almaq məqsədilə

1920-ci ildə Moskvada Sverdlov adına Universitetinə göndərilir. Burada cəmi 6 ay oxuyur. 1921-ci ildə Moskvada Şərq Zəhmətkeşləri Kommunist Universiteti (Коммунистический университет трудящихся Востока им. И. В. Сталина) təşkil edildiyinə görə digər Şərq xalqlarının nümayəndələri ilə birlikdə Mirzə Məmmədov da həmin instituta köçürülür. Yeni yaranan məktəbin əsas vəzifəsi ayrı-ayrı respublikalar üçün milli partiya işçiləri hazırlamaqdan və xarici tələbələri öz ölkələrində üsyan və inqilab təşkil etməyə, kommunizm qurmağa hazırlamaqdan ibarət idi. Universitetdə partiya işlərinin təşkili Mirzə Məmmədova həvalə olunur. 1923-cü ildə Mirzə Məmmədov İ.V.Stalinin adını daşıyan universitetdə partiya özəyinin katibi seçilir. 1924-cü ildə Bakıya qayıdan Mirzə Məmmədov Azərbaycan K(b)P Qala-Maştağa rayon komitəsinin katibi təyin olunur. 1926-cı ildə Azərbaycan K(b)P Bakı komitəsinin üzvü seçilən Mirzə Məmmədov yenidən Moskvaya qayıtmalı olur.

1926-1927-ci illərdə Şərq Zəhmətkeşləri Kommunist Universiteti partiya komitəsinin katibi olur. 1927-1931-ci illərdə həmin universitetin aspiranturasında təhsil alır. 1931-1932-ci illərdə Azərbaycan K(b)P MK-da mədəniyyətin təbliği şöbəsinin müdir müavini və nəşriyyat şöbəsinin müdiri olur. 1932-1933-cü illərdə AK(b)P-nin Nuxa rayon komitəsinə rəhbərlik edir.

V.İ.Lenin adına ADPİ-də kadr hazırlığının keyfiyyətini yüksəltmək məqsədilə Azərbaycan K(b)P MK 7 dekabr 1933-cü ildə “Ali Pedaqoji İnstitut haqqında” xüsusi qərar qəbul etdi. Həmin qərarda institutda pedaqoji kadr hazırlanmasında əldə edilən nailiyyətlər göstərilməklə yanaşı, institutun kadr hazırlığı sahəsində qarşısında duran vəzifələrin həyata keçirilməsi işindəki nöqsanlar qeyd olundu. Tələbə kollektivinin möhkəmləndirilməsi, müəllim heyətinin tərkibinin nəzərdən keçirilməsi ciddi bir vəzifə kimi qarşıya qoyuldu. Rus və erməni qruplarında ideoloji rəhbərliyin düzgün qurulmaması, partiya təşkilatının və direktorun millətçi ünsürlərə layiqli cavab verməməsi ciddi tənqid olundu. Yeri gəlmişkən, qeyd edək ki, Ali Pedaqoji İnstitutun fəaliyyətinin Azərbaycan K(b)P MK səviyyəsində müzakirə olunmasının baiskarları erməni Verdiyan və Gevorqyan, daha doğrusu, onların divar qəzetində nəşr etdirdikləri millətçi şeirləri idi. Bu məsələyə görə Pedaqoji İnstitutun rəhbərliyi dəyişdirildi, institut partiya komitəsi, Voroşilov rayon partiya komitəsi, Xalq Maarif Komissarlığı haqsız yerə günahlandırıldı. Professor-müəllim və aspirantların siyasi mövqeyinin yoxlanılması, kollektivin tərkibinin kommunistlərin hesabına gücləndirilməsi, beynəlmiləl tərbiyənin ön plana çəkilməsi vacib hesab

edildi. ADPİ-nin əməkdaşlarının Bakıdan kənarda təsərrüfat və siyasi işlərə cəlb edilməsi qadağan olundu. Pedaqogikanın tədrisini və pedaqoji kadr hazırlığını yaxşılaşdırmaq məqsədilə periodik olaraq elmi məcmuələrin nəşrinə icazə verildi.

1933-cü ilin dekabr ayında Pedaqoji İnstitutun rəhbərliyi dəyişdirildi, Azərbaycan K(b)P MK-nın büro iclasında Mirzə Məmmədov ADPİ-yə direktor təyin edildi.

İnstitutda yeni fakültənin, kafedraların təşkilinə, aspirantların seçilməsinə və yerləşdirilməsinə diqqət artırıldı. 1935-ci ildə respublikanın ali pedaqoji institutlarını vahid mərkəzdə birləşdirmək qərara alındı, tarix-filoloji, fizika-riyaziyyat və təbiyyat şöbələrindən ibarət İkiillik Müəllimlər İnstitutu ADPİ-nin tərkibinə daxil edildi və ona da rəhbərlik Mirzə Məmmədova həvalə olundu. Respublika məktəblərinin müəllim kadrlarına olan ehtiyacı nəzərə alaraq Pedaqoji İnstitutun qəbul planı ildən-ilə artırıldı. Belə ki, instituta 1933/34-cü tədris ilində 416, 1934/35-ci tədris ilində 482, 1935/36-cı tədris ildə 682, 1936/37-ci tədris ilində 710 nəfər tələbə qəbul olundu. Məzunların sayı 1932/33-cü tədris ilində 63 nəfər olduğu halda, 1935/36-cı tədris ilində 1213 nəfərə yüksəldi. İnstitutun elmi həyatında mühüm dəyişikliklər baş verdi, elmi dərəcəsi və elmi adı olanların sayı artdı. İnstitutun partiya, həmkarlar və komsomol təşkilatının işi yenidən quruldu. Tələbələrin ictimai-siyasi fəaliyyəti ilə yanaşı tədris uğurları da artdı. Filologiya fakültəsinin nəzdində rus dili və ədəbiyyatı şöbəsi açıldı. İnstitut əməkdaşları müxtəlif fənlərin tədrisinin səviyyəsinin yüksəldilməsi və elmin ayrı-ayrı sahələrinin aktual problemləri ilə bağlı maraqlı araşdırmalar aparırdılar. Elmi nəticələr Mirzə Məmmədovun məsul redaktorluğu ilə 1935-ci ildən nəşr olunan "APİ Xəbərləri"ndə çap edilirdi.

Mirzə Məmmədov 14 may 1936-cı ilə kimi V.İ.Lenin adına Azərbaycan Pedaqoji İnstitutunun direktoru vəzifəsində çalışdı. 14 may 1936-cı ildə Azərbaycan KP(b)P MK-nın qərarı ilə Mirzə Məmmədov Azərbaycan Pedaqoji İnstitunun partiya komitəsinin katibi seçildiyinə görə direktor vəzifəsindən azad edildi. Onun yerinə ADPİ-nin direktoru vəzifəsinə Azərbaycan Partiya Nəşriyyatının direktoru Mirzə Davud Rəsulzadə təyin olundu.

Mirzə Məmmədov Azərbaycan K(b)P Şəki rayon komitəsinə rəhbərlik edərkən "Şəki" qəzetinin (1921-ci ildən nəşr edilir) 1000-ci sayının nəşri ilə əlaqədar olaraq Azərbaycan K(b)P MK tərəfindən diplomla təltif olunub.

Elmi yaradıcılıqla məşğul olan Mirzə Məmmədov "Firqə işçisi" jurnalı ilə sıx əməkdaşlıq edib. Jurnalda onun "AK(b)P-də milli təmayüllər, Nəriman Nərimanovun konsepsiyası" (1935, №9-10), "Mirzə Davud

Hüseynovun “Müsavat" firqəsi keçmişdə və indi” (1935, №11) məqalələri nəşr olunub. Əsas tədqiqat sahəsi milli-mədəni problemlərin araşdırılması olub.




Mirzə Məmmədov 1937-ci ildə əks-inqilabi fəaliyyətdə, casusluqda, anti-sovet təbliğatı aparmaqda şübhəli bilinərək həbs olunur. Geniş ictimai-siyasi və pedaqoji fəaliyyətlə məşğul olan Mirzə Məmmədov ona ünvanlanan ittihamları rədd edərək, günahsız həbs edilməsi ilə bağlı AK(b)P MK-ya şikayət ərizəsi yazır. 15 fevral 1937-ci ildə onun yazdığı məktub Mərkəzi Komitənin büro iclasında müzakirə olunur, ərizədə göstərilənlərin diqqətlə yoxlanılması qərara alınır. 1937-ci ilin noyabrında Azərbaycan SSR xalq daxili işlər komissarı Y.D.Sumbatovun təsdiq etdiyi İttihamnamə aktından (12493 №-li) məlum olur ki, həmin ərizənin ona heç bir xeyiri olmur, Mirzə Sultan oğlu Məmmədov trotskiçilikdə, millətçilikdə, ziyankarlıqda, casusluqda və terrorda günahkar bilinərək Azərbaycan SSR CM-nin 64, 73 və 70-ci maddələri üzrə ittiham olunur. İttihamnamədə bildirilir ki, o:

1.1 dekabr 1934-cu ildə S.M.Kirovun amansızcasına öldürülməsini həyata keçirən, sonrakı illərdə (1934-1937) partiya və hökumət rəhbərlərinə qarşı terror aktı hazırlayan əks-inqilabi trotskiçi-zinovyevçi terrorist təşkilatın üzvü olub.

2.1932-ci ildə Azərbaycanı silahlı üsyan yolu ilə SSRİ-dən ayırmağı qarşısına məqsəd qoyan əks-inqilabi milli təşkilata cəlb edilmiş, ziyankarlıq, təxribat, casusluq, partiya və hökumət rəhbərlərinə qarşı terror həyata keçirmişdir.

***Mirzə Sultan oğlu Məmmədov***

3.Əks-inqilabi milli təşkilatın sıralarında olmaqla Azərbaycan Dövlət Pedaqoji İnstitutunda ətrafına əks-inqilabçı millətçiləri toplamış, şəxsən özü prof.B.Həsənbəyovu (*iqtisadçı professor, 1935-1937-ci illərdə Azərbaycan Dövlət Universitetinin rektoru- F.R.)* həmin təşkilata cəlb etmişdir.

4. Göyçay rayonunda əks-inqilabi meylin gücləndirilməsinin ona tapşırılmasından aydın olur ki, onun əks-inqilabi milli təşkilatın silahlı üsyan planından xəbərdar olub.

5. Əks-inqilabi milli təşkilatın üzvləri ilə əlaqəsi olub, Mikayıl Hüseynovdan (*Azərb.K(b)P MK partiya təbliğatı, təşviqatı və mətbuatı şöbəsinin müdiri- F.R.*) əks-inqilabi tapşırıqlar alıb və nəticəsi haqqında onu məlumatlandırıb.

İttihamnamədə bildirilir ki, istintaqın sonunda müttəhim ona qarşı irəli sürülənlərin heç birini qəbul etməyib. Ona dəhşətli əzablar verilsə də o, heç kəsin üzünə durmayıb, güllələnə kimi təkbaşına mübarizə aparıb. Onun son istintaqı 21 saat çəkib. Verilən əzab-əziyyətlərə və işgəncələrə baxmayaraq heç milli təşkilatın üzvü olmadığını, hətta belə bir təşkilatın varlığından xəbərsiz olduğunu, həmin təşkilatın heç bir üzvünü tanımadığını və silahlı üsyan hazırlamadığını bildirsə də dəhşətli Stalin repressiyasından qurtarmaq ona nəsib olmur. 3 iyul 1938-ci ildə trotskiçi, millətçi, ziyankar, casus və terrorcu kimi günahkar bilinərək Bakıda güllələnir.

1955-ci ildə SSRİ Ali Məhkəməsi hərbi Kollegiyasının qərarına görə Mirzə Sultan oğlu Məmmədov işi ilə əlaqədar SSRİ Ali Məhkəməsi hərbi kollegiyasının çıxardığı hökm ləğv edilmiş və cinayət tərkibi olmadığına görə işə xitam verilmişdir.

**Ədəbiyyat**


1. Azərbaycan Respublikası Prezidentinin İşlər İdarəsi Siyasi Sənədlər Arxivi. f.1., saxlama siyahısı 8, iş 3628 (Məmmədov Mirzə Sultan oğlunun şəxsi işi)
2. "Ali Pedaqoji İnstitut haqqında" Azərbaycan K(b)P MK-nın 1933-cü il 7 dekabr tarixli qərarı. "Kommunist" qəzeti, 28 dekabr 1933-cü il
3. Azərbaycan Respublikası Prezidentinin İşlər İdarəsi Siyasi Sənədlər Arxivi. f.1., saxlama siyahısı 19, sax.vah.21.
4. Dövlət Təhlükəsizlik Xidmətinin Arxivi. Məmmədov Mirzə Sultan oğlunun şəxsi işi


***<u>Mirzə Sultan oğlu Məmmədov</u>***



**MİRZƏ DAVUD MƏSİM OĞLU RƏSULZADƏ**
*(1900-1943)*

Mirzə Davud Rəsulzadə 1899-cu ilin aprel ayında Gəncədə ruhani ailəsində anadan olub. Atası Məsim Rəsulzadə Gəncədə tanınmış din xadimi idi. Məkkədə ruhani seminariyasında oxumuşdu, ərəb və fars dillərini mükəmməl bilirdi. Ərəb dilindən Azərbaycan dilinə tərcümələr etmişdir. Maarifpərvər bir şəxs olduğundan Gəncədə açılan dünyəvi məktəblərə rəğbətlə yanaşırdı. Elə buna görə də oğlu Davud məhəllə məktəbini (dini məktəbi) bitirdikdən sonra tərəddüd etmədən onu Gəncə 6 sinifli şəhər məktəbinə qoymuşdu.

Davud Rəsulzadə 1908-1914-cü illərdə Gəncə 6 sinifli şəhər məktəbində, 1914-1918-ci illərdə isə Tiflisdəki orta ixtisas texniki məktəbdə təhsil alıb. Orta ixtisas texniki məktəbinin kənd təsərrüfatı bölməsində təhsil alan Davud Rəsulzadə hidrotexnika mühəndisliyi ixtisasına yiyələnib.

Həmin dövrdə Rusiyada ciddi ictimai-siyasi hadisələr baş verdi. 1917-ci ildə Rusiyada baş verən inqilab Qafqaza da öz təsirini göstərdi. Baş verənlər Davudgilin ailəsində ciddi fikir ayrılığına səbəb oldu. Atası inqilabi dəyişikliyə mənfi münasibət bəsləyirdi. Böyük qardaşı isə, ümumiyyətlə, dəyişiklikləri qəbul etməyərək İrana köçdü. Bu dövrdə ailədə bədbəxtlik baş verdi. Davudun kiçik qardaşı tüfənglə ehtiyatsız davrandığından təsadüfi güllənin qurbanı oldu. Ailə faciəsi onu sarsıtsa da ali təhsil almaq arzusunun qarşısını kəsə bilmədi.

Davud Rəsulzadə 1918-ci ildə yenidən Tiflisə qayıdaraq Politexnik İnstitutunun hidromexanika fakültəsinə daxil olur. O, 1921-ci ilə kimi Tiflisdə həm ali təhsil alır, həm də su təsərrüfatı idarəsində (1917-1919), Azərbaycanın Gürcüstandakı diplomatik nümayəndəliyində (1920-1921) işləyir.

***Mirzə Davud Məsim oğlu Rəsulzadə***

Davud Rəsulzadə Azərbaycan Respublikası Prezidentinin İşlər İdarəsi Siyasi Sənədlər Arxivində saxlanan tərcümeyi-halında yazır ki, institutda oxuyarkən kursu tam keçib, amma 1921-ci ildə Azərbaycan SSR-in Ankarada səlahiyyətli nümayəndəsinin katibi (1921-1922) təyin olunduğundan diplom işini təqdim edə bilməyib.

Tələbəlik illərində inqilabçı-demokratik düşüncəli insanlarla əməkdaşlıq edən Davud Rəsulzadə 1920-ci ildə Kommunist Partiyasının üzvlüyünə daxil olur. Təhsilini başa vurduqdan sonra Tiflisdə əmək fəaliyyətinə başlayır. Az sonra siyasi işə keçir. Əvvəlcə Azərbaycanın Gürcüstandakı missiyasının katibi, Azərbaycan SSR-in Batumda konsulu, Azərbaycan SSR-in Gürcüstanda səlahiyyətli nümayəndəsinin müavini vəzifələrində çalışır. Özünün yazdığına görə, həmin illərdə öz üzərində ciddi şəkildə işləyir. Müstəqil olaraq elmi-kütləvi ədəbiyyatı mütaliə edir, sosial-iqtisadi məsələləri öyrənir, rus klassiklərindən L.Tolstoy, A.S.Puşkin, M.Y.Lermontov, N.A.Nekrasov, İ.Turgenev, A.Çexov, N.Qoqol, A.S.Qriboyedov və M.Qorkinin əsərlərini mütaliə edir. Avropa klassiklərindən Şillerin və Şekspirin əsərlərini oxuyur.

O, Azərbaycanın Türkiyədəki missiyasının katibi kimi Ankaraya ezam olunmamışdan əvvəl ailə həyatı qurur. Həyat yoldaşı həkim idi, Gürcüstan Universitetinin tibb fakültəsini bitirmişdi, milliyyətcə rus idi. Qızı Gülnarənin xatirələrinə görə, anası ailəsini, həyat yoldaşının vətənini, Azərbaycan mədəniyyətini çox sevirdi. Mirzə Davudun sevdiyi Azərbaycan yeməklərini çox dadlı bişirər, plov dəmləyərdi. İki il Türkiyədə çalışdıqdan sonra Tiflisə qayıdan Mirzə Davud jurnalistlik fəaliyyətini davam etdirir.

Tiflisdə Azərbaycan dilində ayrı-ayrı vaxtlarda nəşr olunan “Yeni fikir” (1924), “İşıq yolu” (1927-1928) və “Yeni kənd” (1930) qəzetinin redaktoru olub. (Həmin qəzetin əsası 1921-ci ildə qoyulub. İlk adı “Kommunist” olub. Ayrı-ayrı vaxtlarda “Yeni fikir” (1922-1927) , “Yeni kənd” (1927-1938), “Sovet Gürcüstanı” (1938-1990), 1990-cı ildən “Gürcüstan“ adı ilə nəşr olunur). Həmin illərdə o, həm də “Заря Вастока” qəzetinin redaksiya heyətinin üzvü olub. Jurnalistlik fəaliyyəti ilə yanaşı ali məktəblərdə biologiya, qeyri-üzvi kimya, partiya quruculuğu, partiya tarixi və leninizm fənlərindən dərs deyib.

Davud Rəsulzadə 1932-1933-cü illərdə Zaqafqaziya Kommunist Universitetinin tədris işləri üzrə prorektoru və Partiya quruculuğu və leninizm kafedrasının müdiri olub. Zaqafqaziya Elmi Tədqiqat İnstitutunda direktor müavini vəzifəsində çalışıb. Gürcüstanda yaşayan azərbaycanlılar arasında savadsızlığın ləğvində, latın əlifbasına keçməkdə, Azərbaycan teatrının yaradılmasında (Əli Tağızadə və Məmməd Cəfərli ilə birlikdə) səmərəli fəaliyyət göstərib.

***Mirzə Davud Məsim oğlu Rəsulzadə***

1927-ci ildə Gürcüstan Xalq Maarif Komissarlığının ixtisas komissiyası tərəfindən ona dosent adı verilib. 1931-ci ildə Zaqafqaziya Kommunist Universitetində çalışarkən professor vəzifəsinə seçilib.

Davud Rəsulzadə 1920-ci ildən ömrünün sonuna kimi partiya işində çalışıb. Ayrı-ayrı vaxtlarda Zaqafqaziya Diyar Partiya Komitəsinin kəndlərlə iş şöbəsinin müdiri, təbliğat-təşviqat şöbəsinin müdir müavini və Gürcüstan K(b)P MK-nın üzvü olub (1928). Axalkalakidə qəza İcraiyyə Komitəsinin sədr müavini (1924-1925), Borçalıda İcraiyyə Komitəsinin sədri (1925-1926), Azərbaycan SSR Naxçıvan Vilayət Partiya Komitəsinin məsul katibi (1931-1932) olub. 9 fevral 1933-cü ildə Zaqafqaziya Diyar Komitəsi tərəfindən Azərbaycan K(b)P MK-nın sərəncamına göndərilib. Azərbaycan hökuməti onu ev və maşınla təmin edib. Elə həmin ildə Azərbaycan K(b)P Salyan rayon komitəsinin katibi seçilib.

ÜİK(b)P MK 30 iyul 1930-cu ildə RSFSR nəşriyyatları ilə bağlı xüsusi qərar verdi. Bu qərar yeni nəşriyyatların yaranmasına təsir göstərdi. O dövrdə Azərbaycanda yalnız "Azərnəşr" (Azərbaycan Dövlət Nəşriyyatı) fəaliyyət göstərirdi. Həmin ildə 4 əlavə nəşriyyat (Azneftnəşr, Uşaqgəncnəşr, Akademiya nəşriyyatı və Azərbaycan Partiya Nəşriyyatı) yaradıldı. 1934-cü ildə Davud Rəsulzadə Azərbaycan Partiya Nəşriyyatına direktor təyin edildi.

Nəşriyyata rəhbərlik etməklə yanaşı, o, həm də Azərbaycan Sənaye İnstitutunda, Marksizm-Leninizm İnstitutunda, Manqlisdə (Tiflis qəzasında kənd) və Buzovnada partiya fəalları üçün təşkil edilən kurslarda mühazirələr oxuyur. Təcrübəli nəşriyyat işçisi olan Davud Rəsulzadə həm də elmi tədqiqatla məşğul olub. Rus dilində olan xeyli pedaqoji ədəbiyyatın, xüsusilə də dərsliklərin Azərbaycan dilinə tərcüməsində iştirak edib. K.Marksın, V.İ.Leninin və İ.Stalinin dilimizə tərcümə olunan əsərlərini redaktə edib. 1934-1936-cı illərdə Azərbaycan Partiya Nəşriyyatının çap etdiyi kitab və kitabçaların, büroşüraların redaktoru olub.

14 may 1936-cı ildə Azərbaycan K(b)P MK-nın 127 saylı qərarı ilə ADPİ-nin direktoru Mirzə Məmmədov institut partiya komitəsinin katibi seçildiyinə görə, Azərbaycan Partiya Nəşriyyatının direktoru vəzifəsində çalışan Davud Rəsulzadə instituta direktor təyin edilir. O, həmin vəzifədə 31 fevral 1937-ci ilə kimi çalışır.

Azərbaycan Xalq Maarif Komissarlığının 23 avqust 1936-ci tarixli 765 saylı əmri ilə Azərbaycan Elmi-Tədqiqat Pedaqogika İnstitutu Azərbaycan Pedaqoji İnstitutunun nəzdinə verilir. Mirzə Davud Rəsulzadə Azərbaycan Elmi-Tədqiqat Pedaqogika İnstitutuna (indiki Təhsil İnstitutu) əvəzçiliklə direktor, böyük elmi işçi İsak Musa oğlu Şeyxzaman direktor müavini, professor B.B.Komarovski elmi katib təyin olunur. Davud Rəsulzadə həm

Pedaqoji İnstituta, həm də Azərbaycan Elmi-Tədqiqat Pedaqogika İnstitutuna rəhbərlik etməli olur.



Davud Rəsulzadə az bir müddətdə ADPİ-nin direktoru olsa da, maddi-texniki bazanın möhkəmləndirilməsi və kadr potensialının yüksəldilməsi ilə bağlı müəyyən işlərin görülməsinə nail olur.Belə ki, onun yazışmaları əsasında instituta ayrılan maliyyə vəsaiti 1933/34-cü tədris ili ilə müqayisədə 3 dəfədən çox artırılır. Bu da institutun genişlənməsinə, professor-müəllimlərin və tələbələrin sayının artmasına səbəb olur. Artıq 1936/1937-ci tədris ilində institutda 1512 nəfər tələbə təhsil alırdı. Onun sədrliyi ilə keçirilən institut Elmi Şurasında üç nəfər (A.İ.Qarayev, Ş.A.Məmmədov, Z.M.Şaxtaxtinskaya) müvəffəqiyyətlə namizədlik dissertasiyası müdafiə edir. O dövrdə dissertasiya müdafiələri üçün xüsusi ixtisaslaşdırılmış Müdafiə Şuraları yox idi.Dissertasiyalar institut Elmi Şuralarında müdafiə olunurdu. Davud Rəsulzadə Zaqafqaziya Sovet Federativ Sosialist Respublikasında (12 mart 1922-ci ildən 5 dekabr 1936-cı ilə qədər mövcud olub) işləyərkən o dövrdə Zaqafqaziya Vilayət Partiya Komitəsinin birinci katibi L.Beriya ilə aralarında mübahisəli vəziyyət yaranır. Azərbaycana köçsə də, burada o, L.Beriyanın qəzəbindən yaxa qurtara bilmir. Azərbaycan SSR Xalq Komissarları Sovetinin incəsənət işləri komitəsinin sədri vəzifəsində çalışan Mirzə Davud Rəsulzadə 22 dekabr 1937-ci ildə əmlakı müsadirə olunmaqla həbs edilir. Onda onun yeganə qız övladı Gülnarənin 7 yaşı var idi.

16 mart 1939-cu ildə Azərbaycan SSR xalq daxili işlər komissarının müavini Kərimovun təsdiq etdiyi İttihamnamə aktında (24554 №-li) bildirilir: Mirzə Davud Məsim oğlu Rəsulzadə silahlı yolla Azərbaycanı SSRİ-dən ayırmağa çalışan əks-inqilabi təşkilatın üzvü olmaqda, millətçilikdə, ziyankarlıqda, casusluqda, partiya və hökumət rəhbərlərinə qarşı terror hazırlamaqda günahkar bilinərək Azərbaycan SSR CM-nin 21/24, 17/69, 18/70 və 73-cü maddələri üzrə ittiham olundu, ondan ötrü ki:

1. Azərbaycanda fəaliyyət göstərən əks-inqilabi milli təşkilata 1935-ci ildə həmin təşkilatın üzvü Mikayıl Hüseynov *(Azərb.K(b)P MK partiya təbliğatı, təşviqatı və mətbuatı şöbəsinin müdiri- F.R.)* tərəfindən cəlb olunub. Əks-inqilabi millətçi təşkilatın burjua millətçi respublika yaratmaq planından xəbəri olub.

***Mirzə Davud Məsim oğlu Rəsulzadə***

2. Sovet hakimiyyətinə qarşı silahlı üsyan hazırlayan əksinqilabi millətçi təşkilatın ehtiyat tərkibinə daxil edilib, mədəniyyət cəbhəsində ziyankarlıq işi aparıb.

Bir məsələni qeyd edim ki, Dövlət Təhlükəsizliyi Xidmətinin arxivində ayrı-ayrı vaxtlarda Pedaqoji İnstituta rəhbərlik etmiş 6 nəfər (F.Rzabəyli, M.Bayramov, M.D.Rəsulzadə, M.Məmmədov, H.Musayev, P.Qasımov) direktorun şəxsi sənədləri ilə tanışlıq zamanı məlum oldu ki, onlara elan edilən ittihamlar əsasən eynidir: millətçi əks-inqilabi təşkilata üzv olmaq, silahlı üsyan yolu ilə Azərbaycanı SSRİ-dən ayırmaq, partiya və dövlət rəhbərlərinə qarşı terror həyata keçirmək, əks-inqilabi təbliğat aparmaq, mədəniyyət cəbhəsində, kənd təsərrüfatında və sənayedə ziyankarlıqla məşğul olmaq.

M.D.Rəsulzadə istintaqın ilk aylarında əks-inqilabi fəaliyyəti ilə bağlı verilən bütün sualların həqiqətəuyğun olmadığını bildirir. Lakin sonralar verilən işgəncələrə dözməyərək hər şeyi könüllü "boynuna alır". Etiraf etmək məcburiyyətində qalır ki, həqiqətən milli təşkilatın üzvü olub, onu bu işə Azərbaycan K(b)P MK mədəniyyət şöbəsinin müdiri Mikayıl Hüseynov *(Azərb.K(b)P MK partiya təbliğatı, təşviqatı və mətbuatı şöbəsinin müdiri-F.R.)* cəlb edib.




İttiham aktından məlum olur ki, Mirzə Davud Rəsulzadə sonuncu istintaqda əvvəllər dediklərini təkzib edib, günahkar olmadığını bildirib.

Məhkəmə onun sürgünə göndərilməsi haqqında qərar verib.Arxiv sənədlərindən məlum olur ki, Mirzə Davud Rəsulzadə (2964 №-li məhbus) 1943-cü ildə Xabarovsk diyarının Olski rayonunun Omçak qəsəbəsindəki həbs düşərgəsində ürək tutmasından vəfat edib.

***Mirzə Davud Məsim oğlu Rəsulzadə***

Azərbaycan Ali Məhkəməsinin Hərbi Kollegiyasının 3 oktyabr 1956-cı il tarixli qərarı ilə Mirzə Davud Rəsulzadəyə bəraət verilib. Ona bəraət verildikdən sonra Tbilisidə yaşayan həyat yoldaşı Yevgeni Aleksandrovna onlara dəymiş ziyanın (ev əşyaları tamamilə müsadirə olunmuşdu) ödənilməsi ilə bağlı iddia ərizəsi verib. Ərizəyə Azərbaycan SSR Ali Məhkəməsində baxıldıqdan sonra Gürcüstanda qızı Gülnarə ilə birlikdə yaşayan Yevgeni Aleksandrovnanın hesabına 3834 rubl. göndərilib. Onun həbsindən sonra rus millətindən olan həyat yoldaşı qızını götürərək Gürcüstana köçmüşdü. Davud Rəsulzadənin qızı Gülnarə Rəsulzadə - Kvançaxadze ömrünün sonuna (23 yanvar 2016-cı il) kimi Tbilisidə yaşayıb, tanınmış tibb işçisi olub, tibblə bağlı namizədlik və doktorluq dissertasiyaları müdafiə edib. Tbilisidə Azərbaycan diasporasının fəal üzvlərindən olub. Gülnarə xanım Azərbaycan mətbuatına verdiyi müsahibədə anasının (Yevgeni Aleksandrovna) xatirələrinə əsaslanaraq atasını olduqca mədəni, yüksək intellektli, geniş erudisiyalı, prinsipial, hündürboy, yaraşıqlı, gur saçlara, mehriban baxışlara və qəhvəyi gözlərə malik insan kimi səciyyələndirmişdir. Hətta o, atasının Azərbaycan Xalq Cümhuriyyətinin qurucularından olan Məmməd Əmin Rəsulzadənin nəslindən olması ilə bağlı fikir səsləndirmişdi. M.Ə.Rəsulzadənin nəvəsi əməkdar rəssam Rəis Rəsulzadə ilə söhbətimizdə bu fakt öz təsdiqini tapmadı.

## Ədəbiyyat


1. Azərbaycan Respublikası Prezidentinin İşlər İdarəsi Siyasi Sənədlər Arxivi. f.1., saxlama siyahısı 8, iş 4686 (Mirzə Davud Məsim oğlu Rəsulzadənin şəxsi işi)
2. Azərbaycan Respublikası Prezidentinin İşlər İdarəsi Siyasi Sənədlər Arxivi. f.1., saxlama siyahısı 8, iş 4687 (Mirzə Davud Məsim oğlu Rəsulzadənin şəxsi işi)
3. Azərbaycan Respublikası Prezidentinin İşlər İdarəsi Siyasi Sənədlər Arxivi. f.1,siy.19, saxlama vah.21 (Mirzə Davud Məsim oğlu Rəsulzadənin APİ-nin direktoru təyin edilməsi haqqında)
4. Azərbaycan Respublikası Təhsil İnstitunun Arxivi. Rəsulzadə Mirzə Davud Məsim oğlunun şəxsi işi
5. Azərbaycan Dövlət Pedaqoji Universitetinin Arxivi. f.1,siy.1, sax. vah.3, v.62
7. Гюльнара Расулзаде-Кванчахадзе. Надеюсь, что азербайджанские историки помогут мне доказать, что я родственница Мамед Эмина Расулзаде. http://vesti.az/news/118875
8. В Тбилиси скончалась родственница Мамеда Эмина Расулзаде. https://ru.oxu.az/society/113756s


***Mirzə Davud Məsim oğlu Rəsulzadə***



**HÜSEYN MƏMMƏD OĞLU MUSAYEV**
*(1889-1956)*

Hüseyn Məmməd oğlu Musayev 19 oktyabr 1889-cu ildə Şamaxı şəhərində anadan olub. Şamaxı şəhər məktəbini bitirib. Şəhərdə baş verən zəlzələ nəticəsində ailəsi ilə birlikdə şəhəri tərk etməli olub.

Fəlakətdən qaçan Hüseyn Musayev Quba şəhərinə gəlir və bir müddət Quba qəzasının ayrı-ayrı kəndlərində müəllimlik edir. 1905-1910 -cu illərdə Şamaxıda fəaliyyət göstərən maarif cəmiyyətinin üzvlərindən biri kimi xeyriyyə tədbirlərində fəal iştirak edir. 1911-1918-ci illərdə Quba qəzasının (indiki Qusar rayonu) Uqur, Xəzri məktəblərində müdir və müəllim işləyir. 1918-1921-ci illərdə Qusar rayonunun ibtidai məktəblərində müəllimlik edir.

Hüseyn Musayev 1921-1924-cü illərdə Quba qəza xalq maarif şöbəsinin müdiri olub. 1921-ci ildə Quba qəzasının nümayəndə heyətinin tərkibində Moskvada - Xalq Komissarları Sovetinin sədri V.İ.Leninlə görüşdə olub.

1924-cü ildə Bakıya gələn Hüseyn Musayev Azərbaycan Xalq Maarif Komissarlığının sosial tərbiyə idarəsinin müdiri təyin olunur. 1926-cı ilə kimi həmin vəzifədə çalışır, I və II dərəcəli məktəblər üçün ayrı-ayrı fənlərdən dərsliklərin, metodik vəsaitlərin hazırlanmasında, nümunəvi dərslərin təşkilində yaxından iştirak edir. Tat uşaqları üçün ilk əlifba kitabını hazırlayır.

AK(b)P-nin Naxçıvan Partiya Komitəsinin 28 oktyabr 1926-cı ildə keçirilən Plenumunda (protokol 4) Naxçıvan Xalq Komissarları Sovetinin sədri Həmid Sultanovun yerinə Hüseyn Məmməd oğlu Musayev təyin olunur. Həmin iclasda Naxçıvan Partiya Komitəsinin katibi Şahbazovun da yerinə Həsən Səfərov təyin edilir. Hüseyn Musayev Plenumda həm də Naxçıvan

Partiya Komitəsinin Rəyasət heyətinə üzv seçilir. Həmin vəzifədə o, 10 mart 1928-ci ilə kimi çalışır. Orada çalışarkən Azərbaycanı Tədqiq və Tətəbbö Cəmiyyətinin Naxçıvan şöbəsinin üzvü seçilir, Naxçıvan Respublikasının maddi mədəniyyət abidələrinin, etnoqrafiyasının, tarix və ədəbiyyatının, iqtisadiyyat və təbiətinin öyrənilməsində iştirak edir.

Hüseyn Musayev 1926-cı ildə Bakıda keçirilən I Türkoloji qurultayın işində Naxçıvan MİK-in təmsilçisi kimi iştirak edib.

Hüseyn Musayev Azərbaycan Xalq Maarif Komissarlığında Siyasi Maarif Baş İdarəsinin (1928-1930) və Maarif işçiləri Mərkəzi İdarəsinin sədri (1930-1931) olub.

1930-cu ildə Bakıda Xalq Komissarları Sovetinin və Azərbaycan Elmi Tədqiqat İnstitutunun dəstəyi ilə dil, ədəbiyyat, tarix, arxeologiya, etnoqrafiya, diyarşünaslıq və kadr hazırlığı ilə bağlı Azərbaycan - Dağıstan əlaqələrinə həsr olunmuş görüş keçirir. Həmin görüşdə Azərbaycan tərəfindən A.P.Zifeld-Simumyaqi, B.Çobanzadə, V.Xuluflu ilə birlikdə də Hüseyn Musayev də iştirak edir.

Hüseyn Musayev 1931-1932-ci illərdə Azərbaycan Respublikasının Dövlət Plan Komitəsinin sədri olub. 1932-1934-cü illərdə Azərbaycan Kənd Təsərrüfatı İnstitutunun direktoru vəzifəsində çalışıb. 1934-1936-cı illərdə Kənd Təsərrüfatı Komissarlığında kadr hazırlığı şöbəsinə rəhbərlik edib.

Azərbaycanda ictimai-siyasi vəziyyətin kəskinləşdiyi, repressiyanın tüğyan etdiyi ildə 1937-ci ildə V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutuna direktor təyin edilib. 10 aya yaxın bir müddətdə instituta rəhbərlik edib. O, instituta direktor təyin edilən dövrdə burada milli kadrlara qarşı fiziki və mənəvi repressiya həyata keçirilirdi. Tanınmış rus və Azərbaycan alimləri vəzifələrindən uzaqlaşdırılır, onların yerinə maneəsiz olaraq ermənilər yerləşdirilirdi.

SSRİ tarixi kafedrasına rəhbərlik etmək elmi dərəcəsi və elmi adı olmayan M.Q.Əsriyana həvalə edilmişdi. Siyasi iqtisad kafedrasına T.A.Petrosyan, İngilis dili kafedrasına T.O.Akopova, İqtisadi coğrafiya kafedrasına T.A.Koçaryan, Marksizm-lenininzm kafedrasına Q.A.Simonyan, pedaqogika və psixologiya kafedrasına N.Asatur rəhbərlik edirdi. İnstitut partiya komitəsinin katibi erməni idi. Nəzərə alsaq ki, 30-cu illərdə istənilən bir müəssisənin partiya komitəsinin katibinin səlahiyyəti, həmin müəssisənin direktorunun səlahiyyətindən yüksək idi, onda baş verənlərin mahiyyəti aydın olar. Bu acınacaqlı vəziyyət müharibə illərində daha dözülməz hal almışdı.ADPİ-nin partiya komitəsinin 11 nəfər üzvündən 5 nəfəri erməni, 4 nəfəri azərbaycanlı, 2 nəfəri rus idi. (1941-ci ildə hərbi səfərbərliklə bağlı cəmi 5 nəfər büro üzvü qalmışdı ki, ondan da 3 nəfəri erməni (Nəsir Asatur həm də partiya

komitəsinin katibi vəzifəsini icra edirdi), 1 nəfəri azərbaycanlı və bir nəfəri rus idi). Həmkarlar təşkilatının sədri erməni T.Simonyan idi. Komsomol komitəsinin katibi erməni Osipov idi. Xalq Təsərrüfatı İnstitutunu bitirən Osipovun Pedaqoji İnstitutla heç bir əlaqəsi yox idi. Elmi Şuranın katibi Kazançan və kitabxananın direktoru Mirzoyan erməni idi. Kitabxananın 18 nəfər əməkdaşından 13 nəfəri erməni, 2 nəfəri azərbaycanlı, 3 nəfəri başqa millətin nümayəndələri idi. Tarix fakültəsinin dekanı (Petrosyan), dekan müavini (Petrosov), yataqxananın komendantı (Sarkisov) erməni idi. Arxiv sənədlərindən məlum olur ki, Ələsgərov soyadlı azərbaycanlını yataqxananın komendantlığından azad edərək onun yerinə bu sahədə heç bir təcrübəsi olmayan ermənini təyin etmişdilər. Ayrı-ayrı kafedralarda xeyli erməni özlərinə isti yuva taparaq siyasi ambisiyalarını gerçəkləşdirməyə can atırdılar. ADPİ-də təhsil alan erməni tələbələrinin sayı azərbaycanlı tələbələrin sayından çox idi.

Rayon, şəhər, respublika partiya komitələrində yüksək mənsəb sahibləri olan ermənilərin hesabına ADPİ-yə tələbə qəbulu müəyyənləşdirilərkən ermənilərə daha çox yer ayrılırdı. Belə bir mühitdə işləmək Hüseyn Musayev üçün olduqca çətin idi.

Hüseyn Musayevlə bağlı sənədləri araşdırarkən məni təəccübləndirən məsələ onun ali təhsil almadan yüksək vəzifələrdə işləməsi idi. Sənədlərinin arasında ali təhsil almasını təsdiq edən attestat və ya şəhadətnamə yox idi. DTX-nin Arxivində onunla bağlı istintaq sənədlərindən məlum oldu ki, Hüseyn Musayev Tiflis Aleksandrovski Müəllimlər İnstitutunda ekstern yolu ilə imtahan verərək tarix və coğrafiya müəllimi adı alıb. O, ADPİ-nin direktoru vəzifəsində işləyərkən ermənilərin danosu əsasında həbs olunub. Onunla birlikdə ADPİ-nin partiya təşkilat katibi Vladimir Gerasimoviç Budaqov da işdən azad olunub. İnstitutda beynəlmiləlçilik işinin düzgün qurulmaması, direktorun və partiya təşkilat katibinin müəllim kadrları hazırlığında ziyankarlıqla məşğul olması məsələsi həm ADPİ-nin ilk partiya təşkilatında, 29 sentyabr 1937-ci ildə isə Bakı şəhər partiya komitəsində müzakirə olunub. Hüseyn Musayev ikiüzlülükdə, əksinqilabi fəaliyyətdə ittiham olunaraq 1920-ci ildən üzvü olduğu partiyadan xaric edilmiş, V.G.Budaqova isə partiya töhməti verilmişdir.

Anna Musayeva ilə ailəli olan Hüseyn Musayev 1937-ci ildə həbs ediləndə oğlu Aleksandrın 14, kiçik oğlu Teymurun 12 yaşı var idi.

1939-cu il fevralın 20-də Hüseyn Məmməd oğlu Musayevin işi üzrə istintaqın başa çatması haqqında İttihamnamə aktı tərtib olunub. Həmin akt Azərbaycan SSR xalq daxili işlər komissarının müavini Kərimov tərəfindən təsdiq edilib.

***Hüseyn Məmməd oğlu Musayev***

İttihamnamə aktında (6338№-li) bildirilir: Hüseyn Məmməd oğlu Musayev 1935-ci ildə yaradılan və silahlı yolla Azərbaycanı SSRİ-dən ayırmağa çalışan əks-inqilabi təşkilatın üzvü olmaqda, millətçilikdə, casusluqda, partiya və hökumət rəhbərlərinə qarşı terror hazırlamaqda, ADPİ üçün müəllim kadrlarının hazırlanması işində də ziyankarlıq mövqeyindən fəaliyyət göstərməkdə günahkar bilinərək Azərbaycan SSR CM-nin 21/64, 69, 21/70 və 73-cü maddələri üzrə ittiham olundu, ondan ötrü ki:

1.Əksinqilabi millətçi təşkilatın üzvü olmuşdur.

2.Qarşısına silahlı üsyan yolu ilə Azərbaycanı SSRİ-dən ayırmağı, ÜİK(b)P və sovet hökumət rəhbərlərinə qarşı terror hazırlamağı, xalq təsərrüfatına ziyan vurmağı məqsəd qoyan əks-inqilabi millətçi təşkilatın bütün göstərişləri ilə həmrəy olmuş, həmin fikirləri bölüşmüşdür.

3.Azərbaycan Kənd Təsərrüfatı İnstitutuna ziyankarlıqla nəticələnən rəhbərlik etmişdir.

İstintaq materiallarındakı şahid ifadələrindən məlum olur ki, Hüseyn Musayev 1932-1934-cü illərdə Azərbaycan Kənd Təsərrüfatı İnstitutunun direktoru olarkən “ziyankarlıqla” məşğul olub, kollektivdə səfərbəredici ruh yaratmayıb, “İttihad” partiyasının üzvü olduğundan onun ideyalarını təbliğ edib. Arxiv sənədləri içərisində həmin illərə aid xeyli şahid ifadələri var. Bunların hamısı Hüseyn Musayevin fəaliyyətinə kölgə salmaq, onu həbs etmək planlarının tərkib hissəsi idi.

İstintaq materiallarından aydın olur ki, məhbus H.Musayev ona ünvanlanan bütün ittihamları rədd etmiş, heç birini qəbul etməmişdir. Bütün repressiya olunan ziyalılar, partiya və dövlət xadimləri kimi “Boynuna alırsanmı”-sualına: "Xeyr! Boynuma almalı heç bir şey yoxdur"- kimi cavab verir. "Üçüncü üsul" işə düşür... İstintaqın vaxtı uzadılır, sorğu-suallar davam edir: eyni sual, eyni hədə, eyni şahid sözləri onu “hər şeyi boynuna almağı vadar edir”. Amma sonuncu istintaq günü - 27 yanvar 1939-cu ildə əks-inqilabçı təşkilatın üzvü olması ilə bağlı dediklərini təkzib edir, verdiyi ifadələri təsdiq etmir. Ona görə də H.Musayevlə bağlı İttihamnamə aktı baxılması üçün SSRİ Xalq Daxili İşlər Komissarlığına göndərilir. 6 mart 1942-ci ildə ona verilən arayışda bildirilir ki, o, 5 il müddətinə (16 sentyabr 1937-ci ildən 16 sentyabr 1942-ci ilə kimi) həbs olunub.

1920-ci ildən bolşevik partiyasının üzvü olan, “Şərəf nişanı” ordeni və medallarla təltif edilən Hüseyn Musayevun Moskvaya günahsız həbs edilməsi ilə bağlı 27 yanvar 1939-cu ildə “Partiyanın və xalqın dahi rəhbəri Stalinə” yazdığı məktub, nəhayət ki, onun köməyinə çatdı. “Xalqlar atası” İ.V.Stalinin göstərişi ilə o, həbsdən azad edildi.

***Hüseyn Məmməd oğlu Musayev***

Bəraət alaraq Bakıya gələn Hüseyn Musayev 1943-1947-ci illərdə Xalq Maarif Komissarlığının evlər idarəsinin rəisi, 1947-1954-cü illərdə Zağulba uşaq sümük-vərəm sanatoriyasının direktoru vəzifəsində çalışıb.

1 mart 1944-cü ildə SSRİ Xalq Daxili İşlər Komissarlığı tərəfindən məhkumluğu üstündən götürülüb.

18 noyabr 1955-ci ildə SSRİ Ali Məhkəməsi Hərbi Kollegiyasının qərarına görə Hüseyn Məmməd oğlu Musayevin işi ilə əlaqədar SSRİ Ali Məhkəməsi Hərbi Kollegiyasının 1937-ci ildə çıxardığı hökm cinayət tərkibi olmadığına görə ləğv edilmiş və ona bəraət verilmişdir.

Təəssüf ki, millətin maariflənməsi işində yorulmadan mübarizə aparan, əzablı sürgün həyatı yaşayan Hüseyn Məmməd oğlu Musayev həmin günü görə bilmədi. O, 15 iyun 1956-cı ildə ağır sürən xəstəlikdən sonra vəfat etdi.

## Ədəbiyyat

1. Azərbaycan Respublikası Prezidentinin İşlər İdarəsi Siyasi Sənədlər Arxivi. f.1., saxlama siyahısı 8, iş 4065 (Hüseyn Məmməd oğlu Musayevin şəxsi işi).
2. Azərbaycan Respublikası Prezidentinin İşlər İdarəsi Siyasi Sənədlər Arxivi. f.1., siyahı 26, sax. vah.713
3. Dövlət Təhlükəsizlik Xidmətinin Arxivi. Hüseyn Məmməd oğlu Musayevin şəxsi işi.
4. Azərbaycan Respublikası Təhsil Nazirliyinin Xalq Təhsili Muzeyi. (Hüseyn Məmməd oğlu Musayevin şəxsi işi).
5. Керимова Тамилла. Из истории Национальной Академии Наук Азербайджана. Баку, 2005, 568 с



**AQİL QASIM OĞLU SALAYEV**
*(1900-1973)*

Aqil Qasım oğlu Salayev 1900-cü ilin mart ayının 10-da Lənkəran qəzasının Olxovka[36] kəndində anadan olub. Valideynləri kənd təsərrüfatı və balıqçılıqla məşğul olub. İlk təhsilini mollaxanada alan Aqil Salayev erkən yaşlarından əmək fəaliyyətinə başlayıb. 1922-ci ilə qədər kənddə təsərrüfat işləri ilə məşğul olub. 1922-1928-ci illərdə hərbi xidmətdə olub, sıravi əsgərdən rotanın siyasi rəhbəri vəzifəsinədək yüksəlib. Hərbi qulluq illərində o, Zaqafqaziya hərbi hazırlıq məktəbində təhsil alıb. Zaqafqaziya hərbi hazırlıq məktəbinin rəhbərliyinin 1926-cı ildə ona verdiyi xasiyyətnamədə göstərilir ki, *"Salayev Aqil enerjili, fəal, səliqəli gəncdir, üzərinə düşən vəzifəni dəqiq və layiqincə yerinə yetirir, yaxşı təşkilatçıdır, gənclərdən ibarət maarif dərnəyinə rəhbərlik edir. Məktəbdə pioner-komsomol işinin təşkilatçısıdır"*.

O, Zaqafqaziya hərbi hazırlıq məktəbində oxuyarkən Azərbaycan Kommunist Partiyasının və Azərbaycan Lenin Komsomol Gənclər İttifaqının məktəb üzrə özəyinin katibi olmuş, siyasi fəallığı ilə fərqlənmişdir. 1920-ci ildən Ümumittifaq Kommunist Firqəsinin (Ümumittifaq Kommunist Bolşeviklər Partiyasının) üzvü olması onun təhsil almasına böyük imkanlar

---

[36] *Keçmiş adı Gomuşavan olmuşdur. Yerli əhali arasında kəndin adı indi də belə adlandırılır. XIX əsrə aid mənbələrdə Gomuşavan haqqında məlumat verilir. Keçmişdə kəndin ərazisi geniş sucaqlıq və qamışlıq olduğundan burada çoxlu camış saxlanılırdı. Odur ki, kəndin adı da "camış saxlanılan yer" mənasında olan bu adla adlandırılmışdı. XIX əsrin ikinci yarısında Suxumidən gəlmiş Novo Afon monastırının keşişləri yaşayış məntəqəsinə Olxovka adı verdilər. Olxov bu ərazidə bitən qızılı rəngli cil bitkisinin bir növünün adıdır. İcarədar keşişlər quru balığı istehsal etmək üçün həmin bitkini yığıb yandırırdılar. 1992-ci ildə Olxovka adı ləğv edilərək Göyşaban kimi rəsmiləşdirildi. 1933-cü ildə oykonim Gomşavan variantında qeydə alınmışdır.*

***Aqil Qasım oğlu Salayev***

yaratmışdı. Təhsil almağa böyük həvəsini və marağını nəzərə alan məktəb rəhbərliyi onu 1926-cı ildə həmin məktəbin nəzdindəki siyasi kursa oxumağa göndərib.

1928-ci ildə hərbi xidmətini başa vurub təhsil almaq məqsədilə Bakıya gələn Aqil Salayev burada işçi fakültəsində oxuyur. Hərbi xidmətdə siyasi rəhbər işləməsi ona əhali arasında siyasi-maarif işinin təbliğində kömək edir. Mühazirəçi-müəllim kimi fəaliyyət göstərir, siyasi yetkinliyi və məsuliyyəti ilə seçilir. Ali təhsil almaq arzusunda olan Aqil Salayev 1929-cu ildə ərizə ilə Bakı işçi fakültəsinin rəhbərliyinə müraciət edir. O, ərizəsində yazırdı: *"Bununla yazıb Sizə məlum edirəm ki, mən oxumağı davam etdirmək istəyirəm. Rica edirəm məni, Azərbaycan Dövlət Darülfünunun Pedaqoji fakültəsinin fizika-riyaziyyat şöbəsinə göndərəsiniz".*

Qeyd edək ki, 1926-1927-ci tədris ilində Azərbaycan Pedaqoji İnstitutu ləğv edilərək Azərbaycan Dövlət Universitetinin tərkibinə verilmişdi. Ümumtəhsil məktəbləri üçün müəllim kadrları Universitetin Pedaqoji fakültəsində hazırlanırdı. Ali məktəbdə oxumaq üçün hər hansı bir təşkilat göndəriş verməli idi. Aqil Salayev Bakı işçi fakültəsinin verdiyi göndəriş əsasında Universitetə qəbul olunur. Lakin axıra qədər orada oxuya bilmir, təhsilini Azərbaycan Pedaqoji İnstitutunda davam etdirməli olur. Belə ki, 1930-cu ildə Azərbaycan Dövlət Universitetinin Pedaqoji fakültəsinin bazasında Azərbaycan Pedaqoji İnstitutu yenidən təşkil olunur. Azərbaycan Dövlət Universiteti ləğv edilir. Aqil Salayevin sonrakı həyatı və pedaqoji fəaliyyəti Azərbaycan Dövlət Pedaqoji İnstitutu (indiki ADPU) ilə bağlı olur. 1932-ci ildə institutun Fizika-riyaziyyat fakültəsini, 1935-ci ildə isə aspiranturasını bitirir, ömrünün sonuna kimi gələcək fizika və riyaziyyat müəllimlərinin təhsil-tərbiyəsi ilə məşğul olur.

O, 1935-1937-ci illərdə ADPİ-nin Fizika-riyaziyyat fakültəsinin dekan müavini, 1937-1939-cu illərdə direktoru (rektoru), 1939-1942-ci illərdə Fizika-riyaziyyat fakültəsinin dekanı vəzifələrində işləmişdir. ADPİ-nin direktoru olarkən Azərbaycan Xalq Maarif Komissarının müavini Allahverdiyevin 2443/73 saylı 15 oktyabr 1937-ci il tarixli əmri ilə Aqil Salayev həm də Azərbaycan Dövlət Pedaqoji İnstitutunun nəzdində fəaliyyət göstərən Azərbaycan Elmi-Tədqiqat Pedaqogika İnstitutunun müvəqqəti direktoru təyin edilmişdi. O, həmin vəzifəni 1939-cu ilə qədər icra etmişdir. Onun direktor (rektor) vəzifəsindən azad edilməsi ermənilərin tələbi ilə baş tutur. Belə ki, institutda bir erməni tələbə azərbaycanlı tələbə yoldaşı ilə mübahisə edir, sonra bu narazılıq ciddi dava-dalaşa səbəb olur. Erməni tələbə şikayət edir. Həmin dövrdə ADPİ-də müxtəlif vəzifələrdə xeyli erməni işləyirdi. Heç bir pedaqoji səriştəsi, təcrübəsi və elmi dərəcəsi olmayan M.Q.Əsriyan SSRİ

tarixi kafedrasına, T.A.Petrosyan Siyasi iqtisad kafedrasına, T.O.Akopova İngilis dili kafedrasına, T.A.Kocaryan İqtisadi coğrafiya kafedrasına, Q.A.Simonyan Marksizm-leninizm kafedrasına, N.Asatur Pedaqogika və psixologiya kafedrasına rəhbərlik edirdi. Siyasi ambisiyalarını gizlətməyən xeyli erməni müəllimlər digər kafedralarda kök salmışdı. Hətta institut patiya komitəsinin katibi milliyətcə erməni idi. Belə bir mühitdə işləmək Aqil Salayev üçün asan olmadı. İki tələbə arasında yaranan münaqişə Aqil Salayevin işdən azad olunmasına səbəb oldu.

Ali pedaqoji təhsilin təşkilində, yüksəkixtisaslı müəllim kadrlarının hazırlanmasında, pedaqoji-psixoloji tədqiqatların planlaşdırılmasında mühüm xidmətləri olan Aqil Salayev 1942-ci ildə Bakının Oktyabr (indiki Yasamal) Rayon Xalq Maarif Şöbəsinə müdir təyin olunur. İki il sonra karyerasında mühüm dəyişiklik baş verir, Bakı şəhər xalq maarif şöbəsinin müdiri vəzifəsinə irəli çəkilir. Üç ildən sonra yenidən doğma instituta qayıdır. 1947-ci ildən 1965-ci ilə kimi ADPİ-nin Cəbr, həndəsə və astronomiya kafedrasınnda baş müəllim işləyir. 1965-ci ildə təqaüdə çıxsa da sevimli kollektivindən ayrılmır, ömrünün sonuna qədər onlarla əlaqə saxlayır. O dövrdə həmin kafedraya dos. Bəhram Yusifzadə rəhbərlik edirdi.

Aqil Salayevin yaradıcılığı, əsasən, proektiv həndəsə ilə bağlı olmuşdur. Bu sahədə apardığı araşdırmalar uğurlu olsa da, dissertasiya müdafiəsindən sonra onun haqqında Moskvaya - SSRİ Ali Attestasiya Komissiyasına yazılan məktublar (əmilərinin xalq düşməni kimi həbs edilməsi ilə bağlı) iddiasında olduğu elmi dərəcəni almağa mane olmuşdur. Ona qarşı edilən haqsızlıqlara baxmayaraq o, pedaqoji fəaliyyəti ilə yanaşı, elmi yaradıcılığını da davam etdirmiş, Fizika və riyaziyyat fakültəsinin tələbələri üçün həndəsəyə aid hazırlanan proqram və dərsliklərin ya müəllifi, ya tərcüməçisi, ya da elmi redaktoru olmuşdur. D.İ.Perepelkinin "Proektiv və tərsimi həndəsə" (1951), "Həndəsənin əsasları" (1952; 1958) kursunun proqramı və dərslikləri Aqil Salayev tərəfindən doğma dilimizə tərcümə edilmişdir. "Analitik həndəsə" (1951) və "Elementar riyaziyyat"ın xüsusi kursu (1955) üzrə proqramlar, D.A.Raykovun "Proektiv və tərsimi həndəsə" (1958;1961), S.Axundovun "Proyektiv və tərsimi həndəsədən yoxlama tapşırığı və ona aid metodiki göstərişlər" (1961), H.Məmmədovun "Sferik həndəsə və triqonometriyadan mühazirələr" (1968), qiyabiçilər üçün nəzərdə tutulan S.N.Sadıqovun "Səkkizillik məktəbin VI-VIII siniflərində həndəsədən isbata aid məsələlərin həllinə dair metodik vəsait" (1963) onun elmi redaktorluğu ilə nəşr olunmuşdur. Bu kitablar respublikada riyaziyyatçı müəllim kadrlarının hazırlığında mühüm rol oynamışdır.

***Aqil Qasım oğlu Salayev***

Aqil Salayevin elmi dərəcəsi və elmi adı olmasa da Azərbaycan riyaziyyatçıları arasında xüsusi hörməti və nüfuzu olmuşdur. Elə bunun nəticəsidir ki, Azərb.EA-nın həqiqi üzvü Əşrəf Hüseynov və Azərb.EA-nın həqiqi üzvü Maqsud Cavadov 1962-ci ildə nəşr etdirdikləri "Sovet Azərbaycanında riyaziyyat elminin inkişafı (1920-1960-cı illər)" monoqrafiyasında Aqil Salayevin yaradıcılığına xüsusi diqqət yetirir, riyaziyyatın tədrisi metodikasının ümumi məsələlərindən bəhs edərkən onun "Riyaziyyatdan qəbul imtahanlarının yekunları" ("Azərbaycan məktəbi", 1955, № 12, s. 41-47), həndəsə və triqonometriyanın tədrisi metodikasından bəhs edərkən "Parçaların ölçülməsi" ("Azərbaycan məktəbi", 1951, № 8, s. 57-66) məqalələrini geniş təhlil edirlər. Həndəsi kəmiyyətlərin ölçülməsi məsələsinin orta məktəb kursundakı yeri və əhəmiyyəti, parçaların ölçülməsi ilə bağlı onun fikirlərini yüksək qiymətləndirirlər.



*Aqil Salayev ailə üzvləri ilə*

Aqil Salayev vətənə və xalqa şərəflə xidmət etdiyinə, səmərəli pedaqoji fəaliyyət göstərdiyinə görə bir sıra orden və medallarla, fəxri fərmanlarla təltif olumuşdur. O, gözəl və səmimi ailə başçısı olmuş, beş övlad tərbiyə etmişdir. Oğlu Azər ictimai-məişət sahəsində, Arif "Bakı fəhləsi" (rus

dilində) qəzetində məsul katib, qızları Fəridə, Sevil, Zenfira ayrı-ayrı təhsil müəssisələrində müəllim işləmişdir. 1966-cı və 1967-ci illərin avqust aylarında Lənkəranda istirahətdə olarkən onun Bakıya, qızı Zenfiraya yazdığı məktubları həyəcansız oxumaq mümkün deyil. İncə və səliqəli xətlə yazılmış o məktubların hər bir sətrində ürəyi övlad məhəbbəti ilə döyünən, yurdsevər, qohumcanlı, sadə, səmimi, xeyirxah atanın ürək döyüntüləri hiss olunur. 1973-cü ilin aprel ayının 10-da Aqil Salayevin döyünən ürəyi həmişəlik dayandı. Onun vəfatı ilə bağlı verilən nekroloqda deyilirdi:"İşgüzar, yaxşı yoldaş, bacarıqlı müəllim və qayğıkeş insan olan Aqil Salayevin əziz xatirəsi onu tanıyanların qəlbində həmişə yaşayacaqdır".

**Ədəbiyyat**

1. Azərbaycan Dövlət Pedaqoji Universitetinin Arxivi. Aqil Qasım oğlu Salayevin şəxsi işi
2. Azərbaycan Respublikası Təhsil İnstitutunun arxivi. Aqil Qasım oğlu Salayevin şəxsi işi
3. Aqil Qasım oğlu Salayev. Nekroloq. "Gənc müəllim" qəzeti, 10 aprel 1973-cü il

***Aqil Qasım oğlu Salayev***



## CAMAL ƏHMƏD OĞLU ƏLİYEV
*(1902- 1982)*

Camal Əhməd oğlu Əliyev 1902-ci ildə Gəncə qəzasının Mollavəlǝdli (indiki Goranboy rayonunun Şəfəq kəndi) kəndində anadan olub. Atası beş yaşında vəfat etdiyindən 2 il (1905-1907) əmisinin, 3 il (1907-1910) digər qohumunun himayəsində yaşayıb. 1911-ci ildə böyük qardaşı onu öz yanına, Zabrata gətirir. Burada o, 3 illik şəhər rus məktəbində təhsil alır. 1914-1916-cı illərdə Sabuncuda 4-cü şəhər ikiillik məktəbin 3-cü sinfində təhsilini davam etdirir. Maddi çətinlik ucbatından təhsilini tamamlaya bilmir. 1916-1917-ci illərdə Zabratdakı qazanxanada telefonçu köməkçisi işləyir.

İctimai-siyasi vəziyyətin dəyişməsi, fəhlələrin ara verməyən tətilləri onu və qardaşını kəndə qayıtmağa məcbur edir. 1917-1924-cü illərdə kənddə təsərrüfatla məşğul olur. Fəallığı ilə seçilən C.Əliyev 1921-ci ildə kənddə yaşayarkən komsomol sıralarına daxil olur. 1923-1924-cü illərdə kənddəki komsomol özəyinə rəhbərlik edir. 1924-cü ildə Qırmızı Ordu sıralarına hərbi xidmətə çağırılır. Azərbaycan diviziyasının I polkunda xidmətə başlayır. 1924-1926-cı illərdə Azərbaycan diviziyasının I polkunda ştatdankənar müəllim işləməklə yanaşı, əsgərlərə siyasi dərs verir, polkun partiya kollektivinin texniki katibi olur. Həmin ildə o, Kommunist Partiyası sıralarına daxil olur. 1926- 1927-ci illərdə polkda ştatlı müəllim kimi fəaliyyət göstərir, siyasi maarif kabinetinə rəhbərlik edir, 1-ci potanın siyasi rəhbəri (ştatdankənar) olur. 1925-1927-ci illərdə hərbi xidmətdə ola-ola Bakı Xalq Maarif Şöbəsinin nəzdindəki ikiillik fəhlə fakültəsinin pedaqoji bölməsinin axşam şöbəsində təhsil alır. 1927-ci ildə Zaqafqaziya Qırmızı Ordu Siyasi İdarəsinin göndərişi ilə oxumağa göndərilir.

***Camal Əhməd oğlu Əliyev***

1927-1931-ci illərdə Zaqafqaziya Kommunist Universitetində təhsil alır. Universiteti uğurla başa vuran Camal Əliyev elmi tədqiqatla məşğul olmaq qərarına gəlir və 1931-1933-cü illərdə Zaqafqaziya Kommunist Universitetinin fəlsəfə şöbəsinin aspiranturasında oxuyur. 1928-1931-ci illərdə Tbilisi şəhərindəki Azərbaycan pedaqoji texnikumunda leninizm kursundan dərs deyir. Gürcüstan azərbaycanlıların mədəni həyatında mühüm rol oynayan Nəriman Nərimanovun adını daşıyan həmin texnikum 1925-ci ildə təşkil edilmişdir.

Camal Əliyev 1931-1932-ci illərdə Gürcüstan Kommunist Universitetinin Azərbaycan şöbəsində, Zaqafqaziya partiya fəallarının və kolxozçuların kurslarında dərs deyir. 1933-cü ildə Zaqafqaziya Kommunist Universitetinin yenidən təşkili ilə əlaqədar olaraq ÜİP(b)P-nin Zaqafqaziya komitəsi tərəfindən Kirovabad (Gəncə) Kənd Təsərrüfatı İnstitutuna müəllim göndərilir. 1933-1934-cü illərdə həmin institutda o, leninizmdən, dialektik materializmdən dərs deyir, iqtisadiyyat fakültəsinə rəhbərlik edir.

Camal Əliyev 1934-cü ildə yenidən Tiflisə - Zaqafqaziya Ali Kommunist Kənd Təsərrüfatı Məktəbinə müəllim dəvət olunur. Həmin illərdə o, həm də Zaqafqaziya Rabitə Mühəndisliyi İnstitutunda dialektik materializm fənnini tədris edir. 1935-ci ildə "Marks və Leninin materialist nəzriyyəsi" adlı dissertasiya işi üzərində işləmək məqsədilə 3 aylıq Moskvaya - ÜİK(b)P MK yanında Təkmilləşdirmə İstitutuna elmi ezamiyyətə göndərilir.

1936-cı ildə ÜİK(b)P MK tərəfindən Azərbaycan K(b)P MK-nın sərəncamına göndərilir. Partiya fəalları respublika kursunun (1936-1937), təbliğatçılar kursunun (1937) müdiri, Marksizm-Leninizm İnstitunun direktoru və ÜİK(b)P tarixi və leninizm kafedrasının müdiri (1937), Bakıda yerləşən Azərbaycan Ali Kommunist Kənd Təsərrüfatı İnstitutunda müəllim və tədris hissə müdiri (1936-1938) işləyir.

ÜİK(b)P MK 14 noyabr 1938-ci ildə "ÜİK(b)P tarixinin qısa kursu"nun nəşri ilə əlaqədar olaraq daimi partiya təbliğatı qrupunun yaradılması haqqında qərar qəbul etdi. Həmin qərara uyğun olaraq Azərbaycanda da təbliğat qrupu yaradıldı. Azərbaycan KP MK-nın 28 dekabr 1938-ci il tarixli qərarı ilə Camal Əliyev Azərbaycan KP MK-nın təbliğat və təşviqat şöbəsinə mühazirəçi təyin olundu. Bir il sonra - Azərbaycan KP MK-nın 25 noyabr 1939-cu il tarixli iclasında Azərbaycan Pedaqoji İnstitutunda beynəlmiləl tərbiyənin vəziyyəti müzakirə olundu. İnstitutda azərbaycanlı tələbənin münaqişə nəticəsində erməni tələbəni döyməsi beynəlmiləlçiliyə əməl edilməməsi kimi dəyərləndirilir və bunun da nəticəsində institutun rəhbərliyi dəyişdirilir. İctimai-siyasi mövqeyi ilə seçilən Camal Əliyev instituta yeni direktor təyin edilir. O, bu vəzifədə 14 mart 1940-cı ilə kimi işləyir.

***Camal Əhməd oğlu Əliyev***

Onun instituta rəhbərliyi dövründə tədrisin təşkilində və strukturun təkmilləşdirilməsində müəyyən işlər görüldü. Belə ki, ədəbiyyat şöbəsi müstəqil fakültəyə çevrildi. 4 yeni kafedra təşkil olundu. 1937-1938-ci ildə 27 kafedra olduğu halda 1939-1940-cı illərdə kafedraların sayı 31 oldu. Camal Əliyevin rəhbərliyi ilə institutda yeni bir elmi ənənənin əsası qoyuldu. 1940-cı ilin yanvar ayının 26-dan fevralın 2-nə kimi respublika ali məktəbləri tarixində ilk dəfə olaraq ADPİ əməkdaşlarının elm-tədqiqat işlərinin yekunlarına həsr olunmuş elmi sessiya keçirildi. Elmi sessiyada 23 əməkdaşın elmi məruzəsi dinlənildi. Camal Əliyev müxtəlif ictimai-siyasi təşkilatların işində fəal iştirak edib, Bakı şəhər sovetinin deputatı olub. Pedaqoji işdən ayrıldıqdan sonra təqaüdə çıxana kimi Bakı şəhər Partiya Komitəsində ideoloji şöbədə çalışıb.Camal Əliyev 12 sentyabr 1982-ci ildə Bakıda vəfat edib.



*Böyükxanım Mursaqulova*

Onun həyat yoldaşı Böyükxanım Mursaqulova 1909-cu ildə anadan olub. Zaqafqaziya Kommunist Universitetini və Leninqraq Kooperativ İnstitutunu bitirib. Gürcüstan azərbaycanlılarının yaşadığı bölgələrdə müəllim işləyib. Gürcüstan K(b)P MK-da qadın şöbəsinin müdiri olub. Onun ilk şagirdlərindən biri böyük müğənnimiz Rəşid Behbudov olub.

Camal Əliyevin 3 oğul və 1 qız övladı olub. Ortancıl oğlunun adını ölməz müğənnimiz Rəşid Behbudovun şərəfinə Rəşid qoyub. Camal Əliyevin ailəsi o zaman Azərbaycan Dövlət Konservatoriyasının tələbəsi Fikrət Əmirovla bir binada yaşayırmış. Rəşidin musiqiyə olan həvəsini görən Fikrət Əmirov Camal müəllimə məsləhət görür ki, balaca Rəşidi musiqi məktəbinə qoysun. Camal Əliyevin bacanağı Cavad bəy Cuvarlı balaca Rəşidin mahnı oxumasından xoşu gəlir və onu Zaqafqaziya Müəllimlər Seminariyasında bir yerdə oxuduğu böyük Azərbaycan bəstəkarı Ü.Hacıbəyovun yanına aparır ki, onun musiqi duyumunu, musiqi yaddaşını və ritm qabiliyyətini yoxlasın. Onda Cavad bəy Cuvarlı V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutunda rus dili fənnini tədris edirdi.

Üzeyir bəy balaca Rəşidin oxumasından razı qalır və onun musiqi məktəbində oxumasını məsələhət bilir. Rəşidin valideynləri Camal və

Böyükxanım Əliyevlər musiqini sevən insanlar olub. Rəşid Şəfəq sonralar xatirələrində yazırdı ki, qohum və dostlar bizə qonaq gələndə evimizdə həmişə böyük canlanma olar, musiqi səslənərdi.

Rəşidin müntəzəm musiqi ilə məşğul olmasında zəmanəmizin görkəmli bəstəkarlarından biri Fikrət Əmirovun və onun həyat yoldaşı Humay xanımın xüsusi rolu olub. Orta ixtisas musiqi məktəbində və Azərbaycan Dövlət Konservatoriyasında zəmanənin görkəmli musiqiçilərindən dərs alan Rəşid Şəfəq çox qısa bir vaxtda məşhurlaşdı, çoxşaxəli yaradıcılığı ilə adını Azərbaycan musiqi tarixinə yazdı. Bəstəkarlıq məktəbinin tanınmış nümayəndələrindən birinə çevrildi, Əməkdar incəsənət xadimi fəxri adına layiq görüldü. Rəşid Şəfəq “Səfeh siçan balası", "Ağıllı siçan balası", "Tülkü həccə gedir (opera)", Tülkü, Tülkü, Tünbəki”, «Bayquşların söhbəti", "Ana" uşaq operalarının, "Baş tutmayan hiylə", "Min bir gecə”, «Cırtdan» operattalarının, "Qiymətlərin sərgüzəşti", "Ağ Div, Qara Div", "Bir saatlıq xəlifə", "Yağmurcuğun macəraları» musiqili əsərlərin, "Balaca Elnurun musiqi albomu", "Balaca Camalın musiqi albomu", "Uşaq və gənclər üçün musiqi", "Cəngavərlər» “Anamın bayramı", "Azərbaycan avazları", "Ana torpaq – Qarabağ", "Hüseyn Cavid-III", "Rahab» kamera-instrumental və vokal-xor əsərlərinin müəllifidir.




*Rəşid Şəfəq*

Rəşid Şəfəq 2017-ci ildə Bakı şəhərində 77 yaşında vəfat etmişdir.

## Ədəbiyyat

1. Azərbaycan Respublikası Prezidentinin İşlər İdarəsi Siyasi Sənədlər Arxivi. f.1., siyahı 25, iş 2564 (Əliyev Camal Əhməd oğlunun şəxsi işi).
2. Azərbaycan Respublikası Prezidentinin İşlər İdarəsi Siyasi Sənədlər Arxivi. f.1., siyahı 74, 6 hissə, gizli saxlama 25 (APİ-nin direktorları ilə bağlı)
3. Azərbaycan Respublikası Prezidentinin İşlər İdarəsi Siyasi Sənədlər Arxivi. f.1., siyahı 126, iş 71, v.246 (C.Ə. Əliyevin APİ-nin rektoru vəzifəsindən azad edilməsi ilə bağlı Azər.KP MK bürosunun 11 mart 1940 –cı il qərarı )
4. Mirzəyeva N. Rəşid Şəfəq: həyatı və yaradıcılığı. Bakı,”MBM”,2010, 120 s.

***Camal Əhməd oğlu Əliyev***



## ƏLƏSGƏR MAHMUD OĞLU HƏŞİMOV (1904-1976 )

1904-cü ildə Bakı quberniyasının Göyçay qəzasının Alpoud kəndində anadan olub. Əsl adı Mir Ələsgər olub. Xırda ticarətlə məşğul olub atası Göyçay qəzasının tanınmış seyidlərindən olub. Sovetləşmənin ilk illərində əks-inqilabçı kimi güllələnib. Ələsgər uşaq olarkən ailəsi ilə birlikdə Şamaxı şəhərinə köçüb. 1911-1914-cü illərdə Şamaxı şəhərindəki rus-tatar məktəbində, 1914-1916-cı illərdə "Üxüvvət" məktəbində, 1916-1917-ci illərdə ali ibtidai məktəbdə təhsil alıb. 1917-ci ildə ailə yenidən Alpoud kəndinə qayıtdığına görə ali ibtidai məktəbi bitirə bilməyib. Evdar qadın olan anası 1920-ci ildə vəfat edib. 1919-1923-cü illərdə Zaqafqaziya Dəmir Yolunun Müsüsli stansiyasında yerləşən un dəyirmanında yağdəyişdirici işləyib. Bakıya gələrək Qala-Maştağa rayonunun Maştağa kəndində icraiyyə nümayəndəliyində iş icraçısı işləyib. 1927-ci ildə Qala Maştağa rayonunda partiya sıralarına daxil olub. Həmin vəzifə ləğv edildiyindən 1926-1927-ci illərdə kənd klubunun müdiri vəzifəsində işləyib. 1923-1924-cü illərdə Maştağa kəndində su nasos stansiyasında çilingər, 1924-1925-ci illərdə elektrik stansiyasında çilingər, 1925-1926-cı illərdə iş icraçısı, 1927-1928-ci illərdə kənd təsərrüfatı anbarının müdiri işləyib. 1928-1929-cu illərdə un dəyirmanında yağ dəyişdirici işləyib. 1929-cu ilin mart ayında Azərbaycan K(b)P MK-da işlər müdiri təyin olunur. Sonra partiyanın göstərişi ilə rayon icraiyyə komitəsinə işə göndərilib. 1931-ci ilin yanvar ayından noyabr ayına kimi Azərbaycan K(b)P Qala-Maştağa rayonunda şöbə müdiri vəzifəsində işləyib. 1931-ci ildə Azərbaycan K(b)P MK-nın göndərişi ilə Azərbaycan Kommunist Universitetinin tədris şöbəsinin katibi təyin edilib. 1932-ci ildə Zaqafqaziya Xalq Komissarları Sovetinin İqtisadi-Tədqiqatlar İnstitutuna təhsil almaq üçün göndərilib. 2 sentyabr 1932-ci ildə Marksizm-leninizm İnstitutuna

dəyişdirilib. Həmin institutu 1937-ci ildə bitirib. 5 sentyabr 1948-ci ildə ÜİK(b) MK-nın Marksizm-leninizm İnstitutunun Azərbaycan filialında ona verilən arayışda bildirilir ki, institutu bitirdikdən sonra o, Partiya Tarixi İnstitutuna elmi işçi göndərilib. 1938-1940-cı illərdə partiya kurslarının direktoru olub.

1935-1937-ci illərdə S.M.Kirov adına Azərbaycan Dövlət Bədən Tərbiyəsi İnstitutunda siyasi-iqtisad fənnini tədris edib.1 sentyabr 1937-ci ildən 23 fevral 1938-ci ilədək A.Zeynallı adına Azərbaycan Dövlət Konservatori-yasında Sosial-iqtisadi fənlər kafedrasının müdiri olub. 1 sentyabr 1937-ci ildən 1 sentyabr 1939-cu illərdə S.M.Kirov adına Azərbaycan Dövlət Bədən Tərbiyəsi İnstitutunda Siyasi-iqtisad kafedrasında dosent vəzifəsində çalışıb.

Repressiya illərində ciddi təzyiqlərə məruz qalıb. Haqqında Azərbaycan KP MK-ya anonim məktublar göndərilib. Azərbaycan K(b)P MK-nın I katibiM.C.Bağırova ünvanlanan böhtan dolu məktubda göstərilir ki, Şaumyan İnstitutunda Həşimov işləyir, atası əksinqilabçı olduğuna görə güllələnib. Əsl adının Mir Ələsgər olduğunu bildirməyib. Qardaşı müsavatçı olub. Bunları yalnız Okinşeviç və Axundzadə bilib. Onlar isə onu partiyadan qovmaq əvəzinə daha rahat yerə - Şaumyan İnstitutuna (Partiya Tarixi İnstitutuna) göndəriblər. Okinşeviç və Axundzadənin xalq düşməni kimi həbsindən sonra Həşimovun keçmişini yoxlamaq və əsl siyasi üzünü aşkar etmək lazım gəlir. Həmin məktub 15 noyabr 1937-ci ildə AK(b)P MK-nın xüsusi şöbənin müdiri Novikov tərəfindən M.C.Bağırovun tapşırığı ilə Daxili İşlər Xalq Komissarlığının müavini mayor Borşovə göndərilir. Anonim məktuba əlavə edilən göndərişdə belə bir qeyd var: ”Baxmayaraq ki, bir dəfə yoxlamısınız, xahiş edirəm bir dəfə də diqqətlə yoxlayasınız”. İmza yerində “M.C.Bağırov” yazılıb. Ə.Həşimov həmin məktubda institutun arxivinə qardaşı müsavatçı olmuş, nə vaxtsa töhmət almış Hacıyevi müdir qoyduğuna görə ittiham olunurdu. (O dövrdə Dövlət Təhlükəsizlik xidməti Daxili İşlər Xalq Komissarlığının (“NKVD”) tərkibində fəaliyyət göstərirdi), 22 noyabr 1937-ci ildə mayor Borşev Azərbaycan K(b)P MK-ya ünvanladığı cavab məktubunda yazır:”Daxili İşlər Xalq Komissarlığında Həşimovun əleyhinə material yoxdur və anonim məktubu sizə qaytarıram”.

Sonrakı hadisələr göstərir ki, Ələsgər Həşimova qara yaxmağa çalışanlar buna nail ola bilməyib və o, repressiya maşınının təzyiqindən və mənəvi terrordan yaxa qurtara bilib.

Azərbaycan K(b)P MK bürosunun 11 mart 1940-cı il tarixli qərarı ilə APİ-nin direktoru Camal Əliyev vəzifəsindən azad olunub, onun yerinə 1927-ci ildən partiya üzvü olan Ələsgər Həşimov təyin edilib. Ələsgər Həşimov həmin vəzifəyə təyin olunana kimi Azərbaycan PK MK yanında partiya kurslarının direktoru vəzifəsində işləmişdi. O, instituta 16 dekabr 1941-ci ilə kimi rəhbərlik edib.

***Ələsgər Mahmud oğlu Həşimov***

29 oktyabr 1941-ci ildən 8 aprel 1943-cü ilə qədər Xalq Maarif Komissarlığının müavini olub. 1943-1944-cü illərdə Pedaqoji İnstitutda direktor müavini və müəllim olub. 1944-1947-ci illərdə Azərbaycan SSRİ Xalq Komissarları Sovetinin nəzdindəki Dövlət Plan Komitəsinə Mədəniyyət və səhiyyə şöbəsinin müdiri olub. 1 sentyabr 1946-cı ildən 25 avqust 1947-ci ilə kimi Azərbaycan Dövlət Xalq Təsərrüfatı İnstitutunda siyasi-iqtisad müəllimi işləyib. 1948-1951-ci illərdə Azərbaycan Dövlət Qiyabi Pedaqoji İnstitutunda və Azərbaycan Pedaqoji Xarici Dillər İnstitutunda müəllim işləyib. 16 fevral 1949-cu ildə Azərbaycan Pedaqoji Xarici Dillər İnstitutunun Marksizm-leninizm kafedrasına müdir təyin olunub. 11 aprel 1949-cu ildə Azərbaycan SSR Maarif Nazirliyinin əmri ilə institutun Elmi Şurasının tərkibinə daxil edilib. 23 sentyabr 1949-cu ildə kafedra müdiri vəzifəsindən azad olunub, həmin kafedrada siyasi-iqtisad müəllimi saxlanılıb. 12-18 may 1950-ci ildə Şamxor, Gədəbəy, Tovuz, Ağstafa, Qazax rayonlarında şagirdlər arasında ali məktəbə hazırlıqla bağlı söhbət aparmaq üçün məzuniyyətdə olub. 7 fevral 1950-ci ildə Qiyabi Pedaqoji İnstitutda işləməsi ilə əlaqədar olaraq 0,5 ştata keçirilib. 18 may 1951-ci ildə Azərbaycan Pedaqoji Xarici Dillər İnstitutunda Marksizm-leninizm kafedrasının baş müəllim vəzifəsinə təyin olunub və ömrünün sonuna kimi həmin kafedrada işləyib. "Azərbaycanın pambıqçılıq kolxozlarında saxlaqçılıq hərəkatının inkişafı" mövzusunda dissertasiya üzərində çalışıb. İnstitutda marksizm-leninizm klassiklərinin əsərlərinin öyrənilməsi ilə bağlı seminar təşkil edib, siyasi dərnəyin rəhbəri olub.

1976-cı ildə Bakı şəhərində vəfat edib.

## Ədəbiyyat

1. Azərbaycan Respublikası Prezidentinin İşlər İdarəsi Siyasi Sənədlər Arxivi. f.1., siyahı 26, iş 713, v.246 (Həşimov Ələsgərin APİ-yə rektor təyin edilməsi haqqında Azərb. KP MK bürosunun 11 mart 1940-cı il qərarı).

2. Azərbaycan Respublikası Prezidentinin İşlər İdarəsi Siyasi Sənədlər Arxivi. f.1.,siyahı 34, sax/ vahidi 1237 (Həşimov Mirələsgər haqqında anonim məktublar).

3. Azərbaycan Respublikası Prezidentinin İşlər İdarəsi Siyasi Sənədlər Arxivi. f.1., siyahı 26, iş 713, v.246 (Həşimov Mirələsgərin Azərb.K(b)P MK yanında partiya kurslarının direktoru olması haqqında)

4. Azərbaycan Dillər Universitetinin Arxivi. Ələsgər Mahmud oğlu Həşimovun şəxsi işi

5.ADPU-nun Arxivi. Ələsgər Mahmud oğlu Həşimovun şəxsi işi

***Ələsgər Mahmud oğlu Həşimov***



**AĞAMMƏD SƏMƏD OĞLU ABDULLAYEV**
*pedaqoji elmlər doktoru, professor*
*(1909-1979)*

Ağamməd Səməd oğlu Abdullayev 15 mart 1909-cu ildə Bakı şəhərində dəmirçi ailəsində anadan olmuşdur. Bakı şəhərindəki 44 №-li orta məktəbi (1921), Bakı Pedaqoji Texnikumunu (1926), Azərbaycan Dövlət Pedaqoji İnstitutunun Azərbaycan dili və ədəbiyyatı fakültəsini (1930) bitirmişdir.

Ağamməd Abdullayev 1926-1929-cu illərdə Bakı şəhərindəki 29 №-li məktəbdə, 1929-1932-ci illərdə Bakı Pedaqoji Texnikumunda Azərbaycan dili və ədəbiyyatı müəllimi, 1932-1939-cu illərdə Azərbaycan KP MK-nın nəzdində olan Azərbaycan Kommunist Universitetində baş müəllim və kafedra müdiri işləmişdir.

Ağamməd Abdullayev 1935-1936-cı illərdə Bakı Partiya Komitəsinin birillik kursunda oxumuş, Bakı şəhər Xalq Maarif şöbəsində metodist (1935-1939), Azərbaycan Dövlət Pedaqoji İnstitutunda baş müəllim, Azərbaycan dili və ədəbiyyatı fakültəsinin dekanı (1939-1941), Azərbaycan Dövlət Universitetində baş müəllim (1941-1942), M.F.Axundov adına Azərbaycan Müəllimlər İnstitutunun direktoru (1942-1943) işləmişdir. Ağamməd Abdullayevin həyatının mühüm bir hissəsi Azərbaycan Dövlət Pedaqoji İnstitutu ilə bağlıdır. O, burada direktor (1943-1944), kafedra müdiri (1944-1945; 1949-1953; 1970-1979), elmi işlər üzrə prorektor (1966-1969) vəzifələrində çalışıb.

Onun Azərbaycan Dövlət Pedaqoji İnstitutuna rəhbərlik etdiyi qısa bir dövr ağır illərə təsadüf edir. Maliyyə və kadr potensialının tükənməsi nəticəsində ADU-ya birləşdirilən Pedaqoji İnstitut 1943-cü ilin oktyabrında yenidən təşkil olundu. Pedaqoji İnstitutda tədrisin yüksək səviyyədə təşkilinə rəhbərlik Ağamməd Abdullayevə həvalə olundu. Onun bu sahədə müəyyən təcrübəsi vardı. Müharibənin əvvəllərində M.F.Axundov adına Azərbaycan

Müəllimlər İnstitutunun direktoru vəzifəsində işləmişdi. Pedaqoji İnstitutun müharibədən əvvəlki vəziyyətinə qaldırılmasında xeyli çətinliklər var idi. Belə ki, institutun daimi binası yox idi, tələbə və müəllimlərin çoxu ya səfərbərliyə alınmışdı, ya da maddi çətinlik səbəbindən institutdan ayrılaraq istehsalata getmişdi. İnstitut onda indiki "Səadət Sarayı"nda yerləşirdi. Belə bir çətin vəziyyətdə Azərbaycan K(b)P MK Ağamməd Abdullayevi Azərbaycan Xalq Maarif Komissarının müavini Məmməd Ələkbərovla əvəz etdi. Ağamməd Abdullayev institutda kafedra müdiri kimi fəaliyyətini davam etdirdi.

Ağamməd Abdullayev əvəzçiliklə 1944-1949-cu illərdə Azərbaycan Dövlət Qiyabi Pedaqoji İnstitutunda müəllim, 1946-1949-cu illərdə isə Azərbaycan Elmi-Tədqiqat Pedaqoji Elmlər İnstitutunda baş elmi işçi və elmi katib vəzifəsində işləyib.

Ağamməd Abdullayev 1966-cı ildə M.F.Axundov adına Azərbaycan Dövlət Pedaqoji İnstitutunun direktoru vəzifəsinə təyin olunur. 1966-1970-ci illərdə M.F.Axundov adına Azərbaycan Dövlət Pedaqoji İnstitutunun inkişafı və burada aparılan ciddi islahatlar onun adı ilə bağlıdır. Belə ki, o zamanlar həmin instituta qəbul zamanı ruslar, ermənilər, yəhudilər, ləzgilər üstünlük təşkil edirdi. Bunun da əsas səbəbi qəbul qaydaları ilə bağlı idi. Abituriyentlər qəbul zamanı rus dilindən şifahi imtahan verməli, rus dilində inşa yazmalı idi. Bu, kənd rayonlarından gələn gənclər üçün olduqca çətin idi. Nəticədə, azərbaycanlı gənclər instituta qəbul oluna bilmirdi. Ağamməd Abdullayev həmin instituta rektor təyin edildikdən sonra qəbul qaydalarında dəyişikliyin aparılmasına nail oldu. Belə ki, şifahi imtahanlar rus dilində deyil, Azərbaycan dilində götürülməyə başlandı və rus dilindən inşa yazı imla yazmaqla əvəz olundu. Bu da təbii ki, tədricən M.F.Axundov adına Azərbaycan Dövlət Pedaqoji İnstitutunda azərbaycanlı tələbələrin sayının artmasına gətirib çıxartdı. Digər tərəfdən o, ingilis, alman, fransız və rus dili ixtisaslarında əlavə olaraq Azərbaycan dilinin ikinci ixtisas kimi öyrədilməsinə nail oldu. Onun rəhbərliyi dövründə institutda xarici dillərin tədrisində böyük uğurlar əldə edildi. 1966-cı ildə Tərcümə kafedrası yaradıldı. 1968-ci ilin yanvarında Avropa dilləri fakültəsinin əsasında 2 fakültə (ingilis dili və alman -fransız dilləri) yaradıldı.Leksika kafedrası 1 və 2 №-li Leksika kafedralarına bölündü. A. Abdullayev 1942-ci ildə “Orta məktəbdə Azərbaycan dili tədrisi metodikası” mövzusunda namizədlik, 1958-ci ildə “Azərbaycan dilinin tədrisi tarixi” mövzusunda doktorluq dissertasiyası müdafiə etmişdir. Doktorluq dissertasiyasının materialları əsasında 1966-cı ildə nəşr etdirdiyi “Azərbaycan dilinin tədrisi tarixindən” adlı monoqrafiyasında XIX əsrin ikinci yarısından XX əsrin 50-ci illərinə kimi Azərbaycan dilinin tədrisi tarixi araşdırılır, dövrün tələblərinə uyğun olaraq məzmunun təkmilləşdirilməsi istiqamətləri

nəzərdən keçirilir, məktəblərdə istifadə edilən dərsliklər ("Vətən dili", "Uşaq bağçası", "Bəsürət-ül -Ətfal", "Balalara hədiyyə", "Türk əlifbası və ilk qiraət dərsliyi","İkinci il" və s. ) təhlil edilir.

Respublikamızda fənlərin tədrisi metodikası üzrə ilk elmlər doktoru olan Ağaməd Abdullayev 1958-1959-cu tədris ilində ADPİ-də Azərbaycan dili və onun tədrisi metodikası kafedrası yaratmış, ömrünün sonuna kimi həmin kafedraya rəhbərlik etmişdir. Azərbaycan dilinin tədrisi metodikası sahəsində elmi məktəb yaratmışdır. Azərbaycan dilinin tədrisi metodikası üzrə milli



*Professorlar: Afad Qurbanov, Feyzulla Qasımzadə, Əbdüləzəl Dəmirçizadə, Ağaməd Abdullayev*

kadrların böyük bir dəstəsinin yetişməsi onun adı və yorulmaz fəaliyyəti ilə bağlıdır. Keçən əsrin 60-70-ci illərində Azərbaycan dilinin tədrisi metodikası üzrə yetişən elmlər namizədləri ya onun elmi rəhbərliyi, ya da rəsmi opponentliyi ilə bu yüksək elmi dərəcəyə sahib olmuşlar. O, 27 nəfərin namizədlik dissertasiyasının elmi rəhbəri, 10 nəfərin namizədlik və doktorluq dissertasiyasının rəsmi opponenti olmuşdur.

Prof.A.Abdullayev öz yetirmələrinə üz tutaraq deyərmiş: *"Mən bir çələng düzəltmişəm, siz onun çiçəklərisiniz"*. Bu sahədəki xidmətlərini yüksək dəyərləndirən yetirməsi prof. H.Balıyev onunla bağlı xatirələrində yazırdı*: "O, sözün əsl mənasında xeyirxah, qayğıkeş insan, hamının əlindən tutub kömək etməyə çalışan, həm də təmənnasız kömək etməyə çalışan, bu cəhətdən heç kəslə müqayisə edilə bilməyən əvəzsiz şəxsiyyət idi"*. Dos.B.Muradov elmi rəhbərindən söz düşəndə deyərdi ki, o, *son dərəcə milli, vətənpərvər, qeyrətli, təhsil alıb işlədiyi institutu ürəkdən sevən bir ziyalı idi.*

Prof.Ağaməd Abdullayevin Azərbaycanda pedaqoji jurnalistikanın

inkişafında mühüm xidmətləri olmuşdur. O, 1960-1975-ci illərdə "Azərbaycan dili və ədəbiyyat tədrisi" məcmuəsinin redaktoru olmuşdur.

Yaradıcılığa "Dəfinələr adası" əsərini Azərbaycan dilinə tərcümə etməklə başlayan Ağamməd Abdullayev qısa bir müddətdə sürətli yaradıcılıq yolu keçmiş, namizədlik və doktorluq dissertasiyaları müdafiə etmiş, Azərbaycan dilinin tədrisi metodikası ilə bağlı 150-dan artıq dərslik, dərs vəsaiti, kitab, kitabça və elmi məqalə nəşr etdirmişdir. Onun dəfələrlə nəşr olunan "Ədəbiyyat müntəxabatı" (1936), "Azərbaycan dili" (1938), "Oxu kitabı" (1938), "Qiraət kitabı" (1944), "Ana dili" (1950), "Əlifba" (1963) kitabları ölkəmizdə dərslik yaradıcılığının inkişafında mühüm rol oynamışdır.

Onun yaradıcılığı çoxşaxəli olmuş, Azərbaycan dilinin tədrisinin müxtəlif sahələrini əhatə etmişdir. Ağamməd Abdullayevin elmi yaradıcılığını mövzu və istiqamətinə görə aşağıdakı kimi müəyyənləşdirmək olar:1)ibtidai siniflərdə ana dilinin tədrisi metodikası; 2)qeyri-Azərbaycan məktəblərində Azərbaycan dilinin tədrisi məsələləri; 3)ümumtəhsil orta məktəbinin V-XI siniflərində Azərbaycan dilinin tədrisi metodikası; 4) nitq mədəniyyəti məsələləri; 5) ədəbiyyatın tədrisi məsələri; 6)Azərbaycan dilinin tədrisinin tarixi problemləri; 7) üslubiyyat məsələləri.

"Rus məktəblərində Azərbaycan dili tədrisinin metodikası" (1960;1971), "Üslubiyyat məşğələlərinin metodikası" (1961), "İbtidai məktəbdə Azərbaycan dilinin tədrisi metodikası" (1962), "Orta məktəbdə Azərbaycan dili tədrisi metodikası" (1964), "Azərbaycan dilinin tədrisi tarixindən" (1966), "İbtidai siniflərdə ana dili tədrisinin metodikası" (1968), "Nitq mədəniyyəti və natiqlik məharəti haqqında" (1968), "Orta məktəbdə Azərbaycan dilinin tədrisi metodikası" (1968;1978) adlı dərslik və dərs vəsaitləri ilə prof.Ağamməd Abdullayev Azərbaycan dilinin tədrisi metodikasının bir elm sahəsi kimi təşəkkülü və inkişafına güclü təsir göstərmişdir.

Ağamməd Abdullayev ədəbiyyatın tədrisi məsələləri ilə də məşğul olmuşdur. Belə ki, 1936-cı ildə qeyri-türk (Azərbaycan-F.R) məktəblərinin IX və X sinifləri üçün "Ədəbiyyat müntəxabatı", 1938-ci ildə erməni məktəbləri üçün "Ədəbiyyat xrestomatiyası" kitablarını hazırlayıb nəşr etdirmişdir. Onun Azərbaycan dilinin praktik məsələləri, nitq mədəniyyəti və üslubiyyatla bağlı maraqlı araşdırmaları vardır. "Üslubiyyat məşğələlərinin metodikası" adlı dərs vəsaitində orta məktəbdə üslubiyyat məşğələlərinin keyfiyyətini yaxşılaşdırmaq, şagirdlərə öz fikrini və hisslərini aydın, sərbəst ifadə etməyi öyrətmək yolları şərh olunur. Ağamməd Abdullayev ictimai-siyasi mövqeyi və fəaliyyəti ilə seçilən alimlərdən olub. Azərbaycan KP Bakı Komitəsi rayon plenumunun üzvü, rayon məhkəməsində xalq iclasçısı, ADPİ-nin partiya komitəsinin katibi olub. 1948, 1967 və 1969 -cu illərdə Bakı şəhər

Zəhmətkeş Deputatlar Sovetinə seçilib. Onun əməyi dövlət tərəfindən yüksək qiymətləndirilib, dəfələrlə yüksək vəzifələrə irəli çəkilib, "Qafqazın müdafiəsi uğrunda" (1946), "1941-45-ci illərdə Böyük Vətən Müharibəsində şərəfli əməyə görə" (1945) medalları, Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin Fəxri Fərmanı və "SSRİ maarif əlaçısı" (1977) döş nişanı ilə təltif edilib.

1999-cu ildə onun haqqında "Ağamməd Abdullayev-90" kitabı nəşr olunub, 2010-cu ildə 100 illik yubileyi ADPU-da təntənəli şəkildə qeyd olunub. Yubiley tədbirini ADPU-nun elmi işlər üzrə prorektoru, prof.Vilayət Əliyev açmış, filologiya fakültəsinin dekanı, prof.Buludxan Xəlilov "A.Abdullayevin həyatı və elmi-pedaqoji fəaliyyəti" mövzusunda məruzə etmişdir. Tədbirdə psixologiya kafedrasının müdiri, prof.Əbdül Əlizadə, Azərbaycan dilçiliyi kafedrasının dosenti Azər Hüseynov, fəlsəfə kafedrasının müdiri, prof. Məhəmməd Balayev, prof.Yusif Seyidov, prof.Yəhya Kərimov, prof.Nizami Xudiyev və ailə üzvləri adından qızı - Ümumi psixologiya kafedrasının baş müəllimi Gülnarə Məmmədova çıxış edərək onun həyatının, elmi və pedaqoji fəaliyyətinin yadda qalan anlarını iştirakçılarla bölüşüblər.

Obyektivliyi, prinsipiallığı, xeyirxahlığı ilə seçilən prof.Ağamməd Abdullayev direktor olarkən dekan, dekan müavini, kafedra müdiri vəzifələrinə savadlı və bacarıqlı insanları cəlb edərdi. Apardığı dəyişikliklərdən sonra həmkarlarının: nə axtarırsan?-sualına "Yaxşı adam axtarıram" - deyərmiş.

Prof.Ağamməd Abdullayev insanlarda ziyalı haqqında təsəvvürlərin formalaşmasında mühüm rol oynayan böyük alim, əsl şəxsiyyət, əməksevər, səmimi, xeyirxah, mehriban, mənəviyyatca çox zəngin, geyimində, davranışında cəmiyyətə nümunə olan, həmkarlarına və tələbələrinə hörmətlə yanaşan zəka sahibi olub.

Professor Ağamməd Abdullayev 1979-cu ildə vəfat etmişdir.

## Ədəbiyyat


1. ADPU-nun Arxivi. Professor Ağamməd Səməd oğlu Abdullayevin şəxsi işi
2. Ağamməd Abdullayev-90.Xatirələr.Bakı, Ozan, 1999
3. Yusifova N.Ağamməd Abdullayev və Azərbaycan dilinin tədrisi metodikasının formalaşması.Bakı, Elm və təhsil, 2011
4. Ziyad A.Yüzillik ömür yoluna bir baxış."Gənc müəllim" qəzeti, dekabr 2010


***<u>Ağamməd Səməd oğlu Abdullayev</u>***



**MƏMMƏD HƏMİD OĞLU ƏLƏKBƏROV**
*filologiya elmləri namizədi*
*(1899- 1959)*

Məmməd Həmid oğlu Ələkbərov (Ələkbərli) 1899-cu ildə İranın Lisar kəndində anadan olub. 1905-ci ildə, 6 yaşı olanda ailəsi ilə birlikdə Lənkəran şəhərinə köçüb.[37] Ata nəsilləri əslən Lənkərandan olub. Atası Lənkəranda yaşayarkən bir müddət dənizdə işləyib, sonra çəltik əkib-becərməklə və ticarətlə məşğul olub. 1909-cu ildə atası Məşədi Həmidin ölümündən sonra ailənin vəziyyəti daha da pisləşib, anası ikinci dəfə ailə qurmaq məcburiyyətində qalıb. O, bibisi Züleyxanın himayəsində yaşamalı olub. Məmmədin atası Məşədi Həmid də valideynlərindən ayrıldıqdan sonra ərdə olan bacısı Züleyxanın yanına gəlmiş, bir müddət onun həyat yoldaşı ilə birlikdə çalışmışdı. Bacısının həyat yoldaşının vəfatından sonra təsərrüfatı idarə etmək ona həvalə edilmişdi.

Məmməd Ələkbərov bibisinin himayəsində yaşayır və tərbiyə olunur. Məmmədin təhsil alması qayğısına qalan bibisi onu əvvəlcə kənd məktəbinə (molla yanına) qoyur, sonra Lənkərandakı "Behcət" rus-tatar (Azərbaycan)

---

[37] *Məmməd Ələkbərovun bütün sənədlərində doğum yeri kimi Lənkəran göstərilir. Onun haqqında Azərbaycan K(b)P MK-ya yazılan şikayət məktubu əsasında yaradılan komissiya onun tərcümeyi-halında uyğunsuzluq aşkar edir. Məmməd Ələkbərov 22 may 1950-ci ildə Azərbaycan K(b)P MK-nın katibi H.Həsənova ünvanladığı izahat məktubunda, həqiqətən də, İranın Lisar kəndində doğulduğunu, qohumları ilə bir müddət Ənzəlidə yaşadığını, amma doğum şəhadətnaməsində Lənkəran yazıldığını bildirir. 1922-ci ildə komsomol sıralarına keçəndə, 1925-ci ildə Ali Pedaqoji İnstitutda oxuyanda, 1927-ci ildə Quba qəza xalq maarif şöbəsinin müdiri işləyəndə, 1937-ci ildə böyük "təmizləmə" zamanı bu suala cavab verdiyini bildirir. İzahatında o, ata nəslinin Lənkərandan olmasını, babalarının Lənkəran qəbiristanlığında uyumasını, həqiqətən də Lənkəranı doğma yurdu hesab etməsini, İranla heç bir əlaqəsi olmamasını, Ənzəliyə qohumları ilə məcburən getməsini bildirir.*

***Məmməd Həmid oğlu Ələkbərov***

məktəbinə göndərir. Məmməd Ələkbərov tərcümeyi-halında həmin məktəbi bitirmədiyini təəssüf hissi ilə qeyd edir.

1914-cü ildə qohumları ilə birlikdə İranın Ənzəli şəhərinə gedir və 4 il orada yaşayır. 1920-ci ilə qədər əmisi oğlu Məmmədvəli Cəfərovun balıqçılıq təsərrüfatında çalışır. Azərbaycanda sovet hakimiyyəti qurulduqdan sonra müəllim hazırlığı kursunu bitirərək Astraxanbazardakı (indiki Cəlilabad) I dərəcəli məktəbə müəllim göndərilir. 1921-ci ildə Lənkəran şəhər 5 nömrəli məktəbə dəyişdirilir və 1923-cü ilə kimi orada müəllim işləyir.

Ali təhsil almaq üçün Bakıya göndərilən Məmməd Ələkbərov 1923-1926-cı illərdə Ali Pedaqoji İnstitutda oxuyub, dövrün görkəmli tarixçi alimlərindən dərs alıb. Məmməd Ələkbərovun Azərbaycan Respublikası Təhsil Nazirliyinin Xalq Təhsil Muzeyindəki şəxsi sənədlərinin içərisində Azərbaycan Dövlət Ali Pedaqoji İnstitutunu 1 iyun 1926-cı ildə bitirməsi haqqında 68 saylı Şəhadətnamə (diplom) saxlanılır. Şəhadətnamə Azərbaycan və rus dillərində yazılmış iki hissədən ibarətdir.


A. I. Ş. C.
Xalk Maarif Komisarlıƣı
ALI VƏ SƏN'ƏT MƏQTƏBLƏRI BAŞ MUDIRIJJƏTI
Azərbajcan Dəvlətı Ali Pedagoʒy
INSTITYTY
1. ijyn 1926 il.
№ 68
Baqı.

Ʒahadatnama

1899 nci jil sentijabr ajının 18 ində Lənqəranda doƣylmyʒ vətəndaʒ Məmməd Ələqbər zadə Ali Pedagoʒy Institytı tarix ədəbijjat fakyltəsiniꞑ butun kyrsyny dinləjərəq atidəqi fənnlərdən imtihan vermiʒdir: turq ədəbijjati tarixi, qərb ədəbijjati tarixi, turq tarixi, Azərbajcan tarixi, orta əsir tarixi, mədənijjət tarixi, fars lisani və ədəbijjati, ərəb lisani, ədəbijjat və lisan usyl tədrisi, psixoloʒi, pedagoʒi, tarix pedagoʒi, didaktik, fəlsəfəjə qiriʒ, tarixi madijjət və rys lisani.

Byndan baʒka tədris planı uzrə məvcyd butun təcrubə iʒlərini icra etmiʒ və numynə dərslərini qafi dərəcədə verməqlə tarix ədəbijjat fakyltəsiniꞑ tədris planı mocibincə butun tələbatını ifa etmiʒ oldyƣyndan 1926 nci jil may ajının 26 qunu vaki Institvt Pedagoʒy Ʒyrasında vətəndaʒ Məmməd Ələqbər zadə Azərbajcan Ali Pedagoʒy Institytı tarix ədəbijjat fakyltəsiniꞑ butun kyrsyny bitirmiʒ ədd edilərəq iqinci dərəcə məqtəblər (pedagoʒy və sənaje' texnikymları, iʒçi fakyltələri, qənd cavanlar məqtəbləri və sairə) də dərs verməq hykykyna maliq oldyƣy içın iʒby ʒahadatnama ona verilmiʒdir.

Institvt Rektory: [signature]
Tarix ədəbijjat Fakyltəsi Dekanı: [signature]
Ʒyra Qatibi: [signature]

500 1926

M.Ələkbərovun Ali Pedaqoji İnstitutu bitirməsi haqqında Şəhadətnamə

Orada yazılır: "*1899-cu il sentyabr ayının 18 -də Lənkəranda doğulmuş vətəndaş Məmməd Ələkbərzadə Ali Pedaqoji İnstitutu* ***tarix-ədəbiyyat fakültəsinin*** *bütün kursunu dinləyərək altdakı fənlərdən imtahan vermişdir: türk ədəbiyyatı tarixi, qərb ədəbiyyatı tarixi, türk tarixi, Azərbaycan tarixi,orta əsr tarixi, mədəniyyət tarixi, fars lisanı və ədəbiyyatı, ərəb lisanı, ədəbiyyat və lisanı üsul tədrisi, psixologiya, pedaqogika, pedaqogika tarixi,didaktika, fəlsəfəyə giriş, tarixi materializm və rus dili.*

*Bundan başqa tədris planı üzrə mövcud bütün təcrübə işlərini icra etmiş və nümunə dərslərini kafi dərəcədə verməklə tarix-ədəbiyyat fakültəsinin tədris planın bütün tələbatını ifa etmiş olduğundan 1926-cı il may ayının 26 günü İnstitut Pedaqoji Şurasında vətəndaş Məmməd Ələkbərzadə Azərbaycan Ali Pedaqoji İnstitutu* ***tarix-ədəbiyyat fakültəsinin*** *bütün kursunu bitirmiş*

***Məmməd Həmid oğlu Ələkbərov***

*hesab edilərək ikinci dərəcə məktəbləri (pedaqoji və sənaye texnikumları, işçi fakültələri, kənd cavanlar məktəbləri və sairə) də dərs vermək hüququna malik olduğu üçün bu Şəhadətnamə ona verilmişdir.*

*İnstitut direktoru*

*Tarix-ədəbiyyat fakültəsi dekanı".*

Həmin dövrdə institutun direktoru *Cəlil Məmmədzadə*, Tarix-ədəbiyyat fakültəsinin dekanı *İsmayıl Hikmət* olub.

1926-cı ildə ali təhsilini başa vuran Məmməd Ələkbərov Quba qəza xalq maarifi şöbəsinə müdir təyin edilir. İki il müddətində Qubada maarif işlərinin təşkilində, məktəbyaşlı uşaqların, yaşlıların təhsilə cəlb edilməsində, azsaylı xalqların uşaqları üçün ibtidai məktəblərin açılmasında mühüm xidmətlər göstərir.



Məmməd Ələkbərov 1928-ci ildə Xalq Maarif Komissarlığı aparatına işə dəvət olunur. Burada metodist, məsul icraçı, ibtidai və orta məktəb idarəsi rəisinin müavini vəzifələrində çalışmaqla yanaşı, Azərbaycan Dövlət Elmi Tədqiqat Məktəblər İnstitutunda, Azərbaycan Dövlət Pedaqoji İnstitutunda əvəzçilik qaydasında dərs deyir.

30-cu illərin axırlarında Məmməd Ələkbərov daha məsul vəzifəyə irəli çəkilir, 1939-cu ildə Müəllimləri Təkmilləşdirmə İnstitutunun direktor müavini təyin olunur, 4 il həmin vəzifədə uğurla çalışır. Elmi-metodiki bacarığı, ciddi iş üslubu, idarəetmə məharəti ona böyük nüfuz qazandırır və o, yenidən Xalq Maarif Komissarlığına dəvət olunur, əvvəlcə kadrlar idarəsinin rəisi, sonra isə Azərbaycan xalq maarif komissarının müavini təyin edilir.

Görkəmli Azərbaycan yazıçısı M.İbrahimovdan sonra xalq maarif komissarı təyin olunub. O, bu vəzifədə 1946-1952-ci illərdə uğurla fəaliyyət göstərib. Müharibədən sonrakı illərdə təhsil sferasına rəhbərlik etməyin çox böyük çətinlikləri var idi. Məmməd Ələkbərov xalq maarif komissarı kimi 6 illik fəaliyyətində xeyli uğurlara imza atıb, yeni məktəblərin yaradılmasına, məktəblərin müəllim kadrları ilə komplektləşdirilməsinə, ali və orta ixtisas


Баки шəhəр зəhмəткеш ДЕПУТАТЛАРЫНЫН СОВЕТИ 1953 Бакинский городской СОВЕТ ДЕПУТАТОВ ТРУДЯЩИХСЯ
ДЕПУТАТ БИЛЕТИ
ДЕПУТАТСКИЙ БИЛЕТ № 100
Буну тəгдим эдəн йол. Предъявитель тов. Алекперов Мамед Гамид оглы
№ ......ли округдан Баки шəhəр зəhмəткеш депутатлары Советинə депутат сечилмишдир.
избран депутатом Бакинского Городского Совета депутатов трудящихся от округа № 100
Баки шəhəр Совети Ичраиййə Комитəсинин Сəдри
Председатель Исполн. Ком. Бак. Гор. Совета
Баки шəhəр Совети Ичраиййə Комитəсинин катиби
Секретарь Исполн. Ком. Бак. Гор. Совета
ЧАҒЫРЫШ IV 1953 СОЗЫВ IV
АЗЕРБАЙДЖАНСКАЯ ССР
Шəхси имза
Личная подпись

***Məmməd Həmid oğlu Ələkbərov***

pedaqoji məktəblərinə tələbə qəbulunun artırılmasına, məktəblilərin dərslik və dərs vəsaiti ilə təminatına, respublikada icbari yeddillik təhsilin başa çatdırılmasına rəhbərlik edib. Azərbaycanı rayon-rayon, kənd-kənd gəzərək əhalinin təhsillilik səviyyəsinin yüksəldilməsində böyük xidmətlər göstərib.

Akademik Hüseyn Əhmədov Azərbaycanın təhsil nazirlərindən danışanda həmişə Məmməd Ələkbərovun, Mehdi Mehdizadənin, Lidya Rəsulovanın və Misir Mərdanovun adını hörmətlə çəkir və onların fəaliyyətlərini yüksək qiymətləndirir. Məmməd Ələkbərovla bağlı oçerki hazırlayanda Hüseyn müəllimlə görüşdüm. Onun haqqında xeyli danışandan sonra fikrini belə tamamladı: *”Bala, yadında saxla, Məmməd Ələkbərov kabinet naziri deyildi; o, nazir kimi Azərbaycanın ən ucqar dağ kəndindəki məktəbə gedən cığırı (yolu) tanıyırdı.”*

Məmməd Ələkbərovun həyatında 50-ci illər xüsusi ilə yadda qalan olub. O, 1955-1956 -cı illərdə Nazirlər Soveti sədrinin müavini, Azərbaycanın ilk mədəniyyət naziri olub


ДИПЛОМ
КАНДИДАТА НАУК

МФЛ № 00727

Москва 1 июля 1950 г.

Решением
Совета Азербайджанского Государственного Университета им. Кирова
от 18 октября 1947 г. (протокол № 1)
гражданину
Алекперову Мамеду Гамид оглы
ПРИСУЖДЕНА УЧЕНАЯ СТЕПЕНЬ КАНДИДАТА ФИЛОЛОГИЧЕСКИХ НАУК

Председатель Совета

Ученый Секретарь Совета

Məmməd Ələkbərov 30-40-cı illərdə daha çox idarəetmə sahəsində fəaliyyət göstərsə də, sistemli olaraq elmi-metodiki fəaliyyətlə məşğul olmuş, xeyli dərslik və dərs vəsaitlərinin ərsəyə gəlməsində iştirak etmişdir. Onun "Natamam orta və orta məktəblərdə yazı işləri" (1940), “Nizami Gəncəvi haqqında. İbtidai məktəblərin III və IV sinifləri üçün oxu kitabı” (1940), “Orta məktəbdə ədəbi oxu haqqında” (1940), "İbtidai məktəbdə oxu metodikası" (1940), “İbtidai məktəbdə nağıl yazdırmaq üçün materiallar” (1940) kitabları nəşr edilib. Bilavasitə onun elmi redaktorluğu ilə 30-dan çox dərslik və tədris vəsaiti işıq üzü görüb. Azərbaycan dili və ədəbiyyatın tədrisi metodikası ilə bağlı xeyli məqalələr yazıb.

Sistemli araşdırmalarının nəticəsi kimi 5 iyun 1947-ci ildə “Nizami Gəncəvi və Azərbaycan folkloru” mövzusunda filologiya elmləri namizədi

alimlik dərəcəsi almaq üçün ADU-nun Filologiya fakültəsində dissertasiya müdafiə edib.

Fakültə Elmi Şurasının 20 nəfər üzvünün hamısı yekdilliklə əsərin lehinə səs verib. ADU-nun Elmi Şurasının 18 sentyabr 1947-ci ildə rektor, professor A.İ.Qarayevin sədrliyi ilə keçən iclasında Məmməd Ələkbərova filologiya elmləri namizədi alimlik dərəcəsi verilməsi haqqında Filologiya fakültəsinin qərarı təsdiq olunub. Həmin dövrdə elmi dərəcə və elmi adlar Universitet rəhbərliyinin vəsadəti əsasında SSRİ Nazirlər Soveti yanında Ali Attestasiya Komissiyası tərəfindən təsdiq olunurdu. ADU-nun Elmi Şurasının Məmməd Ələkbərova filologiya elmləri namizədi alimlik dərəcəsi verilməsi haqqında qərarı 1 iyul 1950 -ci ildə SSRİ Ali Attestasiya Komissiyası tərəfindən təsdiq olunur, ona MFL 00727 №-li elmlər namizədi diplomu verilir.


ПРЕЗИДИУМ ВЕРХОВНОГО СОВЕТА АЗЕРБАЙДЖАНСКОЙ ССР

*Заслуженному учителю школы Азербайджанской ССР*

Тов. Алекперову

Мамеду Гамид оглы

За заслуги в области народного образования

Президиум Верховного Совета Азербайджанской ССР

своим указом от 21 августа 1942 г.

присвоил Вам звание

**ЗАСЛУЖЕННОГО УЧИТЕЛЯ ШКОЛЫ АЗЕРБАЙДЖАНСКОЙ ССР**

Председатель Президиума Верховного Совета Азербайджанской ССР

Секретарь Президиума Верховного Совета Азербайджанской ССР

№ 180

23 сентября 1942 г.
г. БАКУ

*M.Ələkbərova "Azərbaycan SSR Əməkdar məktəb müəllimi" fəxri adının verilməsi haqqında sənəd*

Şüurlu həyatını millətin təhsil almasına, maariflənməsinə həsr edən Məmməd Ələkbərovun ictimai-siyasi və elm-pedaqoji fəaliyyəti yüksək qiymətləndirilib. Ona xalq maarifi sahəsindəki xidmətlərinə görə Azərbaycan SSR Ali Sovetinin 21 avqust 1942-ci il tarixli qərarı ilə "Azərbaycan SSR Əməkdar məktəb müəllimi" fəxri adı verilib.

Məmməd Ələkbərov Azərbaycan K(b)P MK-nın üzvü, Bakı şəhər sovetinin IV çağırış deputatı, Sov.İKP MK-nın XIX qurultayının nümayəndəsi olub. SSRİ-nin müxtəlif orden və medalları ilə təltif olunub.

Məmməd Ələkbərov 1959-cu ildə Bakı şəhərində vəfat edib.

### Ədəbiyyat


1. Azərbaycan Respublikası Təhsil Nazirliyi. Xalq Təhsili Muzeyi.f.167, siy.2, sax. vah. 209, 20 v
2. Azərbaycan Dövlət Elmi Tədqiqat Pedaqoji İnstitutu (1931-1981). Bakı, Maarif, 1981


***Məmməd Həmid oğlu Ələkbərov***



**ƏHMƏD YUSİF OĞLU SEYİDOV**
*pedaqoji elmlər doktoru, professor,*
*Əməkdar elm xadimi*
*(1882-1972)*

Əhməd Yusif oğlu Seyidov 1892-ci ildə mart ayının 31-də Gəncə quberniyasının Qazax qəzasının Aslanbəyli kəndində anadan olub. Seyid Nigari nəslindən olan atası Yusif öz yerlisi Xədicə xanımla ailə qurmuşdu. Əhmədin uşaqlıq illəri o qədər də fərəhli keçməmişdir. Beş yaşında ikən atasını itirmiş, anası Xədicə xanımın himayəsində yaşamışdır. O, övladının oxumasına hər cür şərait yaratmış, ev qayğılarından onu azad etmişdi. Əvvəlcə Hacı Mahmud Əfəndinin kənddə açdığı hücrədə yazıb-oxumağı öyrənən Əhməd Seyidov sonra təhsilini Əhməd Ağa Mustafayevin məktəbində davam etdirib. Əhməd Seyidov sonralar o günləri xatırlayaraq yazırdı: *"Əhməd ağa nəinki şagirdlərinə dərs verər, o, həm də uzaq kəndlərdən onun məktəbinə gələn uşaqları evində saxlayıb yedizdirərdi. Biz oxuduğumuz müddətdə bir dəfə də olsun ondan yersiz hərəkət, uca ton, pis münasibət görmədik. Onun şagirdlərinə mənəvi təsiri olduqca böyük idi. Əhməd ağa elə dərs keçirdi ki, o dərsə getməmək olmazdı."*

*Əhməd ağa Əhməd Seyidova ibtidai təhsil verməklə kifayətlənməmiş, onun gələcək həyat yolunun müəyyənləşməsində müstəsna rol oynamışdır.*

O, Xədicə xanımı inandıra bilmişdir ki, Əhməd çox qabiliyyətli uşaqdır, onun elmə həvəsi var, böyük gələcəyi üçün hökmən təhsilini davam etdirməlidir. Kasıblıq və imkansızlıq qadını sıxsa da övladının Qori Müəllimlər Seminariyasında oxumasına qərar verir. Qori Müəllimlər Seminariyasında ödənişli və ödənişsiz əsaslarla təhsil almaq mümkün idi. İmtahanları daha müvəffəqiyyətlə verənlər dövlət hesabına oxuya bilərdilər. Ödənişli şöbəyə daxil olan Əhməd Seyidov qəbuldan üç gün sonra yaxşı imtahan vermiş tələbə kimi ödənişsiz oxuyan tələbələr sırasına daxil edilir.

***Əhməd Yusif oğlu Seyidov***

1911-ci ildə Qori Müəllimlər Seminariyasına daxil olan Əhməd Seyidov 1917-ci ildə oranı 10 tələbə (Məiş Hüseynov, Qəzənfər Qəniyev, Yusif Qasımov, Yasin Miralıyev, Hüseyn Paşayev, Xosrov Şirinbəyov, Əliş Şəfiyev, Lətif Şahməmmədbəyov, Rzaqulu Şadlinski) ilə birgə bitirdi. Əhməd Seyidov Qori Müəllimlər Seminariyasının son buraxılışının məzunlarından idi. O, pedaqoji fəaliyyətə Aslanbəylidə öz evində məktəb açmaqla başlayır. Sonralar Osman Cəfərov yazırdı: *"Professor Seyidov təmiz qəlbli, geniş düşüncəli, gələcəyi yaxşı görə bilən, hamı üçün xeyirxah, düzgün yol göstərən şəxsiyyət olduğuna görə kəndimizin bütün camaatı Əhməd müəllimə inanır və onun dediklərinə əməl edirdilər. Ona görə də kənd sakinləri uşaqlarını hücrədən çıxarıb Əhməd müəllimin yeni tipli məktəbinə göndərdilər".*

Qısa bir müddətdə qabaqcıl bir müəllim kimi şöhrətlənən Əhməd Seyidov 1920-ci ildə Qazax xalq maarif şöbəsində kənd məktəbləri üzrə inspektor təyin olundu. 1921-1925-ci illərdə Aslanbəyli, Qaymaqlı, Musaköy və Kəmərlidə müəllim və məktəb direktoru işlədi. Qazax mahalında "Uçtel Əhməd" ləqəbi ilə tanındı. Onun bu fəaliyyəti sonralar İsmayıl Şıxlının "Dəli Kür" romanında öz bədii həllini tapdı.

1925-ci ilin sentyabrında Azərbaycan Respublikası Xalq Maarif Komissarlığı kollegiyasının qərarı ilə Əhməd Seyidov Lənkəran Qəza Xalq Maarif şöbəsinə müdir təyin olunur. 1926-1930-cu illərdə dəmir yolu məktəbləri üzrə inspektor vəzifəsində işləyir. Həmin dövrdə o, həm də Azərbaycan Dövlət Universitetində ali təhsil alır.

1930-cu ildə Azərbaycan Dövlət Universitetini bitirən Əhməd Seyidov elə həmin ildən Azərbaycan Dövlət Pedaqoji İnstitutunda əmək fəaliyyətinə başlayır. 1931-ci ildə Azərbaycan Elmi-Tədqiqat İnstitutunun aspiranturasına qəbul olunur, sonra Azərbaycan Elmi-Tədqiqat Pedaqoji Elmlər İnstitutuna (indiki Təhsil İnstitutu) köçürülür. Assistent kimi əmək fəaliyyətinə başlayan Əhməd Seyidov 1932-ci ildə ADPİ-nin pedaqogika kafedrasına dosent vəzifəsinə seçilir. 1934-1936-cı illərdə ADPİ-də Pedaqoji fakültənin dekanı vəzifəsində çalışır. Ə.Seyidov 1940-cı ildə V.İ.Lenin adına ADPİ-nin pedaqogika və psixologiya kafedrasının müdiri seçilmiş, 30 ildən artıq bir müddətdə həmin kafedraya rəhbərlik etmişdir. 1939-1943-cü illərdə əvəzçiliklə həm də S.M.Kirov adına Azərbaycan Dövlət Universitetində pedaqogika tarixi və nəzəriyyəsindən mühazirələr oxumuşdur.

1939-cu ildə S.M.Kirov adına Azərbaycan Dövlət Universitetində rektor C.Ələsgərovun sədrliyi, A.O.Makovelskinin elmi katibliyi ilə təşkil olunan Elmi Şurada "Abbasqulu ağa Bakıxanovun pedaqoji görüşləri" mövzusunda namizədlik dissertasiyası müdafiə edərək ilk azərbaycanlı pedaqoq-alim statusu qazanır. Namizədlik dissertasiyası professor A.O.Makovelski və pedaqoji

elmlər namizədi N.T.Ariskin tərəfindən yüksək qiymətləndirilir. Əhməd Seyidovun görkəmli Azərbaycan mütəfəkkiri Abbasqulu ağa Bakıxanovla bağlı namizədlik dissertasiyası yazmasının maraqlı tarixçəsi var.

XX əsrin 20-ci illərində və 30-cu illərinin əvvəllərində Azərbaycanda pedaqoji sahədə tədqiqatçılar pərakəndə yaradıcılıq axtarışları aparırdılar. Eyni müəllif həm pedaqogikanın tarixindən, həm nəzəriyyəsindən, həm də cari məsələlərdən yazırdı. Daha çox rus və Avropa pedaqoqlarının irsi araşdırılırdı. Prof.B.B.Komarovski Con Dyuinin, V.L.Arxarova Zeydelin, P.P.Fridolin İtaliya humanizm pedaqogikası nümayəndələrinin, Abdulkərim Əfəndiyev Jan Jak Russonun, Əhməd Kazımov Helvetsinin fəlsəfi, pedaqoji və etik görüşlərinə dair tədqiqatlar aparmışdı. Bu tədqiqatlar Azərbaycanda pedaqoji elmin təşəkkül prosesi keçirdiyi bir şəraitdə böyük metodoloji əhəmiyyət kəsb edirdi. Onların təsiri ilə Əhməd Seyidov da ingilis maarifçisi Con Lokkun pedaqoji fəaliyyəti ilə bağlı namizədlik dissertsiyası yazmağı qarşısına məqsəd qoymuşdu. Bu məqsədlə o, 4 çap vərəqi həcmində Con Lokkun pedaqoji irsi ilə bağlı maraqlı bir iş yazır, məsləhət almaq üçün Moskvaya gedir. Orada görkəmli rus pedaqoq-alimi akademik Y.M.Medinski ilə görüşür və işi ona təqdim edir. İşlə tanış olan Y.M.Medinski soruşur: “Axmed Yusifoviç, sizin millətiniz nədir?”

Əhməd Seyidov: azərbaycanlıyam - deyir. O yenə də “Sən millətini sevirsənmi?”- deyə Əhməd Seyidova müraciət edir. Əhməd Seyidov “bəli” deyərək onun üzünə təəccüblə baxır. Medinski söhbətinə davam edərək: “Axmed, Con Lokkun sahibləri var, özü də çoxdur. Bir də ki, ingilislər içərisində o qədər dərin elmi mühakiməyə malik olan alimlər bu mövzunu işləyiblər ki, bizə ancaq Con Lokk haqqında məqalə yazmağa yer qoyublar. Sual edirəm, bəs Azərbaycanın qabaqcıl adamlarını, onun fikir nümayəndələrini və onların pedaqoji görüşlərini kim işləməlidir? Bəs sənin xalqına xidmətin nədən ibarət olacaqdır?” Y.M.Medınski əlavə edir ki, Con Lokk haqqında yazdıqların çox yaxşıdır. Elmi işçinin gərək əsərləri olsun. Bir də ki, tədqiqatın yolunu öyrənmisən. Sənin üçün Azərbaycan mütəfəkkirlərini işləmək asan olacaq. İndi son məsləhətim budur. Get bax, gör tərbiyə haqqında hansı Azərbaycan klassiklərinin əsərlərində məktəblə bağlı fəaliyyəti, təlimlə əlaqədar fikirləri varsa, onlardan birini seç. Onun haqqında 10-15 səhifəlik referat yaz və mənə gətir. Ondan sonra səninlə danışa bilərəm. Bir də Con Lokk haqqında yazdıqlarını burada qoy. Oxuyum, bilmək istəyirəm fəlsəfi hazırlığın necədir və məsələlərə elmi təhlil verə bilirsənmi? Çünki yeni götürdüyün şəxsiyyətin də görüşlərini işləmək lazım gələcək . Əhməd Seyidov “Abbasqulu ağa Bakıxanovun pedaqoji görüşləri” mövzusunda dissertasiya yazmağı qərara alır. 25 səhifəlik referat yazıb yenidən Moskvaya gedir. Y.N.Medinski

Əhməd Seyidovun Abbasqulu ağa Bakıxanov haqqında yazdığı ilə tanış olaraq deyir: “Axmed Yusifoviç, bu Bakıxanov lap pedaqoqdur ki, indi başqa məsələ. Gedib dissertasiyanı başlaya bilərsən”. Həmin mövzu Pedaqoji Elmlər Akademiyasının Pedaqogikanın Nəzəriyyəsi və Tarixi Elmi-Tədqiqat İnstitutunda müzakirə olunur və təsdiq edilir. Nəticədə maraqlı bir əsər alınır. Əhməd Seyidov həmin əsərə görə 1940-cı ildə Kiyevdə keçirilən Ümumittifaq konfransında mükafata layiq görülür. Əhməd Seyidovun ilk pedaqoji elmlər namizədi olması bədxah və paxıl adamların yuxarı dairələrə imzasız məktub yazmalarına səbəb olur. Bu işdə ermənilər xüsusi fəallıq göstərirdilər. Həmin dövrdə “xalq düşməni” axtarışı “uğurla” davam etdirilirdi. Minlərlə günahsız insan, işıqlı zəka sahibləri qırmızı terrorun qurbanına çevrilirdi. Əhməd Seyidovu ittiham edirdilər ki, o, sovet pedaqogikasından deyil, çar generalı olmuş A.A.Bakıxanovdan dissertasiya yazıb. Onun məqsədi çar generallarını diriltməkdir. Bu, o dövrdə çox ağır ittiham idi. Azərbaycan KP MK anonim məktublara etinasız qalmırdı. M.C.Bağırovun xüsusi göstərişi ilə Mikayıl Rəfili, Heydər Hüseynov, Mirzə İbrahimov və Zülfəli İbrahimovdan ibarət komissiya yaradılır. Onlar əsəri diqqətlə oxuyaraq Mircəfər Bağırovun yanında sübut edirlər ki, əsər yüksək elmi səviyyədə yazılıb, ideoloji cəhətdən heç bir nöqsana yol verilməyib. Mircəfər Bağırovun “Nə üçün, sən başqasını yox, məhz Bakıxanovu götürmüsən” – sualına Əhməd Seyidov belə cavab verir: “Mən bir neçə Azərbaycan maarifpərvərini seçmişdim. Onları oxuduqdan sonra gördüm ki, Bakıxanovda tərbiyə məsələləri daha güclüdür. Onun bu sahədə “Nəsihətnamə” əsəri də var”. Mircəfər Bağırovun onun cavabından razı qalır və deyir, get işlə. O dövrdə A.A.Bakıxanovu, M.F.Axundovu, Seyid Əzimi, Sabiri, Zakiri xalq düşməni adlandıran bədxahlar Əhməd Seyidovu ideoloji sayıqlığını itirməkdə ittiham edirlər. Lakin Seyidov istəyindən dönmür, Azərbaycan pedaqoji fikrinin görkəmli nümayəndələri ilə bağlı tədqiqatlarını davam etdirir, Abbasqulu ağa Bakıxanovun, Mirzə Fətəli Axundovun, Seyid Əzim Şirvaninin, Mirzə Şəfi Vazehin, Həsən bəy Zərdabinin təhsil - tərbiyə ilə bağlı fikirlərini doktorluq dissertasiyası səviyyəsində tədqiq edir.

1947-ci ilin 11 dekabrında RSFSR PEA-nın Pedaqogikanın Nəzəriyyəsi və Tarixi Elmi-Tədqiqat İnstitutunda prof. N.A.Konstantinovun sədrliyi, prof. B.P.Yesipovun katibliyi ilə təşkil olunan Elmi Şurada “XIX əsrdə Azərbaycanda pedaqoji fikrin əsas nümayəndələri” mövzusunda doktorluq dissertasiyası müdafiə etdi. Dissertasiya rəsmi opponentlər Pedaqoji Elmlər Akademiyasının həqiqi üzvləri, professorlar Y.M.Medinski və N.A.Konstantinov, akademik A.O.Makovelski tərəfindən yüksək qiymətləndirildi. Elə həmin ilin iyul ayında Ali Attestasiya Komissiyası Əhməd Seyidovun yazdığı doktorluq dissertasiyasını təsdiq etmiş və ona professor elmi adı vermişdir. Bu

elmi fakt respublikada pedaqoji elmlərin inkişafında mühüm bir hadisə oldu, gənc elmi-pedaqoji kadrların yetişməsinə güclü təkan verdi. İlk azərbaycanlı pedaqoji elmlər doktoru və professoru kimi o, milli pedaqoji fıkrimizin bütöv bir mərhələsinin tarixinin yaradıcısı A.Bakıxanov, M.F.Axundov, M.Ş.Vazeh, S.Ə.Şirvani, H.Zərdabi, M.Füzuli, F.Köçərli, M.Ə.Sabir, C.Məmmədquluzadə haqqında fundamental və mötəbər tədqiqatların müəllifi kimi şöhrətləndi. Bu istqamətli tədqiqat pedaqoji fikrimizin öyrənilməsinə göstərilən ilk uğurlu təşəbbüs kimi tədqiqlərin ilkin mərhələsini şərtləndirməklə bərabər, bu sahədə aparılacaq araşdırmalar üçün nəzəri-metodoloji zəmin hazırladı.

17 yanvar 1944-cü ildə Azərbaycan SSR Maarif Komissarlığının əmri ilə Əhməd Seyidov V.İ.Lenin adına ADPİ-nin elmi işlər üzrə direktor müavini (prorektor), həmin ilin iyun ayında isə direktoru (rektoru) vəzifəsinə təyin edilir. İlk günlər “xalq düşməni” qorxusu ilə yaşayan Əhməd Seyidov o dövrdə maarif naziri vəzifəsində çalışan Mirzə İbrahimovun ADPİ-yə direktor olmaqla bağlı təklifini qəbul etmir və kommunist olmadığını bildirir. Mirzə İbrahimov həm Azərbaycan K(b)P MK, həm də DTK ilə razılaşaraq Əhməd Seyidovu Maarif Nazirliyinə çağıraraq deyir: “Əhməd, səni, ADPİ-yə direktor təyin etmək istəyirəm”. O, imtina etmək istəyəndə Mirzə İbrahimov deyir: “Əhməd, partiya, hökumət sənə etibar edir. İmtina etmək hökumətə etimadsızlıq göstərmək deməkdir”. Əhməd Seyidov Azərbaycan KP MK-nın bürosunda Mircəfər Bağırovun sədrliyi ilə keçən iclasda direktor vəzifəsinə təyin olunur. Büroda Mircəfər Bağırov deyir: “Görürəm seyidsən, get dua et ki, işlərin yaxşı getsin. Düz işlə, namusla çalış, dövlət malına xor baxma”.

O dövrdə Moskvada – Kremldə işləyən ermənipərəst qüvvələrin, xüsusilə də A.İ.Mikoyanın yaxından yardımı ilə XX əsrin 30-cu illərinin əvvəllərində Levon Mirzoyan Azərbaycanda sözü keçən simalardan birinə çevrildi. O, qısa zamanda bütün erməni millətçilərini ətrafına topladı. Bundan sonra respublikanın partiya, sovet, inzibati-təsərrüfat orqanlarında, maarif, elm, təhsil sistemində, o cümlədən ali məktəblərdə ermənilərin yüksək və məsul vəzifələrə “irəli çəkilməsi” prosesi başlandı. Bu xətt çox “incə metodlarla” və məkrlə həyata keçirilirdi. 1932-1933-cü dərs ilində ADPİ-nin bütün fakültələrində erməni şöbələrinin açılması bu “məkrli siyasətin” nəticəsi idi. Erməni şöbələrinin təşkili institutun tələbə və professor-müəllim heyəti tərkibində ermənilərin ildən-ilə artıb genişlənməsinə və möhkəmlənməsinə səbəb oldu.

1937-1938-ci illərin kütləvi repressiyaları zamanı ADPİ-nin kafedralarına rəhbərlik edən istedadlı və təcrübəli milli elmi-pedaqoji qüvvələrlə yanaşı, Azərbaycan xalqının tarixini və mədəniyyətini yüksək qiymətləndirən

görkəmli rus alimlərinin də bir qrupu sıradan çıxarıldı. İnstitutun kafedralarında məsul vəzifələrə ermənilər yerləşdirildi. 30-cu illərin sonu, 40-cı illərin əvvəllərindən başlayaraq bu proses sürətlə həyata keçirilməyə başlandı. Demək olar ki, ermənilər ADPİ-ni zəbt etmişdilər.

1946-ci ildə Azərbaycan KP MK-ya ADPİ-nin tədris və elmi həyatı ilə bağlı göndərilən hesabatı həyəcansız oxumaq mümkün deyil. Təsəvvür edin ki, ADPİ-də təhsil alan 1530 nəfər tələbənin 543 nəfəri azərbaycanlı, 583 nəfəri erməni, 236 nəfəri rus, 168 nəfəri digər millətin nümayəndələri olub.

Əhməd Seyidov direktor təyin olunduqdan sonra Nazirlər Sovetinin təsdiq etdiyi bölgü əsasında Maarif Nazirliyindən instituta qəbul planı daxil olur. Qəbul planında göstərilir ki, növbəti tədris ilində ADPİ-yə 30% azərbaycanlı, 60% erməni və 10% rus qəbul olmalıdır. Bu ədalətsiz bölgüyə etiraz edən Əhməd Seyidov onu aşağıdakı kimi düzəldir: instituta 70% azərbaycanlı, 15% erməni və 15% rus qəbul edilsin. Ermənilər qara yaxmaq, böhtan atmaq əməlləri ilə Seyidovu millətçi kimi aradan götürməyə çalışırdılar. Azərbaycan KP MK-ya, DTK-ya, rayon partiya komitəsinə şikayət edirlər. Əlacsız qalan maarif naziri Mirzə İbrahimov Əhməd Seyidovun Elmi-Tədqiqat Pedaqoji Elmlər İnstitutuna dəyişdirilməsinə çalışır. Əhməd Seyidov buna qəti etiraz edir. Məsələ Azərbaycan KP MK-nın bürosunda müzakirəyə çıxarılır. Problemdən xəbərdar olan Mircəfər Bağırov deyir: “Seyidov, nə üçün millətçilik edirsən?”. O qorxmadan cavab verir ki, Nazırlər Sovetindən instituta qəbulla əlaqədar belə bir kağız gəlmişdi ki, cari tədris ilində instituta 30% azərbaycanlı, 60% erməni və 10% rus qəbul olunsun. Mən belə hesab etdim ki, ermənilərin də bizim kimi respublikası var. Bizim məktəblərdə müəllim kadrları çatmadığı halda biz nə üçün ermənilərə kadr hazırlamalıyıq. Mən Nazirlər Sovetinin kağızındakı bu rəqəmin səhv olduğunu düşünüb 70% azərbaycanlı, 15% erməni və 15% rus qəbul olunması şəklində düzəliş etdim”. Bu faktı eşidən Mircəfər Bağırov hücum hədəfini Nazirlər Sovetinə yönəldir və Əhməd Seyidova deyir: “Kişi, qayıt APİ-yə, get öz bildiyin kimi işlə”. İnstituta qayıdan Əhməd Seyidov erməni fakültəsini ləğv edir, onu şöbəyə çevirir, vəzifədə olan xeyli ermənini azərbaycanlı ilə əvəz edir. Erməni şöbəsində Azərbaycan dilinin tədrisinə ayrılan saatların miqdarı artırılır. Əhməd Seyidov 1950-ci ilə qədər V.İ.Lenin adına ADPİ-nin direktoru (rektoru) vəzifəsində çalışır. Onun yalnız tədrisin təşkilində, pedaqoji kadrların milliləşdirilməsindəki fəaliyyəti deyil, bina uğrunda apardığı mübarizə və mücadilə də əsl fədakarlıq nümunəsidir. Bir gün Əhməd müəllimə məlumat verilir ki, institutda (İnstitut onda "Səadət Sarayı"nda yerləşirdi - R.F.) 3 nəfər naməlum şəxs gəzir, məqsədləri binanın 3 otağını almaqdır. O, həmin adamları yanına çağırır, məzəmmət edərək deyir ki, tələbələri

yerləşdirməyə, dərs keçməyə yerimiz yoxdur, siz də otaq istəyirsiniz. Heç bir otaq verə bilmərik. Gələnlər çıxıb düz M.C.Bağırovun yanına gedirlər. M.C.Bağırov maarif naziri Mirzə İbrahimova zəng edib deyir ki, Seyidov sabah saat 12-də sənin yanında olsun. Onunla danışmaq istəyirəm. Mirzə İbrahimov pərişan halda axşam Əhməd müəllimə zəng edir: "Ay Əhməd, bu nədir? Dövlət adamlarını pis qarşılamısan. Bağırov sabah səni saat 12-də telefona çağırır. Səhər mənim yanımda ol". Həm Əhməd müəllim, həm ailə üzvləri, həm də Mirzə İbrahimov böyük təlaş keçirir. O dövrdə hamı Bağırovun qəzəbinə düçar olmağın nə ilə qurtaracağını yaxşı bilirdi. Səhərisi



*Soldan:prof.Hüseyn Əhmədov, prof.Əhməd Seyidov, dos.Əyyub Tağıyev, dos.Ənvər Məmmədov, dos.İsa Musayev*

gün Əhməd müəllim Mirzə İbrahimovun kabinetində oturub həyəcanla zəng gözləyir. Saat 12-də dövlət telefonu çalınır. Dəstəyi Mirzə İbrahimov götürür. Bu, Bağırov idi. Seyidov ordadırmı? Mirzə İbrahimov sakitcə dəstəyi Əhməd müəllimə verir. Bağırov telefonda "Yoldaş Seyidov, bizim adamları qovmusunuz". Əhməd müəllim qayıdır ki, yox, yox, yoldaş Bağırov, qovmamışam. İstəyir ki, izahat versin. Bağırov onun sözünü kəsərək deyir: "Yaxşı etmisən, əsl sahib öz evinin qədrini bilməlidir. Zaqafqaziya dəmir yolu Həmkarlar İttifaqı bizim respublikada fəaliyyət göstərəcək. Bu respublikamız üçün şərəfdir. Xahiş edirəm, onlara 3 otaq ayır. Söz verirəm ki, müharibə qurtarandan sonra ADPİ-nin binasını sizə verəcəyəm. Dua et ki, müharibə tez qurtarsın". Bağırov

bununla Seyidovun seyidliyinə işarə edirdi. Əhməd Seyidovun oğlu prof. Fikrət Seyidov danışırdı ki, bir neçə təşkilat, xüsusilə də Tibb İnstitutu binanı almaq istəyirdi. Burada hərbi hospital fəaliyyət göstərirdi. Tibb İnstitutunun ölüxanasının binanın həyətində yerləşməsi onlara əlavə problem yaradırdı. Tibb İnstitutu binanın boşaldılmasını gözləyirdi. Bakıda o zaman ali məktəb üçün 2-ci belə bir gözəl bina yox idi. Müharibədən bir müddət sonra hərbi hospitalı binadan köçürtdülər. Bu binada gözü olanlar hərəkətə gəldilər. O zaman Azərbaycanda yüksək vəzifəlilərin və tanınmış insanların uşaqları Tibb İnstitutunda oxuyurdular. Onların hamısı ADPİ-nin binasının Tibb İnstitutuna verilməsinin tərəfdarı idilər. Əsas dəlil də bu idi ki, ADPİ-nin həyətində Tibb İnstitutunun ölüxanası var. İndiki vəziyyətlə onu heç yerə köçürmək olmaz. Əhməd Seyidov öz həyatını təhlükəyə ataraq APİ-nin binası uğrunda mübarizə aparırdı, binanı heç kəsə güzəştə getmək fikrində deyildi. Baxmayaraq ki, oğlu Tibb İnstitunun tələbəsi idi. Bina ilə bağlı Əhməd



*Prof .Əhməd Seyidov Ümumi pedaqogika kafedrasının iclasında*

Seyidovu Azərbaycan KP MK-nın büro iclasına çağırırlar. Büro iclasını aparan MK-nın II katibi Teymur Yaqubov böyük bir hospitalın Bakıdan köçdüyünü bilidirir. Boşalmış bina ilə bağlı büro üzvlərinin fikirlərini soruşur. Əvvəlcədən öyrədilmiş adamlar binanın Tibb İnstitutuna verilməsini təklif edirlər. Elə bu vaxt Bağırovun katibəsi Novikova qapıdan Ə.Seyidova bir kağız verir. Orada yazılmışdı: “Yoldaş Seyidov, Bağırov Moskvaya gedəndə mənə dedi ki, sizə çatdırım ki, sizin razılığınız olmadan binanı heç kəsə verə bilməzlər”. Ə.Seyidov dillənmir. Onu heyrətləndirən M.C.Bağırovun dəyanəti idi. Ə.Seyidovun dillənmədiyini görən T.Yaqubov “Siz nə deyirsiniz?”- deyə, ondan soruşur. O da cavabında qayıdır ki, “Siz katibsiniz, verirsiniz verin, ancaq mən razı deyiləm”. Bu həlledici kəlməni eşidən Yaqubov hirslənərək:

“Siz bilirsinizmi hardasınız?” Ə.Seyidov deyir: “Bəli, bilirəm, hirslənmək nə üçün? Siz vəzifə sahibisiniz. Verirsiniz, verin. Ancaq bu bina Pedaqoji İnstitutun olduğu üçün binanın ona da verilməsinə razıyam”. Ə.Seyidovun “razı deyiləm” sözü T.Yaqubovu özündən çıxartmışdı. Bütün bunlara baxmayaraq o, Bağırovun qorxusundan binanı Tibb İnstitutuna verə bilmədi və beləliklə də bina Pedaqoji İnstituta qaldı. Ə.Seyidovun inadkarlığı ona baha başa gəldi, saxta ittihamlarla onu direktor vəzifəsindən uzaqlaşdırdılar.



*Ümumi pedaqogika kafedrasının müdiri prof.Əhməd Seyidov*

1950-ci ildə yenidən Ə.Seyidov V.İ.Lenin adına ADPİ-nin pedaqogika kafedrasının müdiri vəzifəsinə təyin olunur. Kafedranın sonrakı inkişafı, pedaqoji və elmi-pedaqoji kadr hazırlığı mərkəzinə çevrilməsi onun adı ilə bağlıdır. Əgər XX əsrin 30-cu illərinin əvvəllərində kafedrada 1 professor (B.B.Komarovski), 3 dosent (Ə.Hacıyev, M.Rəhimli, Ə.K.Zəkuzadə), 7 assistent (M.Mehdizadə, Ə.Əfəndiyev, İ.Əfəndiyev, Q.Əsgərov, Ə.Seyidov, R.Əfəndiyev, G.Qədimbəyova), 1 laborant (M.Tahirli) fəaliyyət göstərirdisə, sonrakı illərdə həm kafedra əməkdaşlarının, həm də elmi dərəcəlilərin sayı artmış, tərkibi keyfiyyətcə və kəmiyyətcə yüksəlmişdir. Həmin illərdə pedaqogika kafedrasının elmi fəaliyyətinin əsas istiqamətlərindən biri namizədlik və doktorluq dissertasiyaları hazırlamaqdan ibarət olmuşdur. Bu istiqamətdə aparılan işlər ali məktəblər üçün yüksək ixtisaslı müəllimlərin və tədqiqatçı alimlərin hazırlanması baxımından mühüm əhəmiyyət kəsb edirdi. Əhməd Seyidov kafedraya müdir təyin ediləndə burada 3 nəfər elmlər

doktoru, professor (Ə.Y.Seyidov, M.M.Mehdizadə, Ə.K.Zəkuzadə), 6 elmlər namizədi, dosent (M.Ə.Muradxanov, T.Y.Əfəndiyev, D.M.Mustafayeva, Ş.S.Ağayev, İ.İ.Vəlixanlı, A.K.Abdullayeva), 3 elmlər namizədi, baş müəllim (Ə.S.Tağıyev, Q.K.Qasımzadə, S.M.Babayeva) çalışırdı. Prof.Ə.Seyidov 1973-ci ilə qədər həmin vəzifədə çalışır. 1973-cü ilin 1 sentyabrında öz ərizəsi ilə kafedra müdiri və professor vəzifəsindən azad edilir, kafedrada professor-məsləhətçi vəzifəsinə keçirilir.

Azərbaycanda məktəb və pedaqoji fikir tarixinin tədqiqi sahəsində elmi məktəb yaradan prof. Ə.Seyidov təlim və tərbiyə nəzəriyyəsinin mühüm problemləri ilə bağlı araşdırmalar aparmış, 200-ə yaxın kitab, kitabça, monoqrafiya və elmi məqalə nəşr etdirmişdir. Ə.Y.Seyidov "Türk əlifbası" (H.Sanılı ilə birlikdə) (1927), "Kitab üzərində necə işləməli”"(1946), "Pedaqogika tarixi" (1959-1960; 1968), "Azərbaycanda pedaqoji fikrin inkişaf tarixindən" (1958), "Azərbaycanda pedaqoji fikrin inkişaf tarixindən" (1987), "Pedaqogika və psixologiya terminləri lüğəti"nin (1956,1958), Moskvada nəşr olunan 4 cildlik “Pedaqoji ensiklopediya”nın, 2 cildlik "Pedaqoji lüğət"in, "SSRI xalqlarının məktəb və pedaqoji fikir tarixi oçerkləri" adlı çoxcildlik monumental əsərlərin əsas müəlliflərindən biri olmuş, "Sovetskaya pedaqogika" jurnalında müntəzəm çıxış etmiş, xalqımızın pedaqoji fikir korifeylərinin pedaqoji irsinin təbliğində böyük əmək sərf etmişdir.

17 oktyabr 1946-cı ildə Azərbaycan Elmi-Tədqiqat Pedaqogika İnstitutunun Elmi Şurasında Camo Cəbrayılbəyli, Əbdüləzəl Dəmirçizadə, Boris Borisoviç Komarovski ilə birlikdə Əhməd Seyidovun da RSFSR Pedaqoji Elmlər Akademiyasının həqiqi üzvlüyünə namizədliyi müzakirə olunmuş və bununla bağlı qərar qəbul olunmuşdur.

Ə.Seyidovun fəaliyyətində elmi - pedaqoji kadr hazırlığı xüsusi yer tutur. Onun rəhbərliyi və opponentliyi ilə 70-ə qədər pedaqoji elmlər namizədi yetişmişdir. O, həm də Şimali Qafqaz, Orta Asiya respublikaları üçün elmi - pedaqoji kadr hazırlığında yaxından iştirak etmişdir. Pedaqoji elmlər doktorları, professorlar - Hüseyn Əhmədov, Nurəddin Kazımov, Yusif Talıbov, Əliheydər Həşimov, Sərdar Quliyev, professorlar Sabir Şəfiyev və İramin İsayev, dosentlər - Əyyub Tağıyev, Bəxtiyar Abdullayev, İsa Musayev, Həmzə Əliyev, Hacı Novruzov, Əhməd Əhmədov, Ədalət Cəlilov, Sabir Orucov, Əminə Hüseynova, Allahverdi Eminov və b. Əhməd Seyidovun yetirmələridir.

Professor Ə.Seyidovun elmi - pedaqoji fəaliyyəti dövlət tərəfindən yüksək qiymətləndirmişdir. O, 1 may 1944-cü ildə “Qafqazı müdafiəyə görə”, 5 iyun 1945-ci ildə “1941-45-ci illərdə əmək igidliyinə görə” medalı, 23 fevral 1960-cı ildə Azərbaycan SSR və Azərbaycan KP-nin 40 illiyi münasibətilə respublikanın xalq təsərrüfatının və mədəniyyətinin inkişafı sahəsindəki

xidmətlərinə görə Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin Fəxri fərmanı, 12 noyabr 1960-cı ildə "Qırmızı Əmək Bayrağı" ordeni, 29 iyun 1964-cü ildə respublika iqtisadiyyatının və mədəniyyətinin inkişafındakı xidmətlərinə görə Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin Fəxri Fərmanı, 31 mart 1970-ci ildə V.İ.Leninin anadan olmasının 100 illiyi münasibətilə "Əmək igidliyinə görə" medalı, 2 mart 1978-ci ildə respublikada müəllim kadrları hazırlanmasında səmərəli fəaliyyətinə görə və ADPİ-nin 50 illiyi ilə əlaqədar olaraq Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin Fəxri fərmanı ilə, 31 dekabr 1976-cı ildə "Əmək veteranı" medalı ilə, 24 fevral 1977-ci ildə "SSRİ maarif əlaçısı" döş nişanı ilə təltif olunmuşdur.

Prof.Əhməd Seyidov 1969-cu ildə Azərbaycan SSR Ali Soveti Rəyasət heyəti tərəfindən Əməkdar elm xadimi fəxri adına layiq görülmüşdür.

Prof. Əhməd Yusif oğlu Seyidovun adı məktəb və pedaqoji fikir tarixinə ilk azərbaycanlı pedaqoq-alim, Zaqafqaziyada pedaqoji fikir tarixinin tədqiqi sahəsinin pioneri kimi daxil olmuşdur.

Prof. Əhməd Seyidov 1977-ci ilin 1 oktyabrında dünyasını dəyişmişdir.

## Ədəbiyyat


1. ADPU-nun Arxivi. Əhməd Yusif oğlu Seyidovun şəxsi işi. № 6284
2. Azərbaycan Respublikası Prezidentinin İşlər İdarəsi Siyasi Sənədlər Arxivi.f.1.,saxlama siyahısı 31, iş 432 (Ə.Seyidovun RSFSR Pedaqoji Elmlər Akademiyasının həqiqi üzvlüyünə namizədliyinin müzakirəsi).
2. Əhmədov H. Pedaqogika elminin görkəmli tədqiqatçısı // "Azərbaycan məktəbi" jurnalı, 1988, №1, s.58-62
3. Rüstəmov F. Azərbaycan pedaqoji fikir tarixinin ilk tədqiqatçısı // Dil və ədəbiyyat, Bakı, 1999, № 1, s. 130-133
4. Rüstəmov F. Pedaqogika kafedrasının tarixi: sələflər və xələflər. Bakı, Nasir, 1999
5. Rüstəmov F. Pedaqoji oçerklər: sələflərim və müasirlərim. Bakı: Elm və təhsil, 2010
6. Eminov A. Əhməd Seyidov fenomeni. Bakı, 2003
7. Musayev İ. Sovet Azərbaycanının böyük pedaqoqu // "Azərbaycan məktəbi" jurnalı, 1982, №8, s. 44-47s
8. Seyidov Əhməd. Biblioqrafiya (tərtib edəni H.Musayev). Bakı, 1990
9. Seyidov F. Aslanbəylidən başlanan xatirələr. Bakı, 2000
10. Məmmədova A. Professor Əhməd Seyidov və Azərbaycanda pedaqoji elmin inkişafı. Bakı, Elm və təhsil, 2018


***Əhməd Yusif oğlu Seyidov***



**CƏFƏR ZEYNAL OĞLU HACIYEV**
**(Cəfər Xəndan)**
*filologiya elmləri doktoru, professor*
*(1910-1961)*

Cəfər Xəndan Zeynal oğlu Hacıyev 1910-cu ilin 8 mayında İrəvan şəhərində anadan olub. 1918-ci ildə İrəvan şəhərində ermənilərin fitnə-fəsadından qorunmaq məqsədilə ailəsi ilə birlikdə Gəncəyə köçüb. Gəncədə balaca Cəfərin həm atası, həm də anası vəfat edib. O, kiçik qardaşı Rəşid və azyaşlı bacısı Leyla ilə 1922-ci ilədək Gəncə uşaq evində yaşayıb. Oxumaqla bağlı dövlətin yaratdığı şəraitdən istifadə edərək Gəncə Pedaqoji Texnikumuna daxil olub. 1925-ci ildə orta ixtisas pedaqoji təhsilini başa vuran Cəfər Hacıyev ali təhsil almaq məqsədi ilə Bakıya gəlib, Ali Pedaqoji İnstitutun Filologiya fakültəsinə daxil olub. Tələbəlik illərində ali təhsil almaqla yanaşı, həm də fəhlə fakültəsində müəllimlik (1925-1929) edib. Ali Pedaqoji İnstitut ADU-ya birləşdirildiyindən Cəfər Hacıyev 1930-cu ildə universiteti bitirib. Azərbaycan Dövlət Universiteti ləğv edildiyindən aspirantura təhsilini Ali Pedaqoji İnstitutunda alıb. 1933-cü ildə Ali Pedaqoji İnstitutda aspirantura şöbəsi yaradılıb. ADPİ üzrə 7 mart 1933-cü il tarixli əmrlə instituta 25 nəfər aspirant qəbul edilib. Ədəbiyyat üzrə qəbul edilən 5 nəfər aspirantdan (Mir Cəlal, Əhliman Axundov, Həmid Araslı və b.) biri də Cəfər Hacıyev olub.

Cəfər Hacıyevin həm elmi, həm pedaqoji fəaliyyətinin ilkin mərhələsi Ali Pedaqoji İnstitutla bağlı olmuşdur. O,1932-1941-ci illərdə Azərbaycan Dövlət Pedaqoji İnstitutunda assistent, müəllim, dosent, kafedra müdiri işləyib, həmçinin ədəbi prosesdə fəal iştirak edib, "Ədəbiyyat qəzeti"nin məsul katibi, "Gənc işçi" qəzetinin ədəbiyyat şöbəsinin müdiri vəzifələrində çalışıb. 1938-ci ildə Azərbaycan Yazıçılar İttifaqına üzv qəbul edilib.

Cəfər Hacıyev M.F.Axundov adına Müəllimlər İnstitutunda dil və ədəbiyyat fakültəsində dekan, Azərbaycan Milli Elmlər Akademiyasının Dil

və Ədəbiyyat İnstitutunda şöbə müdiri, eyni zamanda Azərbaycan Yazıçılar birliyində təşkilat katibi kimi fəaliyyət göstərib. 1939-cu ildə dissertasiya müdafiə edərək filologiya elmləri namizədi alimlik dərəcəsi alıb. Həmin ildə orta məktəb şagirdləri üçün "Azərbaycan ədəbiyyatı (sovet dövrü)" dərsliyini nəşr etdirib. 1940-cı ildə Azərbaycan ədəbiyyatşünaslığında M.Ə.Sabirin həyat və yaradıcılığına həsr olunmuş "Sabir (həyat və yaradıcılığı)" adlı kitabı çapdan çıxıb.

1941-ci ildə sovet-alman müharibəsinin başlanması ilə əlaqədar olaraq səfərbərliyə alınmış, sovet ordusu sıralarında siyasi rəhbər və jurnalist kimi alman işğalçılarına qarşı vuruşmuşdur. O, 1944-1946-cı illərdə Cənub-Qərb, Şimali Qafqaz, Zaqafqaziya cəbhələrində siyasi şöbənin baş təlimatçısı, cəbhə qəzetlərində məsul redaktorun müavini olmuşdur.

Cəfər Xəndanın 1944-1946-cı illərdə Təbrizdə "Vətən yolunda" qəzetində çalışması, bu qəzetdə Cənubi Azərbaycan ədəbiyyatının müxtəlif dövrlərinin nümayəndələri haqqında əhəmiyyətli məqalələr çap etdirməsi onun ədəbi tərcümeyi-halının vacib səhifələrindən biridir. O, 1944-1946-cı illərdə Təbriz şairlər məclisinin fəal iştirakçılarından biri olub, "Vətən yolunda", "Şəfəq", "Qızıl siniflər" və digər qəzet və jurnallarda o taylı bu taylı Azərbaycanımızın ədəbiyyatı haqqında yazılar dərc etdirib.

Cəfər Xəndan XX əsr Cənubi Azərbaycan ədəbiyyatının ən məşhur tədqiqatçılarından olub. 1947-ci ildə "1906-1946-cı illərdə Cənubi Azərbaycan xalqının milli azadlıq mübarizəsi və onun ədəbiyyatda inikası" mövzusunda doktorluq dissertasiyası müdafiə edərək filologiya elmləri doktoru alimlik dərəcəsi alıb.1949-cu ildə elmi-pedaqoji fəaliyyətinə görə professor elmi adına layiq görülüb.

Cəfər Xəndan 1948-1950-ci illərdə Azərbaycan Dövlət Pedaqoji İnstitutunun direktoru, 1950-1954-cü illərdə Azərbaycan Dövlət Universitetinin rektoru, 1952-1961-ci illərdə isə həmin universitetin Azərbaycan ədəbiyyatı tarixi kafedrasının müdiri vəzifələrində işləyib. Onun elmi rəhbərliyi ilə 30 nəfər filologiya üzrə elmlər doktoru və namizədi yetişib.

C.Xəndan çox zəngin elmi və bədii yaradıcılığa malikdir. Onun "XX əsr Azərbaycan ədəbiyyatı" (1951), 2 hissəlik "Sovet ədəbiyyatı" (1952), "Cəfər Cabbarlının həyat və yaradıcılığı" (1954), "XX əsr Azərbaycan ədəbiyyatı tarixi oçerkləri" (1955), "Mikayıl Müşfiq" (1956), "Molla Nəsrəddin" (1956), "Mir Cəlal" (1958), "M.Ə.Sabir haqqında" (1958), "Şairin həyatı" (1961), "Sabir yaradıcılığının sənətkarlıq xüsusiyyətləri" (1962) adlı kitabları çapdan çıxıb. Professor Cəfər Xəndan 3 cildlik "Azərbaycan ədəbiyyatı tarixi"nin (1957) üçüncü cildinin müəlliflərindən biri olmuşdur. Bu əsərlərində o, Azərbaycan ədəbiyyatı tarixinin bütün dövrlərini, bütün inkişaf mərhələlərini

araşdırıb, hər dövrdə, hər mərhələdə hər bir Azərbaycan klassikinin yaradıcılığında müasirliyə xidmət edə biləcək məqam axtarıb, onu dəyərləndirərək, qələm yoldaşlarına bir növ nümunə göstərib. O, şair, tənqidçi, tərcüməçi kimi də maraqlı bir yaradıcılıq yolu keçib. O, "Bəyaz gecələr" (1936), "Cəbhə şeirləri" (1942), "Qafqaz" (1942), "İlk ayrılıq" (1944), "Mübarizə yollarında" (1946) kimi kitablarında toplanmış şeir və poemaları ilə oxucuların estetik zövqünün formalaşmasında, insanların mənəvi dünyasının yetkinləşməsində iştirak edib. C.Xəndanın fars dilindən Azərbaycan dilinə yüksək poetik tərcümələrini əhatə edən Nizami Gəncəvinin "Lirika" (1940), M.F.Axundovun "A.S.Puşkinin ölümünə Şərq poeması" (1962), Heyran Xanımın "Qəzəllər" (1975) kitabları geniş oxucu kütləsi, ədəbiyyat, sənət və elm adamları tərəfindən böyük maraq və məhəbbətlə qarşılanıb. Bu tərcümələr Azərbaycan tərcümə sənətinin tarixində olduqca mühüm yer tutmaqdadır.



*Akademik Akif Hacıyev*

C.Xəndanın ictimai-siyasi, pedaqoji fəaliyyəti və elmi-bədii yaradıcılığı fəaliyyəti dövlət tərəfindən yüksək qiymətləndirilib. O, "Qırmızı ulduz" (1942), "Qırmızı Əmək Bayrağı" (1946) ordenləri, "Qafqazın müdafiəsinə görə", "Almaniya üzərində qələbəyə görə" medalları, müxtəlif Fəxri fərman və hədiyyələrlə mükafatlandırılıb.

Cəfər Xəndan 1961-ci ilin avqustun 10-da Bakıda vəfat etmişdir. Bakı şəhərindəki küçələrdən biri onun adını daşıyır.

Cəfər Xəndan XX əsr elm, ədəbiyyat və mədəniyyət tariximizdə öz yerini əbədiləşdirib. O, istər ictimai xadim, istərsə də görkəmli elm xadimi kimi adını Azərbaycan dövlətçiliyi tarixinə yazmış insandır. Onun anadan olmasının



*Rəfiq Zəka Xəndan*

***Cəfər Zeynal oğlu Hacıyev***

100 illiyi dövlət səviyyəsində qeyd edilib, BDU-da, ADPU-da yubiley tədbirləri keçirilib, hər iki təhsil müəssisəsində "Cəfər Xəndan auditoriyası" açılıb. Cəfər Xəndanın böyük övladı akademik Akif Hacıyev (1937-2015) tanınmış riyaziyyatçı alim, Əməkdar elm xadimi, AMEA -nın vitse-prezidenti (2013-2015), Fizika-Riyaziyyat və Texnika Elmləri Bölməsinin akademik-katibi (2001-2015), Riyaziyyat və Mexanika İnstitunun direktoru (2004-2013) olmuşdur. Ortancıl oğlu Rəfiq Zəka Xəndan (1939-1999) tanınmış yazıçı, şair, ssenarist, Azərbaycan Dövlət Mükafatı laureatı, Əməkdar incəsənət xadimi idi. Kiçik oğlu filologiya elmlər doktoru, professor Aqil Hacıyev (1947-2019) BDU-nun Təbiət fakültələri üçün rus dili kafedrasının müdiri (1982-1984), Rus ədəbiyyatı kafedrsının müdiri (1984-1990), Filologiya fakültəsinin dekanı (1990-1992) vəzifələrində çalışıb. Müxtəlif illərdə Ali Attestasiya Komissiyasının eksperti, AAK-da Humanitar və ictimai şöbənin müdiri, Tələbə Qəbulu üzrə Dövlət Komissiyasında Ekspert şurasının sədri olub.



*Prof. Aqil Hacıyev*

## Ədəbiyyat


1. Cəfər Xəndan Hacıyev.Biblioqrafiya.Bakı, BDU,2010
2. Tofiq Hüseynoğlu. Cəfər Xəndan – böyük alim, unudulmaz müəllim. "525-ci qəzet". 19 may 2010-cu il
3. Əsgər Əsgərov. Cəfər Xəndan dünyası, yaxud unudulan bir rubrikanın işığında. "525-ci qəzet". 6 yanvar 2016-cı il
4. Novruzov T. Cəfər Xəndan Hacıyev: həyatı və yaradıcılıq yolu.Bakı, Elm və təhsil, 2012
5. Cəfər Xəndan.https://az.wikipedia.org/wiki/


***Cəfər Zeynal oğlu Hacıyev***



**MEHDİ MƏMMƏD OĞLU MEHDİZADƏ**

*SSRİ PEA-nın həqiqi üzvü, pedaqoji elmlər doktoru, professor, Əməkdar elm xadimi (1903-1984)*

Mehdi Məmməd oğlu Mehdizadə 5 yanvar 1903-cü ildə Cəbrayıl qəzasının Daşkəsən kəndində anadan olub. İlk təhsilini kəndlərində 1914-cü ildə açılan rus-tatar (Azərbaycan) məktəbində alıb. Təlim rus dilində olan həmin məktəbə qəbul olunanda onun 11 yaşı var idi. 1919-cu ildə həmin məktəbi bitirən Mehdi Mehdizadə əmək fəaliyyətinə kənd qiraət komasının müdiri kimi başlayıb.1920-ci ildə Azərbaycanda ictimai-siyasi vəziyyətin dəyişməsi, bolşeviklərin hakimiyyətə gəlməsi, məktəbyaşlı uşaqların təhsilə cəlb edilməsi sahəsində mühüm dəyişikliklərə səbəb oldu. Mədəni inqilabın həyata keçirilməsi yeni yaranmış dövlətin əsas hədəflərindən biri idi. Mədəni inqilabı həyata keçirə biləcək savadlı adamlar, müəllimlər çox az idi. Qəzalarda vəziyyət daha acınacaqlı idi. Bu səbəbdən də hökumət qəza mərkəzlərində müəllim hazırlamaq məqsədilə qısamüddətli pedaqoji kurslar açılmasına göstəriş vermişdi. Bu imkandan bəhrələnərək Cəbrayıl qəza mərkəzindəki altıaylıq pedaqoji kursu bitirənlərdən biri də Mehdi Mehdizadə oldu. O, doğma kəndlərindəki I dərəcəli məktəbdə (ibtidai məktəbdə) müəllim işləməyə başlayır, məktəbyaşlı oğlan və qızları təhsilə cəlb edir. Ciddi mütaliə edir, ibtidai təhsil sahəsindəki yenilikləri öyrənir və öyrədir. 1923-cü ildə Azərbaycan Xalq Maarif Komissarlığının inspektoru, görkəmli maarif xadimi Cavad Cuvarlı Mehdi Mehdizadənin işlədiyi məktəbdə yoxlama aparır, şagirdlərin təlim uğurlarının şahidi olur. Qəza məktəblərindən yaxşı işinə görə 6 nəfər gənc müəllim mükafatlandırılır ki, onlardan biri də Mehdi Mehdizadə olur. Birinci dərəcəli məktəbdə müəyyən pedaqoji təcrübə qazanan, şəxsi mütaliəsi hesabına nəzəri hazırlığı ilə seçilən Mehdi Mehdizadə ali pedaqoji təhsil almaq arzusuna düşür. 1923-cü ilin mayında

Cəbrayıl qəzasından Bakıya üç aylıq ali pedaqoji kursa göndərilən yeddi nəfərdən biri də Mehdi Mehdizadə olur. Pedaqoji kursu bitirdikdən sonra, o, Qəza Xalq Maarif Şöbəsinin göndərişi ilə Azərbaycan Ali Pedaqoji Kişi İnstitutunun hazırlıq kursuna göndərilir. 1924-cü ildə hazırlıq kursunu uğurla başa vurur, imtahan verərək institutun fizika-riyaziyyat fakültəsinə qəbul edilir. Ali təhsilini uğurla başa vuran Mehdi Mehdizadə fizika-riyaziyyat müəllimi kimi Cəbrayıl Qəza Xalq Maarif Şöbəsinin sərəncamına göndərilir. O, Qaryagin (indiki Füzuli) şəhərindəki ikinci dərəcəli məktəbə fizika-riyaziyyat müəllimi təyin olunur. Müəllimlik fəaliyyəti ilə yanaşı, qəza metod mərkəzinə sədrlik də rəsmi olaraq ona tapşırılır. Qəza məktəblərində ümumpedaqoji və metodik işlərin aparılmasında, müəllimlərin pedaqoji fəaliyyətinin səmərəliliyinin yüksəldilməsində bilik və bacarığını əsirgəmir. O, qəza metodik mərkəzinə böyük həvəs və məharətlə rəhbərlik edir, ibtidai məktəblərin yeni proqramları, təlim metodları, məktəbin həyatla əlaqəsi və digər aktual pedaqoji problemlərlə bağlı göstərişləri ilə qəza müəllimlərinin işinə metodik yardım göstərir. Həmin illərdə qəza xalq maarif şöbəsində olduğu kimi, Respublika Xalq Maarif Komissarlığında da Mehdi müəllimin pedaqoji və ictimai fəaliyyəti yüksək qiymətləndirilir. Ona görə də Bakıya işə dəvət olunur. 1930-cu ilin martında Mehdi Mehdizadə Azərbaycan Xalq Maarif Komissarlığının İctimai Tərbiyə Baş İdarəsinin elmi katibi və Xalq Maarif Komissarının birinci müavini Ayna Sultanovanın köməkçisi vəzifəsinə təyin olunur. O, bu vəzifədə cəmi bir il işləyir. Elmi yaradıcılığa meyil göstərən Mehdi Mehdizadə 1931-ci ildə SSRİ Elmlər Akademiyasının Azərbaycan filialı nəzdində təşkil edilmiş aspiranturaya (pedaqogika ixtisası üzrə) qəbul olunur, bir il sonra Azərbaycan Elmi-Tədqiqat Pedaqogika İnstitutunun aspiranturasına köçürülür. Elə həmin vaxtdan Azərbaycan Dövlət Pedaqoji İnstitutunda elmi-pedaqoji fəaliyyətə başlayır, pedaqogika tarixinə, təlim-tərbiyə məsələlərinə aid məqalələrlə dövri mətbuatda çıxış edir. Pedaqogika ixtisası üzrə aspiranturanın ilk məzunlarından biri olan Mehdi Mehdizadə 1934-cü ildə Azərbaycan Dövlət Pedaqoji İnstitutunda yeni təşkil edilən Pedaqoji fakültənin dekanı vəzifəsinə təyin edilir. Bir illik səmərəli elmi-pedaqoji fəaliyyət və idarəetmə qabiliyyəti onun daha məsul vəzifəyə irəli çəkilməsinə səbəb olur. 31 yaşlı gənc müəllim ADPİ-nin elmi işlər üzrə direktor müavini vəzifəsinə təyin olunur. O, 1934-1937-ci illərdə bu məsul vəzifədə çalışır. Həmin illər ölkə üçün də, institut üçün də olduqca ağır illər idi. Repressiya maşını tüğyan edirdi, irəli çəkilmə, işdən çıxarılma, həbs və ya sürgün edilmə adi hala çevrilmişdi. Üç il müddətində institutda rəhbərlik dörd dəfə dəyişdirilmiş, Mirzə Məmmədov, Davud Rəsulzadə, Hüseyn Musayev, Aqil Salayev ayrı-ayrı vaxtlarda direktor vəzifəsində çalışmışdılar.

***Mehdi Məmməd oğlu Mehdizadə***

Bütün çətinliklərə baxmayaraq Mehdi Mehdizadə institut əməkdaşlarının elmi fəaliyyətinin səmərəli idarəolunmasında bilik və bacarığını əsirgəmir, onların elmi yaradıcılığını tədris fəaliyyəti ilə əlaqələndirmələrinə yardımçı olur. Özü də elmi yaradıcılığını davam etdirir, "Azərbaycan məktəblərində savad təlimi tarixi" (1941) mövzusunda namizədlik dissertasiyası müdafiə edərək pedaqoji elmlər namizədi alimlik dərəcəsi alır. (Ondan dörd il əvvəl pedaqogika ixtisası üzrə Əhməd Seyidov ilk dəfə namizədlik dissertasiyası müdafiə etmişdi). Müdafiədən sonra Azərbaycan Dövlət Pedaqoji İnstitutunda tədris işlərinə rəhbərlik ona həvalə olunur. Bu vəzifədə az müddət (may 1941-sentyabr 1942) işləsə də institutda tədrisin səviyyəsinin yüksəldilməsinə çalışır. Böyük Vətən müharibəsinin başlanması ilə əlaqədar olaraq ADPİ-nin maliyyə imkanları tükənir, tələbələri, müəllimləri, eləcə də Mehdi Mehdizadə müharibəyə səfərbər olunur. Azərbaycan Xalq Komissarları Sovetinin və Azərbaycan K(b)P MK-nın qərarı ilə ADPİ ADU ilə ilə birləşdirilir. Mehdi Mehdizadə 1942-ci ilin sentyabr ayından 1946-cı ilin iyun ayına qədər qanlı döyüşlərin iştirakçısı olur. Müharibədən qayıtdıqdan sonra 1946-1950-ci illərdə ADPİ-də elmi-pedaqoji fəaliyyətini davam etdirir. Vəzifə pillələrində sürətlə yüksəlir: pedaqogika kafedrasının müdiri, fakültə dekanı, elmi işlər üzrə direktor müavini və direktor (1950-1951) vəzifələrində ləyaqətlə çalışır. İnsani keyfiyyətləri, yüksək humanizmi və xeyirxahlığı ilə həmkarlarının dərin rəğbətini qazanan Mehdi müəllimin nüfuzu ildən-ilə artır.

1951-ci ilin noyabrında Bakı Şəhər Soveti İcraiyyə Komitəsi sədrinin müavini vəzifəsinə təyin olunur. 1952-ci ilin mart ayında onun həyatında çox böyük hadisə baş verir. Belə ki, o, Azərbaycan SSR maarif naziri vəzifəsinə təyin edilir. O, bu vəzifədə cəmi üç il işləyir və 1954-cü ildə yenidən ADPİ-yə göndərilir. 1959-cu ilə kimi burada pedaqoji fəaliyyət göstərən Mehdi Mehdizadə intensiv şəkildə elmi tədqiqat işləri ilə məşğul olur, 1956-cı ildə "Azərbaycan sovet məktəbinin tarixinə dair xülasələr" mövzusunda doktorluq dissertasiyası müdafiə edərək pedaqoji elmlər doktoru alimlik dərəcəsi alır. Bir il sonra pedaqogika kafedrasına professor vəzifəsinə seçilir. 1959-cu ilin sentyabrında o, Azərbaycan SSR Ali və Orta İxtisas Təhsili Komitəsi sədrinin birinci müavini vəzifəsinə təyin edilir. 1960-cı ildə Azərbaycan Kommunist Partiyasının XXIV qurultayında Azərbaycan KP Mərkəzi Komitəsinin üzvlüyünə namizəd seçilir, həmin ilin mart ayında yenidən Azərbaycan SSR maarif naziri vəzifəsinə təyin olunur. Bir il sonra Azərbaycan KP Mərkəzi Komitəsinin üzvü seçilir. 20 il ərzində məharətlə, şəxsi nümunə göstərməklə Azərbaycanın xalq maarifi sisteminə ləyaqətlə rəhbərlik edir.

***Mehdi Məmməd oğlu Mehdizadə***

Mehdi Mehdizadənin fəaliyyətində beynəlxalq əlaqələr, beynəlxalq təşkilatların təşkil etdikləri tədbirlərdə fəal iştirak, bu tədbirlərdə dərin məzmunlu elmi pedaqoji məruzə və çıxışlar əsas yer tutur. O, 1961-1965-ci illərdə YUNESKO-nun Yaşlıların Təhsili üzrə Məsləhət Komitəsinin daimi üzvü olmuş, dövlətin maarif məsələləri üzrə tapşırıqlarını yerinə yetirmək məqsədi ilə sovet nümayəndə heyətinin tərkibində Polşa, Hollandiya, Fransa və Afrika ölkələrdə rəsmi səfərlərdə olmuş, pedaqogika elminin nailiyyətlərini məharətlə təbliğ etmiş və böyük nüfuz qazanmışdır.

Mehdi Mehdizadə pedaqogikanın tarixi və nəzəriyyəsi ilə bağlı fundamental və sistemli tədqiqatların müəllifidir. 1941, 1958-1959-cu illərdə onun iştirakı və həmmüəllifliyi ilə iki hissədən ibarət "Pedaqogika" dərs vəsaiti hazırlanıb nəşr olunub. "Azərbaycan sovet məktəbinin tarixinə dair xülasələr" (1958), "Orta məktəb şagirdlərinin əmək tərbiyəsi haqqında" (1960), "Azərbaycan məktəbləri yenidənqurma yollarında" (1960), "Məktəbdə təlim-tərbiyə işlərinin yenidən qurulması» (1961), "Azərbaycan xalq maarifi yeni yüksəlişdə"(1967), "Müasir dərsə verilən tələblər" (1971), "Dərsin təkmilləşdirilməsi yolları" (1979), "Azərbaycan xalq maarifinin sürətli inkişafı" (1980) "Ümumtəhsil məktəblərində təlim-tərbiyə prosesinin yolları" (1982) kitabları, "Azərbaycan məktəbi", "Sovetskaya pedaqoqika", "Narodnoye obrazovaniye" və başqa jurnallarda nəşr etdirdiyi silsilə məqalələri ölkəmizdə məktəb quruculuğunun, xalq maarifinin təşkilinin, təhsil-tərbiyə işinin məzmun və metodlarının təkmilləşdirilməsinin, xalq maarifinin idarə olunmasının səmərəliliyinin artırılmasında mühüm rol oynayıb. Onun 10 cildlik "Azərbaycan Sovet Ensiklopediyası"nda, Moskvada nəşr olunan 4 cildlik "Pedaqoji Ensiklopediya"da, 2 cildlik "Pedaqoji lüğət"də, "SSRİ xalqlarının məktəb və pedaqoji fikir tarixi" çoxcildliyində milli təhsil və pedaqoji fikir tarixi, təhsil-tərbiyənin nəzəri və praktik məsələləri ilə bağlı xeyli məqaləsi nəşr olunub.

SSRİ-də böyük elmi nüfuza malik olan M.Mehdizadə 9 avqust 1967-ci ildə SSRİ Pedaqoji Elmlər Akademiyasının həqiqi üzvü seçilən ilk və son azərbaycanlı alimdir. Onun yaradıcılığı keçmiş SSRİ-nin tanınmış alimləri tərəfindən təqdir edilərək, yüksək dəyərləndirilmişdir. Haqqında deyilən bəzi fikirlərə diqqət yetirək: "Akademik M.Mehdizadə pedaqogika elminin korifeylərindən biri, maarif quruculuğunun görkəmli təşkilatçısı kimi tanınmışdır" (akademik M.Prokofyev), "Akademik M.Mehdizadə çox nadir istedada malik alim, müdrik el ağsaqqalı kimi SSRİ Pedaqoji Elmlər Akademiyası Rəyasət heyətində,akademiyanın həqiqi və müxbir üzvləri arasında böyük nüfuza malik idi" (akademik A.G.Xripkova),"Akademik M.Mehdizadənin pedaqogika elminin, pedaqoq alimlərin inkişafında, formalaşmasında böyük zəhməti, mühüm rolu olmuşdur"(akademik M.İ.Kondakov), "Akademik

M.Mehdizadə müdrik insan, çox böyük nəzəriyyəçi pedaqoq alim və etibarlı məsləkdaşımız idi" (akademik D.O.Lordkipanidze), "Pedaqogikanın tarixi və nəzəriyyəsi sahəsində böyük alim kimi M.Mehdizadənin şöhrəti Azərbaycanın hüdudlarından çox-çox kənara çıxmışdır... Bu gözəl insanda xalq maarifinin böyük təşkilatçısı məharəti ilə böyük alimin tükənməz yaradıcı axtarışları son dərəcə uğurla uzlaşmışdır" (akademik Ə.E.İzmayılov).



КП-1223/5

(личная подпись владельца удостоверения)

Избран 9 августа 1967г.

Моск. печ. ф-ка Гознака. 1967. Зак. 22596.

АКАДЕМИЯ ПЕДАГОГИЧЕСКИХ НАУК СССР

УДОСТОВЕРЕНИЕ № 40

Предъявитель сего тов. Мехти-Заде Мехти-Мамед оглы является действительным членом (академиком) Академии педагогических наук СССР.

Президент Академии педагогических наук СССР

Выдано 15 апреля 1976 года.

*Akademik Mehdi Mehdizadənin SSRİ PEA-nın həqiqi üzvü seçilməsi haqqında diplom*

Akademik Mehdi Mehdizadənin yüksəkixtisaslı elmi-pedaqoji kadrların hazırlanmasında böyük xidmətləri olmuş, onun rəhbərliyi ilə neçə-neçə namizədlik və doktorluq dissertasiyaları müdafiə edilmişdir. O, eyni zamanda Moskva, Tbilisi, Bakı və digər şəhərlərin elmi şuralarında müdafiə edilən onlarla namizədlik və doktorluq dissertasiyalarının rəsmi opponenti olmuşdur. Xalq maarifinin və pedaqogika elminin aktual məsələləri ilə əlaqədar mühüm əhəmiyyət kəsb edən tədbirlərin təşkilində həmişə fəal iştirak etmiş, dərin məzmunlu mühazirələr oxumuş, SSRİ Pedaqoji Elmlər Akademiyasının müxtəlif komissiyalarına bacarıqla rəhbərlik etmişdir. Azərbaycan müəllimlərinin qurultayının üçünün (VII, VIII və IX) keçirilməsi xalq maarifi komissarı və xalq maarifi naziri olduğu illərə təsadüf edir.

Mehdi Mehdizadə öz ərizəsinə əsasən, 24 fevral 1980-ci ildə Azərbaycan SSR maarif naziri vəzifəsindın azad edilmiş, həmin vaxtdan ömrünün sonunadək Azərbaycan Elmi-Tədqiqat Pedaqoji Elmlər İnstitutunun (indiki Təhsil İnstitutunun) elmi məsləhətçisi olmuşdur. O, təqaüdə çıxdığı ilk gündən institutla əlaqələrini daha da genişləndirmiş, "Mühüm pedaqoji problemlər" mövzusunda elmi-nəzəri seminara rəhbərlik etmişdir. Seminarın rəhbəri kimi bu sahədə çalışan tədqiqatçılara zəruri istiqamət vermiş, əməli kömək göstərmişdir.

***Mehdi Məmməd oğlu Mehdizadə***

Elmi yaradıcılıqla ciddi məşğul olan Mehdi Mehdizadə SSRİ Pedaqoji Elmlər Akademiyasının sifarişi ilə yazdığı "Məktəb və məktəbli şəxsiyyətinin hərtərəfli inkişafı" adlı irihəcmli əsərini tamamlayır və nəşr üçün təqdim edir. Q.Əliyev, A.Atakişiyev, E.İsmayılov ilə birlikdə yazdığı “Xalq maarifinin inkişafında sovet Azərbaycanının təcrübəsi” kitabı vəfatından sonra YUNESKO tərəfindən ingilis və fransız dillərində kütləvi tirajla nəşr olunmuşdur.

Akademik Mehdi Mehdizadənin əməyi yüksək qiymətləndirilib. O, Lenin ordeni, üç dəfə Qırmızı Əmək Bayrağı ordeni (1966, 1972, 1976), dörd dəfə Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin Fəxri Fərmanı ilə təltif edilib, beş dəfə (III, V, VI, VII, VIII çağırışlar) Azərbaycan SSR Ali Sovetinin deputatı seçilib, “Azərbaycan Respublikasının Əməkdar elm xadimi” (1981) fəxri adına, “Əmək veteranı” medalına layiq görülüb. SSRİ PEA-nın təsis etdiyi “N.K.Krupskaya” medal ilə də təltif edilib. Bakı şəhərindəki küçələrdən




*Akademik Mehdi Mehdizadə YUNESKO-nun tədbirində*

birinə, Gəncə şəhərindəki məktəblərdən birinə, Cəbrayıl rayonundakı 1 nömrəli orta məktəbə, Beyləqan rayonundakı 3 nömrəli şəhər orta məktəbinə akademik Mehdi Mehdizadənin adı verilib və məktəbin qarşısında onun büstü qoyulub. Azərbaycan Müəllimlərinin Yaradıcı İttifaqı 1995-ci ildə akademik Mehdi Mehdizadə adına mükafat təsis edib.

60 ildən çox bir müddətdə tükənməz enerji, gənclik həvəsi ilə yorulmadan elmi-pedaqoji fəaliyyət göstərən Mehdi müəllim tutduğu vəzifəyə məsuliyyəti,

insanlara həssas münasibəti, qayğısı sayəsində daim pillə-pillə ucalmış, onu tanıyanların qəlbində özünün mənəvi abidəsini ucaltmışdır. İnsanlıq, müəllimlik, alimlik və yüksək səviyyəli idarəetmə qabiliyyəti şəxsiyyətinin mühüm göstəriciləri kimi daim vəhdətdə olmuş, bir-birini tamamlamışdır.

Mehdi Mehdizadə böyük alim, ictimai-siyasi xadim, müdrik şəxsiyyət olması ilə yanaşı, qayğıkeş ailə başçısı olmuşdur. Ömür-gün yoldaşı Lətifə xanımla birgə 4 övlad böyütmüşlər. Onlar da ataları kimi elm və təhsil yolu seçmişlər. Oğlu Rafiq texnika elmləri doktoru, professor, qızları Zemfira, Elmira və Nailə isə elmlər namizədi, dosent kimi səmərəli elmi-pedaqoji fəaliyyət göstərirlər.

Akademik Mehdi Məmməd oğlu Mehdizadə 1 may 1984-cü ildə Bakı şəhərində vəfat etmiş, İkinci Fəxri Xiyabanda dəfn olunmuşdur.

### Ədəbiyyat

1. Akademik Mehdi Mehdizadə ömrünün işığı. (Nəşrə hazırlayanlar: prof.V.Xəlilov, H.Musayev). "Nərgiz", 2012
2. Akademik Mehdi Mehdizadə (Biblioqrafiya).(Tərtib edəni H. A. Musayev). Bakı, 1992
3. Mərdanov M.C. "Təhsilimizin nurlu siması" ."525-ci qəzet", 26 yanvar, 2018
4. Ağayev Ə.A. Xalq maarifinə həsr edilmiş ömür. "Azərbaycan müəllimi" qəzeti, 21 yanvar 1983-cü il
5. Nəcəfov N. Görkəmli pedaqoq, böyük alim, gözəl insan // "Azərbaycan dili və ədəbiyyatı" məcmuəsi, 2004-cü il, № 1, s. 61
6. Rüstəmov F.A. Azərbaycan pedaqogikaşünaslığı, Bakı, Elm və təhsl, 2016
7. Rüstəmov F.A. Pedaqoji oçerklər: sələflərin və müasirlərim. Bakı, Elm və təhsil, 2010
8. İzmayılov Ə.E. Alimin yubileyi //Azərbaycan məktəbi, 1983, № 5, s.55-62;
9. Əliyev R.C. Akademik Mehdi Mehdizadənin pedaqoji fəaliyyəti və pedaqoji görüşləri. Pedaqoji elmlər namizədi alimlik dərəcəsi almaq üçün təqdim olunan dissertasiyanın avtoreferat, Bakı 2007, 25 s.;
10. Ахмедов Г. Юбилей ученого //Советская педагогика 1983, № 12,с.133-134
11. Гашимов А.Ш. Мехти Мамед оглы Мехтизаде. Антология педагогической мысли Азербайджанской ССР.М.,1989, стр.447-448
12. Мехти-заде Мехти Мамед оглы. Российская Педагогическая Энциклопедия. Том I. Москва, 1993, 572 стр.

***<u>Mehdi Məmməd oğlu Mehdizadə</u>***



**HƏMİD MUSA OĞLU QƏDİROV**
*Əməkdar elm xadimi,*
*professor*
*(1909-1990)*

Həmid Musa oğlu Qədirov 18 mart 1909-cu ildə Şamaxı şəhərində anadan olub. 1923-1927-ci illərdə pedaqoji təmayüllü 18 nömrəli məktəbdə təhsil alıb. 1927-ci ildə Azərbaycan Politexnik İnstitutunun[38] kənd təsərrüfatı fakültəsinə qəbul olunub, sonra Daşkənd şəhərindəki Orta Asiya Pambıqçılıq İnstitutunun III kursuna köçürülüb. 1931-ci ildə həmin institutu sahə aqronomu ixtisası üzrə bitirib. Orta Asiya Pambıqçılıq İnstitutunu bitirdikdən sonra 29 mart 1932 –ci ildən 1 iyul 1932-ci ilə kimi Türkmənistanda Seraxs MTS –də sahə aqronomu işləyib.

Səhhəti ilə əlaqədar olaraq öz ərizəsi ilə işdən ayrılaraq Azərbaycana qayıdıb. 20 iyul 1932-ci ildən 4 aprel 1933-cü ilə kimi Azsovxoztrestdə əmək iqtisadiyyatı sektorunun rəhbəri və əmək məsələləri üzrə iqtisadçı vəzifələrində çalışıb. 4 aprel 1933-cü ildən 4 oktyabr 1933-cü ilə kimi Salyan rayonuna ezam olunub. Salyan MTS - də aqronom işləyib. Sonra Bakıya qayıdıb və SSRİ EA-nın Azərbaycan filialının Botanika İnstitutunda əmək fəaliyyətinə başlayıb.

1935-ci ildə həmin institutun aspiranturasına qəbul olunan H.Qədirov Böyük Qafqaz, Kiçik Qafqaz və Talış dağları arasındakı məkanı əhatə edən, respublika ərazisinin mərkəzi hissəsini tutan Kür-Araz ovalığının faunası,

---

[38] *Əslində o, qəbul olunarkən Bakı Politexnik İnstitutu adlanırdı. 1928-ci ildə Azərbaycan Politexnik İnstitutu adlandırıldı. Sonralar Azərbaycan Neft və Kimya İnstitutu kimi məşhurlaşdı. İndiki Azərbaycan Texniki Universiteti həmin institutun üç fakültəsi əsasında 1950-ci ildə yaradılmışdır.*

florası və landşaftının genetik xüsusiyyətləri ilə bağlı araşdırmalar aparmağa başlayıb və 1940-cı ildə namizədlik dissertasiyası müdafiə edib. SSRİ EA-nın Azərbaycan filialının Botanika İnstitutunun Elmi Şurasının 4 mart 1940-cı il 7 saylı protokolundan çıxarışdan məlum olur ki, iclas biologiya elmləri doktoru, professor A.A.Qrossheymin sədrliyi ilə keçirilib, kiçik elmi işçi Həmid Qədirova "Kür - Araz ovalığının şimal-qərb hissəsinin yaşıllaşdırılması" mövzusunda uğurlu dissertasiya müdafiəsinə görə biologiya elmləri namizədi alimlik dərəcəsinin verilməsi qərara alınıb. Həmid Qədirovun biologiya elmləri namizədi alimlik dərəcəsini təsdiq edən Ali məktəblər üzrə Ümumittifaq Komitəsinin nəzdində fəaliyyət göstərən Ali Attestasiya Komissiyası az sonra (17 may 1941-ci ildə ) ona bitki coğrafiyası ixtisası üzrə dosent elmi adı verir. Bundan sonra onun elmi və pedaqoji karyerasında uğurlu illər bir-birini əvəz edir. Botanika İnstitutunda böyük elmi işçi, şöbə müdiri və Nəbatət bağının direktoru (1943-1949-cu illər) vəzifələrində çalışır. Həmin illərdə o, elmi və pedaqoji fəaliyyətini bacarıqla əlaqələndirir.

Orta təhsilini pedaqoji təmayüllü məktəbdə Sultan Məcid Qənizadə, Azad Əmirov, Ağabəy İsrafilbəyov, Səmədbəy Acalov, Feyzulla Qasımzadə kimi görkəmli alimlərdən alması onun gələcək həyatında və pedaqoji fəaliyyətində mühüm rol oynayır. Aspiranturada təhsil aldığı illərdə Bakının Əmircan kəndində, sonralar isə şəhərin Oktyabr (indiki Yasamal) rayonundakı yaşlılar üçün axşam məktəbində coğrafiya müəllimi, tədris hissəsi müdiri və məktəb direktoru vəzifələrində işləyir. Həmin illərdə (1937-1940-cı illərdə) o, həm də əvəzçiliklə Azərbaycan Dövlət Qiyabi Pedaqoji İnstitutda baş müəllim kimi fəaliyyət göstərir.

Həmid Qədirov Botanika İnstitutunda işləyərkən həmkarlar təşkilatının sədri, ilk partiya təşkilatının katibi və elmi işçilərin siyasi seminarının rəhbəri kimi geniş ictimai-siyasi fəaliyyətlə məşğul olur. 1946-cı ildən taleyini Azərbaycan Dövlət Pedaqoji İnstitutu ilə bağlayır. 1946-1948-ci ildə Azərbaycan Dövlət Pedaqoji İnstitutunun Botanika kafedrasında dosent vəzifəsində çalışır, elmi erudisiyası, ictimai-siyasi fəallığı, işgüzarlığı ilə seçilir. 27 dekabr 1950-ci ildə Azərbaycan Dövlət Pedaqoji İnstitutunun direktoru M.Mehdizadənin əmri ilə botanika kafedrasına müdir təyin olunur və həmin vəzifədə 34 il uğurla çalışır. Onun rəhbərlik etdiyi dövrdə kafedranın elmi dərəcəsi və elmi adı olan əməkdaşların sayı ildən-ilə artır, ali bioloji təhsilin məzmununu özündə ehtiva edən yeni proqramlar, dərslik və dərs vəsaitləri yazılır və ya rus dilindən tərcümə edilir.

Həmid Qədirov 1951-ci ilin yanvarından dekabrına kimə Azərbaycan Dövlət Pedaqoji İnstitutunun tədris və elmi işlər üzrə direktor müavini işləyir. Bir il sonra Azərbaycan Dövlət Pedaqoji İnstitutunun həyatında mühüm

dəyişiklik baş verir. İnstitutun direktoru Mehdi Mehdizadə Azərbaycan SSR maarif naziri təyin olunur. Daha yüksək vəzifəyə təyinat alan Mehdi Mehdizadə öz yerinə Həmid Qədirovu tövsiyə edir. Azərbaycan KP MK-nın bürosunda onun namizədliyi təsdiq olunduqdan (dekabr 1951) sonra SSRİ Ali təhsil naziri V.Stoletovun əmri ilə 3 aprel 1952-ci ildə Azərbaycan Dövlət Pedaqoji İnstitutuna rektor təyin olunur. O, bu vəzifədə 29 iyun 1954-cü ilə kimi çalışır. Bu illərdə institutun həyatında mühüm dəyişikliklər baş verir. Əgər 1950-1951-ci tədris ilində institutda cəmi 1987 nəfər tələbə təhsil alırdısa da, 1953-1954-cü tədris ilində onların sayı artaraq 2509 nəfərə çatır. Qəbul planı 600 nəfərdən 807 nəfərə qalxır. Məzunların da sayı 2 dəfəyədək artır. 1950-1951-ci tədris ilində məzunların sayı 370 nəfər olduğu halda, 1953-1954-cü tədris ilində onların sayı 690 nəfər olur. Elmi dərəcəsi və elmi adı olanların sayında artım baş verir.

Həmid Qədirov rektor vəzifəsindən azad olunduqdan sonra yenidən tədris və elmi işlər üzrə direktor müavini təyin olunur və o, həmin vəzifədə 1964-cü ilə kimi uğurla çalışır, 12 il bu vəzifəni ləyaqətlə yerinə yetirir. Mehdixan Vəkilov ADPİ-nin rektoru vəzifəsindən azad olunanda (14 sentyabr 1962-ci il) o, bir müddət ADPİ-nin rektor vəzifəsini icra edir.

1967-ci ildə ADPİ-nin Botanika kafedrasının müdiri vəzifəsində çalışan dosent H.Qədirov professor vəzifəsinə seçilir. 19 iyun 1968-ci ildə SSRİ Ali Attestasiya Komissiyası onun elmi adını təsdiq edir. H.Qədirovun elmlər namizədi olaraq professor vəzifəsinə seçilməsi onun elmi nüfuzunun mühüm göstəricisidir. Ayrı-ayrı vaxtlarda Azərbaycan Pedaqoji İnstitutuna rəhbərlik edən Ə.Seyidovun, M.Mehdizadənin, C.Ələsgərovun, M.Vəkilovun, Ş.Ağayevin, H.Ağayevin, A.Qurbanovun, Azərbaycan Dövlət Qiyabi Pedaqoji İnstitutunun direktorları Vəlixan Mustafayevin, Abasqulu Abaszadənin, Əfəndiyevin, Həşim Ağayevin onun haqqında imzaladıqları xasiyyətnamələrdə bunu təsdiq edir. Onunla bağlı verilən bütün xasiyyətnamələrdə o, daim öz üzərində çalışan yüksək ixtisaslı müəllim, peşəkar tədqiqatçı, bacarıqlı təhsil və elm təşkilatçısı, mədəni, təvazökar, səmimi, dəqiq, obyektiv və xeyirxah insan, tələbələrin sevimlisi olan müəllim kimi səciyyələndirilir. Onun humanistliyini, obyektivliyini və ədalətli insan olmasını öyrənmək baxımından 30 ilə yaxın ADPU-nun Ümumi pedaqogika kafedrasına rəhbərlik etmiş, akademik Hüseyn Əhmədovun xatirələri maraq doğurur. O yazır: “1952-ci ilin söhbətidir. ADPİ-də pedaqogika ixtisası üzrə aspiranturanın əyani şöbəsinə iş vermişdim. Müsabiqə böyük idi. Bir yerə yeddi adam iddialı idi. Onların içərisində ən “sahibsizi” mən idim, Bakıda heç bir yanı

tanımırdım: dəmiryolu vağzalından ADPİ-yə gedən yoldan başqa. İmtahanlar H.Qədirovun kabinetində gedirdi. Komissiyanın tərkibinə M.Muradxanov ilə H.Əfəndiyev də daxil idilər. Bu üç şəxsin, bu üç şəxsiyyətin obyektivliyi sayəsində mənim, “sahibsiz “ Hüseynin aspiranturaya qəbul olunması reallaşdı”.Həmid Qədirov akademik A.A. Qrossheym kimi dünya şöhrəti alimlərlə birlikdə botanika üzrə ekspedisiyalarda iştirak etməklə, respublikamızın böyük Qafqaz, Kiçik Qafqaz, Talış, Kür - Araz ovalığı və s. ərazilərinin zəngin florasının öyrənilib xalq təsərrüfatının müxtəlif sahələri üçün dəyərli fond yaradılmasına gərgin əmək sərf etmişdir. Prof. Həmid Qədirov tədqiqatların nəticələrini 16 dərslik və dərs vəsaitində, Azərbaycan EA-nın, ADPİ-nin və digər ali məktəblərin "Elmi əsərləri"ndə nəşr etdirdiyi 100-ə yaxın elmi məqalədə ümumiləşdirmişdir. O, həm də ”Azərbaycan florası” (I,V,VI, VII cildlər) “Abşeronun yaşıllaşdırılması” kimi qiymətli monoqrafik əsərlərin müəlliflərindən biri olub. Onun “Azərbaycanda şəhər və kəndlərin yaşıllaşdırılması” (1948), “Gənc miçurinçilərə kömək” (1949), “Meşə zolaqları salınmasında gənclərin köməyi” (1951), “Azərbaycan SSR-nin meşələri” (1951), “Azərbaycanda meşə zolaqları salınmasında istifadə olunan ağac və kollar” (1953), “Bitkiləri təyinat kitabçası” (1959), “Bitki sistematikasından laboratoriya məşğələləri. Ali bitkilər” (1966), “Ali bitkilər sistematikasından mühazirələr və onlara aid metodik göstəriş” (1968), “Ali bitkilər sistematikası” (1986) kitabları indi də tələbələrin və tədqiqatçıların daha çox müraciət etdikləri dəyərli mənbələrdən biridir. O, N.S.Voronin “Botanika” (1987) dərsliyini və Moskvada hazırlanmış “Botanika” fənn proqramını (1987) Azərbaycan dilinə tərcümə edərək ADPİ-nin nəşriyyatında çapına nail olmuşdur. Onun redaktorluğu ilə həmkarlarının ali məktəb tələbələri üçün botanika və bitki coğrafiyasının tədrisinə aid xeyli əsəri işıq üzü görmüşdür. Həmin kitablar pedaqoji institutların və universitetin biologiya və coğrafiya fakültəsi tələbələrinin stolüstü kitabı olmuşdur.

Prof. Həmid Qədirov çalışdığı institutda və institutdan kənarda ictimai işlərdə fəal iştirak etmişdir. O, Azərbaycan Kommunist Partiyasının IX və XX qurultayının nümayəndəsi və Bakı şəhər Partiya Komitəsinin X plenumunun üzvü olub. Fasiləsiz olaraq ADU -nun və ADPİ -nin nəzdində fəaliyyət göstərən Müdafiə Şuralarının, ADPİ-nin “Elmi əsərləri”nin (biologiya seriyası) redaksiya heyətinin, SSRİ Maarif Nazirliyində biologiya üzrə metodik şuranın, Botanika Cəmiyyətinin, Azərb.SSR EA-nın Botanika üzrə koordinasiya şurasının, V.İ.Komarov adına Botanika İnstitutunun müdafiə şurasının, Maarif Nazirliyi nəzdində respublika müəllimləri attestasiya komissiyasının, ADPİ -nin Metodik Şurasının və Müsabiqə Komissiyasının üzvü, Azərbay-

can SSR Təbiəti Mühafizə Cəmiyyətinin ”Flora  və bitkilərin mühafizəsi” bölməsinin rəhbəri olmuşdur. 1953-cü ildən  periodik olaraq nəşr  edilən APİ-nin “Elmi Əsərləri”nin ilk buraxılışı onun xeyir-duası ilə işıq üzü görüb.

Prof.Həmid Qədirovun pedaqoji və elmi-pedaqoji kadr hazırlığında (xüsusilə, biologiya-coğrafiya ixtisası üzrə)  mühüm xidmətləri var. Belə ki, o, elmi rəhbər, rəsmi opponent, müdafiə şurasının üzvü kimi 34 tədqiqatçının  elmi  və elmi-pedaqoji fəaliyyətə vəsiqə almasında birbaşa iştirak edib.




Prof.Həmid  Qədirovun  məhsuldar  elmi və pedaqoji fəaliyyəti dövlət və işlədiyi kollektiv tərəfindən yüksək qiymətləndirilib.Azərbaycan SSR Ali Sovetinin Rəyasət Heyəti tərəfindən ona pedaqoji və elmi-pedaqoji kadr hazırlığındakı xidmətlərinə görə 2 mart 1973-cü ildə “Azərbaycan Respublikasının Əməkdar elm xadimi” fəxri  adı verilib. O, “Şərəf nişanı” və “Qırmızı Əmək  Bayrağı” ordenləri və 4 müxtəlif medalla, “Qabaqcıl  maarif işçisi” döş nişanı ilə təltif  edilib..

Prof.Həmid Qədirov öz ərizəsi ilə 4  iyul 1984-cü ildə ADPİ-nin  Botanika  kafedrasının müdiri vəzifəsindən azad olunaraq  Azərbaycan SSR Ali və Orta İxtisas Təhsili Nazirliyinin icazəsi ilə həmin kafedraya 0,5 ştat professor-məsləhətçi təyin olunub. Səhhətində yaranmış ciddi problemlərlə əlaqədar olaraq o, 1 dekabr 1988-ci ildə sevimli tələbələrindən və həmkarlarından həmişəlik ayrılmalı olur. İki il sonra - 1990-cı il dekabr ayının 25- də haqq dünyasına qovuşur. Belə insanlar ölmür, ölümləri ilə ikinci həyat qazanırlar. Nə qədər ki, onu xatırlayan insanlar var, onlar da yaşayırlar: xəyallarda və xatirələrdə.

**Ədəbiyyat**


1. ADPU-nin Arxivi. Qədirov Həmid Musa   oğlunun şəxsi işi. iş.117, 120 s.
2. Sadıqov Ş., Əzimov H., Salahov M. V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutu 50 ildə. Bakı, ADPİ, 1972, 132 s.
3. Rzayev Ağahəsən.Azərbaycanda sovet hakimiyyəti illərində ali pedaqoji təhsilin inkişafı tarixindən. Bakı, Azərnəşr,1960, 74 s.
4. Əliyev Q. Qəlbimizdə əbədi yaşayacaqdır. ”Gənc müəllim” qəzeti,  yanvar 1991


***Həmid Musa oğlu Qədirov***



**CƏBRAYIL AĞAƏLİ OĞLU ƏLƏSGƏROV**
*pedaqoji elmlər namizədi, dosent*
*(1907-1969)*

Cəbrayıl Ağaəli oğlu Ələsgərov 1907-ci ildə Şamaxıda anadan olmuşdur. 1917-1918-ci illərdə daşnakların törətdiyi dəhşətləri öz gözü ilə görmüşdü. 1918-ci ilin mart ayında erməni silahlı birləşmələri Şamaxıya hücum edərək, qədim şəhərin müsəlmanlar yaşayan hissəsini tamamilə yandırmış, bir neçə gün ərzində yeddi mindən çox şamaxılı qətlə yetirilmişdi. Müdafiəsiz qalmış dinc əhali ətraf rayonlara pənah aparmışdı. Cəbrayılgilin ailəsi də Ağdaşda məskunlaşıb. Atasının vəfatından sonra onun vəsiyyətinə əməl edən Cəbrayıl Bakıdakı qohumlarının yanına gəlmişdir. Azərbaycan Xalq Cümhuriyyəti dövründə xüsusi mətbəələrin birində usta köməkçisi işləmiş, mürəttiblik peşəsinə mükəmməl yiyələnmişdir. Sovet hakimiyyətinin ilk illərində dövlət mətbəəsində cildçi kimi çalışmışdır. O, Bakıdakı I dərəcəli 76 nömrəli məktəbi bitirdikdən sonra Sənaye texnikumuna daxil olmuşdur. 1928-ci ildə texnikumu əla qiymətlə bitirdiyinə görə Məşədi Əzizbəyov adına Politexnik İnstitutuna (indiki Azərbaycan Neft və Sənaye Universitetinə) daxil olmuş, dağ mühəndisi ixtisası üzrə oranı bitirmişdir. 1932-1935-ci illərdə V.V.Kuybışev adına Azərbaycan Elmi-Tədqiqat Neft İnstitutunda (AETNİ) elmi işçi vəzifəsində çalışmışdır. Həmin dövrdə institut birbaşa SSRİ Xalq Neft Komissarlığına tabe idi və burada neft emalı, neft çıxarma, neft kimyası üzrə elmi-tədqiqat işləri aparılırdı.

Cəbrayıl Ələsgərov 1924-cü ildə komsomol, 1931-ci ildə Kommunist Partiyası sıralarına daxil olub.

1936-cı ildə Cəbrayıl Ələsgərov öz fəaliyyət sahəsini dəyişir, təhsil sahəsində fəaliyyətə başlayır. 1936-cı ildə Neft Texnikumunda müəllim və direktor müavini işləyir. 1937-ci ildə həmin texnikumda direktor vəzifəsinə irəli

çəkilir. Bununla yanaşı həmin müddətdə o, geoloji-kəşfiyyat texnikumunda da dərs deyir.

1937-ci ilin noyabrında Cəbrayıl Ələsgərovun həyatında unudulmaz anlar baş verir. Mir Cəfər Bağırov Cəbrayıl Ələsgərovu şəxsən qəbul edərək onunla ətraflı söhbət edir və onu Azərb.KP MK Bürosunun qərarı ilə Azərbaycan Dövlət Universitetinin rektoru vəzifəsinə təyin edir. Onda onun 30 yaşı vardı.

1937-ci ilin noyabr ayından 21 iyun 1941-ci ilə kimi S.M.Kirov adına Azərbaycan Dövlət Universitetinin rektoru vəzifəsində çalışır. ADU -ya rektor təyin edilən Cəbrayıl Ələsgərovun qarşısında çətin vəzifələr dururdu: universitetin professor-müəllim heyətinin sayını artırmaq, tədris və elmi işləri gücləndirmək, təlim müvəffəqiyyətini yüksəltmək, yarımçıq qalan tələbə yataqxanasının tikintisini başa çatdırmaq, SSRİ-nin digər şəhərlərindən dəvət edilmiş müəllimləri mənzillə təmin etmək və s.

Cəbrayıl Ələsgərov müəyyən kadr və struktur dəyişikliyi həyata keçirməyə başladı. Onun təqdimatı ilə 1938-ci ilin mart ayının 3-də Azərbaycan KP M(b)K-nın Büro iclasında M.Qasımov tarix fakültəsinin dekanı vəzifəsinə təsdiq edildi. Tarix fakültəsinin dekanı təyin edilməsinə baxmayaraq M. Qasımov Cəbrayıl Ələsgərova hüsn-rəğbət bəsləmirdi. Azərbaycan SSR Ali Sovetinə növbəti seçkilərdə onun deputatlığa namizədliyi irəli sürüləndə rektor və dekan arasındakı qarşıdurma respublika mətbuatı səhifəsində öz əksini tapdı. Cəbrayıl Ələsgərov Şamxor (Şəmkir) rayonu 156 saylı seçki dairəsindən Azərbaycan SSR Ali Sovetinə deputatlığa namizəd irəli sürülmüşdü. ADU-da çalışan qeyri-azərbaycanlı müəllim və tələbələr adından Moskvaya və respublika təşkilatlarına etiraz məktubları göndərildi. ADU-nun komsomol komitəsi katibi Melik Osipovun və tələbə Kriçevskinin müxtəlif təşkilatlara tələbələr adından göndərdikləri məktublar Azərbaycan Respublikası Prezidentinin İşlər İdarəsi Siyasi Sənədlər Arxivində saxlanılır. Həmin məktubların birinin məzmunu ilə tanış olaq: ”*1938-ci il mayın 28-də “Bakinski raboçi” qəzetində Azərbaycan Dövlət Universitetinin rektoru Cəbrayıl Ələsgərovun Azərbaycan SSR Ali Sovetinə deputatlığa namizəd irəli sürülməsi barədə məlumatı oxuyub heyrətə gəldik. Çünki Ələsgərov bu şərəfə layiq deyildir. Onun bir il ərzində ADU rektoru vəzifəsində yarıtmaz işi dediklərimizə sübutdur:*

*1.Ələsgərov universitetin müəllimləri və tələbələri arasında hörmətə malik deyildir.*

*2.Universitetdə xalq düşmənlərinin fitnəkarlığının nəticələri Ələsgərovun rektor kimi nöqsanlı işinin ucbatından aradan qaldırılmamışdır.*

*3.Universitetə yeni tələbə qəbulu pozulmaq təhlükəsi qarşısındadır.*

*4.Universitetin çox mühüm bir orqanı olan tədris hissəsi olduqca pis*

*işləyir. Tədris hissəsinə Ələsgərova yaltaqlıq edən bir şəxs başçılıq edir. Universitetin bütün fakültələrində müəllim çatışmazlığı mövcuddur. Bir çox fənlər üzrə tələbələr bu günədək proqramlarla təmin olunmamışlar. Universitetin aspiranturası biabırçı haldadır. Burada dövlətin pulu hərraca qoyulur.*

*5.Bioloji fakültəyə rəhbərlik edən Məmməd Qasımov işinin öhdəsindən gəlmir.*

*6.İdman kafedrasının, həmçinin böyük müdafiə əhəmiyyəti olan hərbi kafedranın işi bərbad hala düşüb. Bu kafedraların fəaliyyətini yaxşılaşdırmaq barədə universitetin ictimai təşkilatları dəfələrlə rektorluq qarşısında məsələ qaldırsa da, Ələsgərov əhəmiyyət verməmişdir.*

*7.Universitetin kitabxanasının fondları və tarix kabinəsi acınacaqlı vəziyyətdədir. Yeni nəşr olunmuş kitabların alınmasına məhəl qoyulmur. Guya rektorluğun buna vəsaiti yoxdur.*

*8.Azərbaycanda məşhur olan alimlər universitetdən uzaqlaşdırılır....*

*Yuxarıda sadaladıqlarımızdan aydın oldu ki, rektor Ələsgərov tələbələrin məhəbbətini və hörmətini qazanmamışdır. Ələsgərov partiyanın və hökumətin etimadını doğrultmadığı üçün onu Azərbaycan SSR Ali Sovetinin deputatı seçmək olmaz. Biz Ələsgərovun namizədliyinin geri götürülməsini təkidlə tələb edirik. İnanırıq ki, universitet tələbələrinin böyük əksəriyyətinin fikri nəzərə alınacaqdır".*

Mehbal Qasımov 28 may 1938-ci ildə V. Budaqyanla birlikdə "Bakinski raboçi" qəzetində dərc etdirdiyi məktubda rektoru belə xarakterizə edirdi: "Universitetin rektoru kimi o, özünü praktik işdə doğrultmadığı üçün Ali Sovetin deputatı kimi yüksək ada layiq deyil". Onlar öz fikirlərini belə əsaslandırmağa çalışırdılar ki, o, indiyə qədər universitetdəki əyintiləri aradan qaldırmağa, əvvəllər işə dəvət olunan elmi əməkdaşları mənzillə təmin etməyə nail olmayıb. Hələ də bir sıra fənləri tədris etmək üçün İttifaqın digər şəhərlərindən professor-müəllim dəvət etməyib. Cəbrayıl Ələsgərov elmi işçiləri, xüsusilə də kommunistləri terrora məruz qoyub, instituta tələbə yığılması ilə məşğul olmadıqlarına, aspiranturaya qəbulun pozulmasına görə, ADU-nun elmi işçilərinin ştat cədvəli qaneedici olmaması səbəbindən bir əmrlə 5 kommunistə töhmət verib. Bu səbəbdən də onun Ali Sovetə deputatlığa namizədliyinin irəli sürülməsi tələbələrdə gülüş doğurur".

Universitetdəki digər çatışmazlıqları da C.Ələsgərovun fəaliyyəti ilə bağlayan məktub müəllifləri belə nəticəyə gəlirlər: 1) Azərbaycan Dövlət Universitetinin vəziyyətinin ciddi yoxlanılması məqsədilə xüsusi komissiya yaradılsın; 2) Universitetin rəhbərliyi, birinci növbədə rektor və tədris işləri üzrə prorektor dəyişdirilsin; 3) ADU-nun işçilərindən Tarix fakültəsi-

nin hazırkı dekanı Mehbalı Qasımov rektor, ADU-nun elmi katibi Quliyev tədris işləri üzrə prorektor vəzifəsinə ən yaxşı namizəddir; 4) Qısa bir vaxtda yataqxanasının tikintisi başa çatdırılsın; 5) ADU-da normal və məhsuldar iş şəraiti yaratmaq üçün Sənaye texnikumunun binası universitetə verilsin.

10 iyun 1938-ci ildə ADU-nun partiya təşkilatının iclası keçirildi. İclasda Voroşilov rayon partiya komitəsinin nümayəndələri də iştirak edirdi. Rektor C.Ələsgərov "ADU-da görülən işlər və 1938-1939-cu tədris ili üçün perspektivlər" mövzusunda məruzə etdi. Ayrı-ayrı fakültələrdə tədris prosesinin təşkilindən danışmaqla yanaşı, Tarix fakültəsinin dekanının ünvanına kəskin tənqidi fikirlər söylədi. Tarix fakültəsinin dekanı M.Qasımov da rektorun ünvanına kəskin tənqidi fikirlər səsləndirdi. Universitetin partiya komitəsinin katibi M.T.Novixinin təşəbbüsü ilə ADU-nun rektoru Cəbrayıl Ələsgərovun deputatlığa namizədliyinin geri götürülməsi məsələsi gündəliyə salındı və onun ətrafında müzakirələr aparıldı. Tarix fakültəsinin tələbələri və partiya komitəsinin üzvləri A.Arustanov və Movsesyan, ADU-nun partiya komitəsinin katibi Novixin rektora qarşı çıxış etdilər. Təəssüf ki, onların arasındakı bu münasibət uzun müddət qarşılıqlı ittiham şəklində davam etdi. ADU-nun tədris və elmi həyatını iflic edən rektor-dekan qarşıdurması sonuncunun vəzifəsindən çıxarılması ilə nəticələndi.

Tanınmış azərbaycanlı ziyalılar Cəbrayıl Ələsgərov və Mehbalı Qasımovla bağlı arxiv sənədləri ilə tanışlıq göstərir ki, ermənilər məqsədli şəkildə onların arasını vurmuşdur.

SSRİ EA Rəyasət Heyətinin 13 may 1941-ci il tarixli qərarı ilə SSRİ Elmlər Akademiyası Zaqafqaziya Filialının Azərbaycan şöbəsinin Elmi Şurasının (sədr O.Y.Şmidt) tərkibinə Cəbrayıl Ələsgərovun adının daxil edilməsi onun ictimai-siyasi və elmi mövqeyinə dəlalət edir.

1941-ci ildə öz miqyasına görə misli-bərabəri olmayan Böyük Vətən müharibəsi başlandı. İnsanlara ölüm və fəlakət gətirən bu müharibədə hamı müsəlləh əsgərə çevrildi. Həmin dövrdə "Bakinski raboçi" qəzetində Azərbaycan alimlərinin aşağıdakı məzmunda müraciəti dərc olundu: *"Bu həlledici anda Sovet İttifaqı azadlıq və mədəniyyətin çox böyük nailiyyətlərini müdafiə etdiyi bir vaxtda sovet elminin bütün gücü düşmənə qarşı yönəldilməlidir...Bütün fəaliyyətimiz vahid arzu ilə, azğınlaşmış düşməni darmadağın etmək kimi vahid fikir ilə aşılanmalıdır. Biz şübhə etmirik ki, elmi işçilər vəhşi faşist ordusu üzərində tezliklə və tam qələbə qazanmaq üçün var qüvvələrini, bütün coşğunluğunu, öz elmi təşəbbüsünü sərf edər, lazım olarsa, hətta öz həyatlarını da qurban verərlər. Yaşasın sovet elmi! Yaşasın qəhrəman Qızıl Ordu!"*. Ayrı-ayrı təhsil müəssisələrinin professor-müəllim və tələbə kollektivləri səfərbəredici bəyanatlar imzaladılar. Universitet tələbələrinin

imzaladığı "Hitlerin qanlı köpəklərindən intiqam alacağıq" adlı müraciət respublika tələbələrinin vətənpərvərlik nümunəsinin ifadəsi idi. *"Biz gənc tarixçilər – Azərbaycan Dövlət Universiteti tarix fakültəsinin tələbələri öz hiddət və qəzəb səsimizlə bütün qabaqcıl bəşəriyyətə müraciət etmiş ölkəmizin qüdrətli ümumxalq səsinə qoşuluruq. Amansız müqəddəs qisasımız, torpağımıza soxulmuş qaniçənləri büsbütün qırıb məhv etmək faşist qatillərinin cinayətinə cavabımız olacaq. Sovet Vətəninin gənc vətənpərvərləri - sovet Azərbaycanının tələbələri cəbhəyə öz köməyini gücləndirməlidirlər. Hitlerin qanlı köpəklərinin bütün vəhşilikləri və zorakılıqları üçün onlardan qisas alacağıq. Faşist Almaniyasının büsbütün darmadağın edilməsi gününü yaxınlaşdırmaq üçün nə mümkünsə edəcəyik".* Ümumuniversitet mitinqində müəllimlər, tələbələr, məzunlar cəbhəyə getmək arzusunu ifadə etdilər. Rektor Cəbrayıl Ələsgərov da onların sırasında idi.

O, 1941-ci il iyun ayının 22-də rektor vəzifəsini təhvil verərək səhərisi gün cəbhəyə yola düşdü. Rektor Cəbrayıl Ələsgərovun könüllü olaraq cəbhəyə getməsi yaxşı bir nümunə kimi ali təhsil müəssisələrinin əməkdaşları arasında səfərbəredici ruh yaratmışdı. Müharibənin ilk 6 ayı ərzində yalnız universitetdən 1385 nəfər, o cümlədən 159 nəfər akademik işçi, 23 nəfər aspirant, 1141 nəfər tələbə cəbhəyə səfərbər edildi ki, onlardan da 200 nəfəri qadın idi. Bu proses bütün ali və orta ixtisas məktəblərində həyata keçirilirdi.

Zaqafqaziya Hərbi Dairəsində siyasi şöbədə xidmətə başlayan Cəbrayıl Ələsgərov 44-cü Ordunun tərkibində Krım uğrunda gedən döyüşlərdə iştirak edir. 1943-cü ilin fevralında mayor Cəbrayıl Ələsgərov Şimali Qafqaz cəbhəsində döyüşlərdə iştirak edən qardaşları Ağabala və Mikayılın döyüşlərdə ölməsi xəbərini alır. Həmin gün ona həm də təcili olaraq Bakıya - Mərkəzi Komitəyə çağırılması haqqında teleqram verilir.

M.C.Bağırovun qəbulunda olarkən, onun əsas xahişi qardaşlarının intiqamını alması üçün ön cəbhəyə göndərilməsi olur. Respublika rəhbəri onu sakitləşdirərək deyir:"- *Hissə qapılaraq düşməndən intiqam almazlar, ağılla, səbrlə və siyasətlə hərəkət etmək lazımdır. Odur ki, sənin mübarizə yerin də, iş yerin də Mərkəzi Komitə olacaqdır."*

Azərbaycan K(b)P MK Bürosunun 1943-cü il avqustun 23-də keçirilmiş iclasının protokolundan çıxarışda oxuyuruq:"*Cəbrayıl Ağəli oğlu Ələsgərov yoldaş, 1931-ci ildən partiya üzvü, partiya bileti № 1470389, Azərbaycan K(b)P MK-nın partiya kadrları şöbəsinin bölmə müdiri - ikinci müavin vəzifəsinə təsdiq olunsun. ÜİK(b)P MK-dan bu qərarın təsdiq olunması xahiş edilsin.*

*Azərbaycan K(b)P MK katibi M.C.Bağırov."*

Sonra o, bir müddət Azərbaycan KP MK-da məktəb və elm şöbəsində

çalışır. 1944-cü ilin yanvarında daha məsul bir işə - Azərbaycan maarif komissarının müavini vəzifəsinə təyin olunur. M.C.Bağırovun 1944-cü il yanvarın 11-də imzaladığı sənəddə deyilir: *"Azərbaycan SSR Xalq Maarifi Komissarlığının kadrlar üzrə nazir müavini barəsində. Ələsgərov Cəbrayıl Ağaəli oğlu, 1931-ci il noyabr ayından ÜİK(b)P üzvü, partiya bileti nömrəsi 1470389, Azərbaycan SSR maarif nazirinin kadrlar üzrə müavini təsdiq edilsin. ÜİK(b)P MK-dan xahiş olunsun ki, bu qərarı təsdiq etsin.*

*Azərbaycan K(b)P MK katibi M.C.Bağırov".*

Azərbaycan K(b)P MK Bürosunun qərarı ilə C.Ələsgərov 1944-cü ilin aprelində İran Respublikasının Təbriz şəhərinə ezam olunur, burada baş konsulluqda çalışır. Cənubi Azərbaycanda təhsil quruculuğunda mühüm xidmətlər göstərir, bir müddət orta məktəb direktoru kimi fəaliyyət göstərir. Bakıya qayıtdıqdan sonra Azərbaycan KP MK-da kadrlar üzrə iş şöbəsinin müdir müavini təyin olunur. 1944-cü ilin yanvar ayında Azərbaycan Xalq Maarif Komissarının kadlarla iş üzrə müavini Məmməd Arif Məhərrəm oğlu Dadaşzadə Ədəbiyyat və Dil İnstitutunun direktoru vəzifəsinə təyin edildiyindən, onun yerinə yenidən Cəbrayıl Ələsgərov xalq maarif komissarının müavini təyin olunur. 1 may 1947-ci ildən 16 iyun 1951-ci ilə kimi həmin vəzifədə uğurla çalışır. Təhsil təşkilatçılığı sahəsindəki uğurlu fəaliyyətini nəzərə alaraq yenidən Azərbaycan KP MK-ya işə dəvət olunur. 1951-ci il may ayının 14-də M.C.Bağırovun tövsiyəsi ilə nazir müavini Mərkəzi Komitəyə məsul vəzifəyə irəli çəkilir. Bu barədə Azərbaycan KP MK-nın 14 may 1951-ci il tarixli qərarında deyilir: *"C.A. Ələsgərov barədə. Cəbrayıl Ağəli oğlu Ələsgərov yoldaş Azərbaycan SSR Xalq Maarifi Nazirinin müavini vəzifəsindən azad olunmaqla, Azərbaycan KP MK-nın məktəblər şöbəsinin müdiri təsdiq edilsin.*

*Azərbaycan KP MK katibi M.C. Bağırov".*

1951-1952-ci illərdə o, Azərbaycan KP MK-nın məktəblər şöbəsinə rəhbərlik edir. Həmin illərdə Cəbrayıl Ələsgərov M.C.Bağırovla daha da yaxınlaşır. Belə ki, 1951-ci il iyul ayının 10-da M.C.Bağırova ünvanlanmış məktubda SSRİ Nazirlər Sovetinin "Başqa məqsədlər üçün istifadədə olan məktəb binalarının boşaldılması barədə" 1950-ci il 28 aprel tarixli 1777 nömrəli qərarına uyğun olaraq Bakı Neft Texnikumunun 1951-ci il iyul ayının 15-dək köçürülmədiyi bildirilir.

SSRİ Nazirlər Soveti köçürülmə məsələsini SSRİ Neft Sənayesi Nazirliyinə və Azərbaycan SSR Nazirlər Sovetinə tapşırmışdı. M.C.Bağırov məktub-

la tanış olduqdan sonra həmin məsələnin icrasını Cəbrayıl Ələsgərova tapşırır. O, aylarla icrası ləngidilən problemi 9 gün ərzində həll edir və Azərbaycan K(b)P MK-ya rəsmi məlmat verir:

***"Azərbaycan K(b)P MK katibi M.C.Bağırov yoldaşa***

***Oktyabr inqilabı adına Bakı Neft Texnikumunun müvəqqəti yerləşdiyi keçmiş 35 nömrəli məktəbin binasının boşaldılması barədə***

***Arayış***

*Sizin tapşırığınızla Razin qəsəbəsindəki 1 №-li peşə məktəbinin vəziyyəti ilə tanış olaraq bu qənaətə gəldim ki, həmin binada Neft Texnikumunu da yerləşdirmək üçün tam şərait vardır. Bu məsələ ilə əlaqədar iyulun 18-də Azərbaycan SSR Nazirlər Sovetinin sədri T.Quliyev yoldaşın yanında müşavirə keçirildi və həm Bakı Neft Texnikumunun və həm də 1 nömrəli peşə məktəbinin eyni binada yerləşdirilməsi təklifi bəyənildi. Qeyd etmək lazımdır ki, 1 №-li peşə məktəbinin binası olduqca baxımsız vəziyyətdədir. Binanın təmiri Neft Texnikumunun və Respublika Əmək Ehtiyatları İdarəsinin üzərinə qoyulmuşdur. Neft Texnikumunun hazırda yerləşdiyi bina boşaldıqdan sonra Maarif Nazirliyinin balansına keçiriləcəkdir.*

*C.Ələsgərov 19 iyul 1951-ci il."*

Həmin dövrdə o, həm də ADPİ-nin Pedaqogika kafedrası ilə əməkdaşlıq edir, Cənubi Azərbaycandakı milli məktəblərin təşəkkülü və inkişafı ilə bağlı tədqiqatlarını davam etdirir. Təbrizdəki üçillik fəaliyyətini ümumiləşdirərək namizədlik dissertasiyasını başa çatdırır. 23 fevral 1952-ci ildə Azərbaycan Dövlət Universitetinin Elmi Şurasında "Cənubi Azərbaycanda xalq maarifinin inkişafı" mövzusunda dissertasiya müdafiə edərək pedaqoji elmlər namizədi alimlik dərəcəsi alır. 14 mart 1953-cü ildə onun elmi dərəcəsi SSRİ Ali və Orta İxtisas Təhsili Nazirliyi yanında Ali Attestasiya Komissiyası tərəfindən təsdiq olunmuşdur.

Həmin dövrdə Azərbaycandan böyük bir müəllim kollektivi Bolqarıstana, türklərin daha çox yaşadığı yerlərdə yeni məktəblər təşkil etmək, mövcud məktəbləri təkmilləşdirmək, tədris resursları hazırlamaq üçün ezam olunur. Nümayəndə heyətinə rəhbərlik Cəbrayıl Ələsgərova həvalə olunur. Azərbaycandan Bolqarıstana 14 nəfərdən ibarət nümayəndə göndərilmişdi. Onların arasında Mərkəzi Komitədən Cəbrayıl Ələsgərov, Azərbaycan SSR Elmlər Akademiyasının akademik-katibi İmam Mustafayev, Azərbaycan SSR Nazirlər Soveti yanında Mədəni-Maarif İşlər İdarəsi Komitəsinin sədri Süleyman Rəhimov, ADPİ-nin pedaqogika kafedrasının baş müəllimi Qasım Qafarzadə və başqaları vardı. Nümayəndə heyəti 1951-ci il fevralın 7-dən martın 8-dək

Bolqarıstan Xalq Respublikasında 60-dək şəhər və kəndi gəzmiş, 50 türk və bolqar məktəbində təhsilin vəziyyəti ilə tanış olmuş, maarif və əkinçilik nazirliklərində, 11 elmi-mədəni mərkəzdə, 7 sənaye müəssisəsində, 3 ali məktəbdə görüşlər keçirmişdi.

Cəbrayıl Ələsgərov 16 mart 1952-ci ildən 16 mart 1954-cü ilə kimi Bolqarıstan Xalq Respublikasında maarif nazirinin müşaviri vəzifəsində çalışır, məktəb quruculuğunda yaxından iştirak edir.

Bakıya qayıdan Cəbrayıl Ələsgərov V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutunun direktoru təyin olunur.

Azərbaycan K(b)P MK -nın 1954-cü il 4 may tarixli 14 nömrəli qərarında deyilir: *"V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutunun direktoru haqqında. Ələsgərov Cəbrayıl Ağəli oğlu, 1931-ci il noyabr ayından Sov.İKP üzvü, partiya bileti N1470389, V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutunun direktoru təsdiq edilməklə, H.M.Qədirov yoldaş həmin vəzifədən azad olunaraq institutun elmi işlər üzrə direktor müavini işinə keçirilsin.*

*Sov.İKP MK-dan xahiş olunsun ki, bu qərarı təsdiq etsin.*

*Azərbaycan KP MK katibi Mustafayev İ."*

Azərbaycan K(b)P MK -nın qərarına müvafiq olaraq 23 iyun 1954-cü ildə o, Azərbaycan SSR maarif naziri M.Məmmədovun əmri ilə V.İ.Lenin adına APİ-nin direktoru vəzifəsinə təyin olunur. C.Ələsgərov bu vəzifədə 1 yanvar 1957-ci ilə kimi çalışır. Onun dövründə institut komsomol komitəsinin katibi işləmiş akademik Hüseyn Əhmədov Cəbrayıl müəllimlə bağlı xatirələrini bizimlə bölüşərkən qeyd etdi ki, *o, ucaboy, yaraşıqlı, səliqəli, nüfuzlu və zəhmli adam idi. İdarəetmədə böyük təcrübəyə malik idi. Böyük Vətən müharibəsinin çətinliklərini görmüşdü, məsul vəzifələrdə, partiya və sovet işlərində çalışmışdı, Bolqarıstanda və İranda təhsil quruculuğunda iştirak etmişdi, Azərbaycan MK-da şöbə müdiri olmuşdu. Mən institutun raykom hüquqlu komsomol komitəsinin sədri olduğumdan rektorun sədrliyi ilə keçən bütün iclaslara dəvət olunurdum, böyük Elmi Şuranın üzvü idim. Nizam-intizama özü ciddi riayət etdiyindən, hamıdan da bunu tələb edirdi. İnstitut Elmi Şurasının iclasları axşam saat 6-dan sonra olardı. İclasda institutun və ayrı-ayrı fakültələrin tədris və elmi fəaliyyəti müzakirə olunurdu. Kiminsə icazəsiz danışmasının, replika atmasının, mövzudan kənar danışmasının şahidi olmadım. Bu da səbəbsiz deyildi. Hökmlü adam idi, açığı deyim ki, müəllimlərin çoxu ondan çəkinirdi. Düzgün olmayan hərəkətinə görə istənilən birisini iclasdan dərhal kənarlaşdırırdı. Bununla yanaşı təmiz adam idi, kristal və xeyirxah insan idi.*

Direktor vəzifəsində çalışarkən o, həm də pedaqogika kafedrasında saathesabı müəllim işləyirdi. Həmin illərdə respublika üçün müəllim kadrları

hazırlığında xeyli nailiyyətlər əldə edilmişdir. İldən-ilə tələbə qəbulunun sayı artırıldı, elmi dərəcəsi və elmi adı olan əməkdaşların sayı artdı, tədris və elmi-tədqiqat işlərinin səviyyəsi yüksəldi. Elmi işlər üzrə direktor müavini vəzifəsi yaradıldı. Aspirantura yolu ilə yüksəkixtisaslı mütəxəssislərin hazırlanmasına, elmi-tədqiqat işlərinin kəmiyyət və keyfiyyətinin artırılmasına xüsusi diqqət yetirildi. İldən-ilə tələbə kontingentinin artması auditoriya problemi yaratmışdı. Məhz Cəbrayıl Ələsgərovun instituta rəhbərliyi dövründə böyük çətinliklər hesabına institutun əsas binasına bitişik dördmərtəbəli tədris korpusunun tikintisinə başlanır. 1956-cı ildə 6267 kv.m. sahəsi olan həmin bina istifadəyə verilir. İnstitutda uzun müddət kadrlar şöbəsinin rəisi işləmiş Rəşid Zeynalov prof.Məlikməmməd Cəbrayılova danışırmış ki, həmin binanın tikintisi Cəbrayıl Ələsgərovun Azərbaycan KP MK-dakı şəxsi əlaqələrinin, təşkilatçılığının və nüfuzunun nəticəsində ərsəyə gəlmişdir. Binanın tikintisi üçün zəruri olan materialların bir hissəsini dost-tanışları vasitəsi ilə əldə edərmiş. Tez-tez də Rəşid müəllimdən soruşarmış ki, buna görə mənim cəzam nə ola bilər? (Rəşid Zeynalov ixtisasca hüquqşünas idi). Rəşid müəllim deyəndə ki, heç nə, uzaqbaşı töhmət. Onda deyərmiş, işi sürətləndirmək lazımdır, təki bina tez başa gəlsin - deyə vurğulayarmış.

1956-cı ilin dekabrında Cəbrayıl Ələsgərov V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutunun direktoru vəzifəsindən azad olunur. Azərbaycan KP MK-nın müvafiq qərarında deyilir: *"V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutunun direktoru haqqında Vəkilov Mehdixan Yusif oğlunun, 1939-cu ilin avqustundan Sov.İKP üzvü, partiya bileti N06628807, V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutunun direktoru təsdiq olunmasına dair Azərbaycan SSR Maarif Nazirliyinin təklifi qəbul edilməklə, C.Ə.Ələsgərov həmin vəzifədən azad olunsun.*

*Azərbaycan KP MK katibi İ.Mustafayev.*
*14 dekabr 1956-cı il."*

1957-1958-ci illərdə Azərbaycan SSR Siyasi və Elmi Bilikləri Yayan Cəmiyyətin İdarə Heyətinin məsul katibi vəzifəsində çalışır. 1957-ci il yanvarın 4-də Cəbrayıl Ələsgərov həmin vəzifəyə təyin edilir. C.Ələsgərovun Azərbaycan Pedaqoji İnstitutunun direktoru vəzifəsindən çıxarılması ilə bağlı fevralın 14-də Moskvaya, Sov.İKP MK-ya aşağıdakı məzmunda məktub göndərilmişdir. Azərbaycan Respublikası Prezidentinin İşlər İdarəsi Siyasi Sənədlər Arxivində saxlanan həmin məktub tanınmış tədqiqatçı Teyyub Qurban tərəfindən ilk dəfə ictimaiyyətə təqdim olunub. Məktubun məzmunu ilə tanış olaq: *"V.İ.Lenin adına Pedaqoji İnstitutun keçmiş direktoru C.A.Ələsgərovun vəzifəsindən kənarlaşdırılması səbəbləri barəsində.*

*V.İ.Lenin adına Azərbaycan Pedaqoji İnstitutunda aparılmış yoxlamalardan müəyyən edilmişdir ki, müəllim hazırlığı işinin yaxşılaşdırılmasında cüzi irəliləyişə baxmayaraq, insitutun fəaliyyətində çox ciddi nöqsanlar aradan qaldırılmamışdır. İctimai fənlərin tədrisi qeyri-qənaətbəxşdir, kafedralarda elmi-tədqiqat işləri aşağı səviyyədədir. Tələbələrin politexnik hazırlığı geridə qalır.*

*V.İ.Lenin adına APİ-nin direktorluğu tələbələrin Azərbaycan dilində dərsliklərlə təmin olunması məqsədilə lazımi tədbirlər görməmişdir. C.A.Ələsgərov yoldaş institutun direktoru kimi təhsil prosesinə dərindən nüfuz etməmiş, elmi-tədqiqat işləri və kadrların elmi-nəzəri səviyyəsinin yüksəldilməsi məsələləri ilə səthi məşğul olmuşdur.*

*Yoxlama zamanı 1956/57-ci tədris ilində abituriyentlərin qəbulu işində də ciddi nöqsanlar aşkara çıxarılmışdır. C.A.Ələsgərov yoldaş qəbul imtahanları üzrə imtahan komissiyalarının tərkibinə məsuliyyətsizcəsinə yanaşmış, nəticədə instituta tələbə adına layiq olmayan ləyaqətsiz şəxslər yüksək qiymətlə qəbul olunmuşlar. C.A.Ələsgərov yoldaşın instituta rəhbərliyi vaxtında maliyyə intizamının kobudcasına pozulması hallarına da yol verilmişdir ki, buna görə o, Azərbaycan SSR Maarif Nazirliyi tərəfindən tənbeh almışdır.*

*C.A.Ələsgərov və institutun partiya bürosunun keçmiş katibi H.Əliyev yoldaşlar özlərinin yanlış rəhbərlik metodları ilə kollektivdə narazılıq və qeyri-sağlam münasibət yaratmışlar. 1956-cı il dekabr ayında keçirilmiş partiya hesabat-seçki yığıncağında partiya bürosunun yeni tərkibin seçilməsi zamanı kommunistlər C.A.Ələsgərova etimad göstərməyərək, onun namizədliyinin əleyhinə səs vermişlər.*

*Bütün bu şərh olunan səbəblərə görə, Azərbaycan KP MK Bürosu özünün 1956-cı il 11 dekabr tarixli qərarı ilə C.A.Ələsgərovu V.İ.Lenin adına Azərbaycan Pedaqoji İnstitutunun direktoru vəzifəsindən azad etmişdir.*

*Hal-hazırda C.A.Ələsgərov yoldaş Azərbaycan SSR Siyasi və Elmi Bilikləri Yayan Cəmiyyətin İdarə Heyətinin məsul katibi vəzifəsində çalışır və V.İ.Lenin adına Azərbaycan Pedaqoji İnstitutunun pedaqogika kafedrasında yarımştat vahidilə dərs deyir.*

*Azərbaycan KP MK katibi A.Bayramov."*

Məktubun yazılmasına səbəb, fikrimizcə, Sov.İKP MK-nın Azərbaycan KP MK-dan tanınmış təhsil təşkilatçısı, dövlət və partiya işçisi Cəbrayıl Ələsgərovun vəzifədən azad edilməsi ilə bağlı izahat istəməsi ilə bağlı olub. Arayış məqsədli və tələsik hazırlandığından fakt və rəqəmlərdə uyğunsuzluq özünü göstərir. ADPİ-də konkret hansı və nə vaxt aparılmış yoxlamadan söhbət

getdiyi bəlli deyil, arxivdə buna dair heç bir material yoxdur. Araşdırma zamanı həmin dövrdə ADPİ ilə bağlı Azərbaycan KP MK-ya göndərilən sənədlərin içərisində nə Azərbaycan KP MK, nə də Azərb. SSR Maarif Nazirliyi tərəfindən institutda aparılan yoxlama ilə bağlı sənədlərə rast gəlmədik. Bəs İmam Mustafayevin Cəbrayıl Ələsgərovu vəzifədən azad etməsinin əsas səbəbi nə idi? O, Azərbaycan KP MK-da vaxtı ilə İmam Mustafayevlə birlikdə işləmişdi, Bolqarıstanda bir yerdə səfərdə olmuşdular. Bir-birini yaxşı tanıyırdılar. İnstitutda qısa bir vaxtda xeyli iş görülmüşdü, yeni bir tədris korpusu tikilmişdi. Müxtəlif orden və medallarla təltif olunmuş bacarıqlı partiya işçisinə və tanınmış təhsil təşkilatçısına qarşı yuxarı dairələrdə münasibətin birdən-birə kəskinliklə dəyişməsinin səbəbi nə idi?

Cəbrayıl Ələsgərovun direktor vəzifəsindən azad edilməsinin səbəbini ADPU-nun Azərbaycan dili və onun tədrisi metodikası kafedrasının professoru Nadir Abdullayev belə xatırlayır:"*1953-cü il iyulun 12-13-də Azərbaycan KP MK və Bakı Komitəsinin birləşmiş VI plenumu olmuşdu. Həmin plenumda Azərbaycan KP MK-nın birinci katibi M.C.Bağırov vəzifəsindən azad edilərək həbs olunmuşdu. Onun məhkəməsi, institumuzun əsas binasının yanındakı indiki Dövlət Təhlükəsizliyi Xidmətinin Mədəniyyət Mərkəzində keçirilirdi. Nürnberqdə SSRİ-nin nümayəndəsi olmuş prokuror Rudenko onun məhkəməsini aparırdı. Məhkəmə iclaslarının birində M.C.Bağırovun yaxın adamlarından biri kimi Cəbrayıl Ələsgərovun adı çəkilir. Hətta məhkəməyə böyük Azərbaycan bəstəkarı Ü.Hacıbəyovun dəfn mərasimi ilə bağlı bir neçə şəkil təqdim olunur. Şəkillərin birində M.C.Bağırov tabutun ön hissəsindən, Cəbrayıl Ələsgərovun isə arxa tərəfindən tutduğu görünür. Məhkəmədə Cəbrayıl Ələsgərovun adının hallanması ona qarşı münasibətin dəyişməsinə səbəb oldu. Məhkəmə iclasının səhəri günü müəllimlərimiz deyirdi ki, rektorumuzun vəziyyəti pisdir, onu çıxaracaqlar. Elə də oldu. 1956-cı ilin dekabr ayının əvvəllərində rektorumuzu vəzifəsindən azad etdilər. Mehdixan Vəkilovu onun yerinə təyin etdilər".*

Cəbrayıl Ələsgərov 1958-ci ildən ömrünün sonuna kimi ADU-nun pedaqogika və psixologiya kafedrasında dosent vəzifəsində çalışır.

Onun təhsil, partiya və sovet orqanlarında səmərəli fəaliyyəti dövlət və hökumət tərəfindən yüksək qiymətləndirilmişdir. O, "Qırmızı Əmək Bayrağı", "Şərəf Nişanı" ordenləri, "Qafqazın müdafiəsinə görə", "Böyük Vətən müharibəsində şərəfli əməyinə görə", "Almaniya üzərindəki qələbəyə görə" medalları ilə təltif olunmuş, Bakı Şəhər sovetinin deputatı seçilmişdir.

Cəbrayıl Ələsgərovun həyat yoldaşı Zəminiyə Səlim qızı Ələsgərova 1913-cü ildə Bakı şəhərində anadan olmuşdur. Azərbaycan Neft İnstitutunun Neft - mədən fakültəsini bitirdikdən sonra 1935-ci ildən başlayaraq, Stalin

adına Bakı Neftayırma Zavodunun laboratoriyasında laborant, sonra isə həmin laboratoriyanın müdiri vəzifəsində çalışıb.1940-cı ildə partiya sıralarına qəbul edilmişdir. "Şərəf Nişanı" ordeni ilə təltif olunmuşdur. Övladları olmasa da Cəbrayıl Ələsgərovun müharibədə həlak olan qardaşlarının 7 uşağını onlar böyüdüb boya-başa çatdırmışdır.

Cəbrayıl Ağaəli oğlu Ələsgərov 1969-cu ildə vəfat etmişdir.

## Ədəbiyyat


1. ADPU-nun arxivi. Cəbrayıl Ağaəli oğlu Ələsgərovun şəxsi işi № 27
2. Azərbaycan Respublikası Prezidentinin İşlər İdarəsi Siyasi Sənədlər Arxivi. f.1., saxlama siyahısı 29, iş 6, v.89 (Cəbrayıl Ağaəli oğlu Ələsgərovun Azərbaycan Xalq Maarif Komissarının müavini təyin olunması haqqında Azərbaycan KP MK Bürosunun qərarı. 5-7 yanvar, 1944, Protokol № 334)
3. Аббасов Э.М.. Неизвестные страницы истории Бакинского Государственного Университета // Вопрос истории, 2018, № 8, стр. 70-86
4. Teyyub Qurban .Düşmənlərindən güclü şəxsiyyət. Bakı, Şirvannəşr, 2006



**MEHDİXAN YUSİF OĞLU VƏKİLOV**
*tarix elmləri doktoru, professor*
*Əməkdar elm xadimi*
*(1902-1973)*

Mehdixan Yusif oğlu Vəkilov 1902-ci il iyun ayının 15-də Qazax qəzasının Yuxarı Salahlı kəndində anadan olub. İbtidai təhsilini 1910-1914-cü illərdə dördsinifli kənd məktəbində alıb. Anası Məhbubəni erkən itirdiyindən onun tərbiyəsi ilə nənəsi Aişə Əliskəndər qızı məşğul olur. Nənəsi onu Cənubi Qafqaz müftisi Hüseyn əfəndi Qayıbzadənin Tiflisdə yoxsullar üçün təsis etdiyi pansion tipli məktəbə göndərir. 1917-ci ilə kimi Mehdixan orada yaşayır və oxuyur. Fevral-burjua inqilabından sonra Tiflisdə ictimai-siyasi vəziyyət tamamilə dəyişdiyindən o, Qazaxa, nənəsinin yanına qayıdır və buradakı ali ibtidai məktəbə daxil olur. Bir il sonra Azərbaycan xalqı zaman-zaman uğrunda şəhid verdiyi müstəqilliyinə qovuşur. Yeni yaranan hökumətin həyata keçirməyə başladığı ilk tədbirlərindən biri təhsilin milliləşdirilməsi və demokratikləşdirilməsi idi.Təhsilin milliləşdirilməsi milli dövlətçiliyin əsas dayaqlarından biri hesab olunurdu. Bu işin bütün ağırlığı və məsuliyyəti isə müəllimlərin üzərinə düşürdü. Azərbaycanda müəllim kadrları hazırlayan təhsil müəssisəsi yox idi. Qori Müəllimlər Seminariyasının müsəlman şöbəsi böyük maarifçi F.Köçərlinin fədakarlığı nəticəsində Qazaxa köçürüldü və 1918-ci ildə burada fəaliyyətə başladı. Həmin dövrdə Mehdixanın atası və balaca qardaşı Səməd (Xalq şairi Səməd Vurğun) kənddə yaşayırdı. Onlar da Qazaxa köçürlər. Hər iki qardaş - Mehdixan və Səməd Qazax Müəllimlər Seminariyasına qəbul edilir. Atası Yusif kişi isə seminariyada işə düzəlir. Mehdixan ilk gündən fəallığı və diribaşlığı ilə seçilir, 1920-ci ildə komsomol sıralarına daxil olur. Siyasi yetkinliyi ilə seçilən Mehdixan Qazax qəzasında

komsomol təşkilatının formalaşmasında mühüm rol oynayır. Həmin illərdə o, böyük acılar yaşayır; 1922-ci ildə atasını, bir il sonra isə ona analıq etmiş nənəsini itirir.

1924-cü ildə Qazax Müəllimlər Seminariyasını bitirən Mehdixanın qarşısında yeni perspektivlər açılır. Gəncə qəza məktəblərində müfəttiş (1924-1925), Quba qəza maarif şöbəsinin müdiri (1925-1926-cı illər) və Şuşa şəhərində təşkil olunmuş müəllimlər kursunun müdiri (1926) vəzifələrində çalışır. Mədəni quruculuq işlərində, savadsızlığın ləğvində, xalqın maariflənməsi sahəsində ölkədə aparılan işlərin fəallarından biri olur. 1926-cı ildə ali təhsilli tarix müəllimi olmaq arzusu ilə Azərbaycan Pedaqoji İnstitutuna daxil olur. Elə həmin il Pedaqoji İnstitut Bakı Dövlət Universiteti ilə birləşir, o, təhsilini universitetin Pedaqoji fakültəsinin tarix şöbəsində davam etdirməli olur. Respublikada ali pedaqoji təhsili yenidən qurmaq məqsədilə Azərbaycan Xalq Komissarları Sovetinin 19 iyun 1930-cu il tarixli "Azərbaycan SSR ali məktəblərinin və ali texniki məktəblərinin yenidən təşkili və rayonlaşdırılması, onların müvafiq təsərrüfat idarələri və Xalq Komissarlıqları tərkibinə verilməsi haqqında" qərarı ilə V.İ.Lenin adına BDU-nun Pedaqoji fakültəsinin bazası əsasında Azərbaycan Pedaqoji İnstitutu təşkil olunur.

Mehdixan Vəkilov 1931-ci ildə Azərbaycan Pedaqoji İnstitutunun məzunu olur. Tələbəlik illərində də o, sevimli peşəsindən ayrılmır, 1927-1929-cu illərdə Balaxanı və Suraxanıdakı fabrik-zavod məktəblərində, 1929-1930-cu illərdə Kooperativ Texnikumunda ictimaiyyat fənnindən dərs deyir. Ali təhsilli tarix müəllimi kimi bir il Qəbələdə (1931) işləyir. Sonra bir müddət Azərbaycan Kənd Təsərrüfatı İnstitutunda, pedaqoji məktəbdə, partiya məktəbində (1931-1933), Bakı kolxoz məktəbində (1933-1934) ictimai elmlərdən dərs deyir, 1934-1938-ci illərdə Xalq Maarif Komissarlığında müfəttiş, 1938-1941-ci illərdə Respublika Xalq Komissarları Soveti yanında İncəsənət işləri idarəsində teatr şöbəsinin müdiri və SSRİ EA-nın Azərbaycan filialının Tarix İnstitutunun şöbə müdiri (1940-1942) vəzifələrində çalışır.

İkinci dünya müharibəsi Mehdixan Vəkilovun da həyatında silinməz izlər qoymuşdur. Azərbaycan KP MK tərəfindən Cənubi Azərbaycanda antifaşizm və milli azadlıq ideyalarını təbliğ etmək məqsədilə İranın Təbriz şəhərinə ezam olunmuşdur. 1941-ci ilin sentyabr ayından 1942-ci ilin may ayına kimi orada "Vətən yolunda" qəzetində (redaktoru Mirzə İbrahimov) və Təbriz ziyalılarının nəşr etdikləri "Azərbaycan" (redaktoru İsmayıl Şəms) qəzeti ilə əməkdaşlıq etmişdir. Təbrizdən doğma Qazaxa qayıtmış, az bir müddət Qazax Rayon Zəhmətkeş Deputatları İcraiyyə Komitəsinin sədri (sentyabr-noyabr 1942) işləmiş, sonra həmin ilin noyabr ayından 1945-ci ilin may ayına qədər

Ağstafa rayon Partiya Komitəsinə (faktiki olaraq rayona) rəhbərlik edərək, cəbhəyə ümumxalq yardımının gücləndirilməsində fəal iştirak etmişdir.

1945-1949-cu illərdə Azərbaycan SSR Xalq Komissarları Sovetinin Poliqrafiya və nəşriyyat işləri idarəsinə rəhbərlik etmişdir. 1946-1956-cı illərdə S.M.Kirov adına Azərbaycan Dövlət Universitetində və Ü.Hacıbəyov adına Azərbaycan Dövlət Konservatoriyasında ictimai fənlərdən dərs demişdir. 30 iyun 1954-cü ildə S.M.Kirov adına Azərbaycan Dövlət Universitetində "Kommunist Partiyasının Azərbaycanda mədəni quruculuq tədbirləri (1921-1925-ci illər)" mövzusunda tarix elmləri namizədi alimlik dərəcəsi almaq üçün dissertasiya müdafiə etmişdir. 14 aprel 1956-cı ildə SSRİ Ali Təhsil Nazirliyi yanında fəaliyyət göstərən Ali Attestasiya Komissiyası onun Marksizm-leninizm kafedrası üzrə dosent elmi adını təsdiq etmişdir. Elmi dərəcə və elmi ad alması onun karyerasında uğurlu illər kimi yadda qalıb. 1956-cı ilin dekabr ayında Azərbaycan Dövlət Pedaqoji İnstitutuna rektor vəzifəsinə təyin olunur və bu vəzifədə 1962-ci ilin oktyabr ayına kimi uğurla çalışır. İctimai-siyasi, elmi-pedaqoji fəaliyyətini və bədii yaradıcılığını uğurla əlaqələndirir. SSRİ və Azərbaycan tarixinin işlənməyən və ya az tədqiq olunan problemləri ilə bağlı maraqlı əsərləri nəşr olunur. Azərbaycan xalqının Cavanşirin sərkərdəliyi ilə işğalçılara qarşı apardığı mübarizə, qədim Alban dövlətinin Bizansla iqtisadi, diplomatik və dostluq əlaqələri, monqol istilası və ona qarşı mübarizə, 1905-1907-ci illər fevral-burjua inqilabının Azərbaycanda milli mədəniyyətin inkişafına təsiri, "mədəni inqilab"ın həyata keçirilməsində Kommunist Partiyasının siyasəti, Azərbaycanda mətbuatın təşəkkülü və inkişafı onun tədqiqatlarının əsasını təşkil edirdi. Mehdixan Vəkilov ictimai inkişafın ən mürəkkəb problemlərindən biri olan XX əsrdə Azərbaycanda mədəni inqilab məsələlərinin tarixini dərindən və hərtərəfli tədqiq edən ilk azərbaycanlı alimlərdən biri olmuşdur. Respublikamızda milli maarifin ilk pionerlərindən, təşkilatçılarından, həmçinin də onun tədqiqatçılarından biridir. O, orta məktəblər üçün nəzərdə tutulan "SSRİ tarixi" və "Orta əsrlər tarixi" dərsliklərinin tərcüməçisi və redaktoru idi. Bacarıqlı elm və təhsil təşkilatçısı olmaqla bərabər tarixçi-alimlər arasında yüksək nüfuza malik idi.

Müharibə illərində yazdığı Azərbaycan xalqının şanlı mübarizə ənənələrini tərənnüm edən "Cavanşir" romanı, "Anadillər" povesti, 40-dan çox elmi əsəri, kütləvi informasiya vasitələrində dərc olunmuş çoxsaylı dəyərli elmi-populyar məqalələri xalqda vətənə alovlu məhəbbət, düşmənə nifrət hissinin güclənməsində böyük rol oynamışdır. Onun elmi-pedaqoji və ictimai-siyasi fəaliyyəti ilə bağlı görkəmli Azərbaycan alimlərinin SSRİ Ali Təhsil Nazirliyinin yanında fəaliyyət göstərən Ali Attestasiya Komissiyasına ünvanladıqları elmi arayış (məktub) bunu sübut edir. Məktubu imzalayanlar

Azərbaycan EA-nın vitse-prezidenti, Azərb.EA-nın müxbir üzvü,tarix elmləri doktoru, professor Ə.Sumbatzadə, Azərb.EA-nın müxbir üzvü, professor A.O.Makovelski, Azərb.EA-nın həqiqi üzvü, tarix elmləri doktoru, professor Ə.K.Əlizadə, Azərb.EA-nın həqiqi üzvü M.İbrahimov, Azərb.EA-nın müxbir üzvü, tarix elmləri doktoru, professor İ.A.Hüseynov, tarix elmləri doktoru, professor Z.İbrahimov, Azərb.EA-nın müxbir üzvü, filologiya elmləri doktoru, professor M.A.Dadaşzadə, Azərb.EA-nın müxbir üzvü, filologiya elmləri doktoru, professor Ə.M.Dəmirçizadə, fəlsəfə elmləri doktoru, professor Ə.K.Zəkuzadə, pedaqoji elmlər doktoru, professor Ə.Y.Seyidov, tarix elmləri doktoru, professor P.B.Məsimov Mehdixan Vəkilovun elmi-pedaqoji və ictimai-siyasi fəaliyyətini geniş xarakterizə edərək ona doktorluq dissertasiyası müdafiə etmədən professor elmi adının verilməsini məsləhət bilirlər. M.Vəkilov rektor vəzifəsindən azad olunduqdan sonra SSRİ tarixi kafedrasında öz təşkilatçılıq və elmi fəaliyyətini davam etdirir. Müxtəlif elmi konfranslarda elmi məruzələrlə çıxış edir, intensiv olaraq doktorluq dissertasiyası üzərində çalışır. 12 dekabr 1969-cu ildə Azərbaycan Dövlət Universitetinin Elmi Şurasında “Kommunist Partiyası Azərbaycanda mədəni inqilabın təşkilatçısıdır” mövzusunda doktorluq dissertasiyası müdafiə edərək tarix elmləri doktoru elmi dərəcəsi alır. 7 aprel 1971-ci ildə ona SSRİ tarixi kafedrası üzrə professor elmi adı verilir. O, uzun müddət tarix kafedrasının müdiri vəzifəsində çalışmışdır. Prof. Mehdixan Vəkilov tədris işini böyük məharətlə elmi fəaliyyətlə əlaqələndirməyi bacaran görkəmli alimlərdən idi. Azərbaycan, türk, rus, fars dillərini mükəmməl bilməsi ona şöhrət qazandırmışdı.

Mehdixan Vəkilov Azərbaycan Kommunist Partiyasının XXII qurultayında Təftiş Komissiyasının üzvü seçilib. Xeyli müddət Azərbaycan KP MK-nın ştatdankənar mühazirəçisi kimi fəaliyyət göstərib. Bakı Şəhər Sovetinin (1959-1960-cı illər) üzvü olub. V çağırış Azərbaycan SSR Ali Sovetinin deputatı seçilib. 1959-1963-cü illərdə Azərbaycan SSR Ali Sovetinin sədr müavini olub. 2 dəfə “Şərəf nişanı” ordeni (1943, 1964), “Birinci dərəcəli Böyük Vətən müharibəsi ordeni” (1944), müxtəlif medallarla və Azərbaycan SSR Ali Sovetinin Fəxri fərmanları ilə təltif olunub. Azərbaycan SSR Ali Sovetinin qərarı ilə ona “Əməkdar elm xadimi” (1973) fəxri adı verilmişdir. O, həm də “Qabaqcıl maarif xadimi” (1973) döş nişanı ilə təltif olunmuşdu. Yüksək fəxri adlara layiq görülməsi onun elmi-pedaqoji fəaliyyətinə verilən yüksək qiymətin təzahürü idi.

Onun “Minin və Pojarski” (1941), “Cavanşir” (1941;1943), “Azərbaycanda mədəniyyətin çiçəklənməsi” (1955), “Ömür dedikləri bir karvan yolu” (1986), ”Anadillər”(1991), “Cavanşir”(1992, Təbriz, 2004), “Anadillər” (Təbriz, 2004), “Azərbaycanda mədəni inqilab: 1920-1940-cı illər” (2005) adlı kitabları və 40-dan artıq elmi məqaləsi nəşr olunmuşdur.

***Mehdixan Yusif oğlu Vəkilov***

22 iyun 1973-cü ildə prof.Mehdixan Vəkilovun anadan olmasının 70, elmi-pedaqoji və ictimai fəaliyyətinin 50 illiyi V.İ.Lenin adına ADPİ-də təntənəli şəkildə qeyd olunmuşdur. Tədbiri institutun rektoru, prof.H.Ağayev açaraq Mehdixan Vəkilovun həyatı, pedaqoji və ictimai fəaliyyətindən, onun elm və mədəniyyət xadimi kimi yetişməsindən, rektor və kafedra müdiri kimi səmərəli fəaliyyətindən danışmışdır. Sonra Sov.İKP tarixi kafedrasının müdiri prof.Z.Şıxlinski Mehdixan Vəkilovun həyat və yaradıcılığı ilə bağlı geniş məruzə etmişdir. İnstitutun elmi işlər üzrə prorektoru professor R.Rəcəbov rektorluğun, partiya komitəsinin və ictimai təşkilatların yubilyara təbrik məktubunu oxumuşdur. Azərbaycan SSR maarif nazirinin müavini Rəfiqə Hüseynova ona "Qabaqcıl maarif xadimi" döş nişanını təqdim etmişdir. ADU-nun professorları M.Qazıyev, Y.Yusifov, Tibb İnstitutunun Tarix kafedrasının müdiri E.Məmmədov, Neft və Kimya İnstitutunun kafedra müdiri İ.Babayev, APİ-nin Tarix fakültəsinin dekanı dos.H.Qasımzadə, Pedaqogika kafedrasının müdiri prof.Ə.Seyidov, institut komsomol komitəsinin katibi R.Əliyev, Azərbaycan dilçiliyi kafedrasının müdiri prof.Ə.Dəmirçizadə, Riyazi analiz kafedrasının dosenti H.Cəfərov, İbtidai təhsilin pedaqogikası və metodikası fakültəsinin dekanı dos.N.Abbasova, Biologiya fakültəsinin dekanı prof.R.Qafarova, Sov. İKP tarixi kafedrasının dosenti M.Hacıyev və b. çıxış edərək yubilyarın bütün gənclərə nümunə ola biləcək çətin, mənalı və şərəfli həyat yolunun ayrı-ayrı məqamlarını dilə gətirmişlər. Yubilyar Azərbaycan LKGİ-nin Fəxri Fərmanı və qiymətli hədiyyələrlə təltif olunmuşdur.



*İki qardaş: M.Vəkilov və S.Vurğun (1932)*

Bütün bunlar onun alim, ictimai xadim və el ağsaqqalı kimi böyük hörmət və nüfuz sahibi olmasına dəlalət edir.

Özünün və müasirlərinin xatirələrindən aydın olur ki, o, böyük şairimiz Səməd Vurğun üçün həm böyük qardaş, həm də valideyn əvəzi, yaradıcılıq yolunda onun fədakar dayağı olmuşdur. "Ömür dedikləri bir karvan yolu" kitabı qardaşı haqqında ən maraqlı xatirə çələngidir. Müasirləri onu Səməd Vurğunun "Komsomol poeması"nda yaratdığı Cəlal obrazının prototipi sayır. Mehdixan Vəkilov ömrünün sonlarında qardaşı,

sevimli Xalq şairimiz Səməd Vurğunun həyatından bəhs edən "Qardaşım haqqında povest" adlı bədii əsər üzərində işləyirdi. O, kitabı şairin anadan olmasının 70 illiyinə kimi tamamlamağa çalışırdı. Ancaq gözlənilməz ölüm ona əsəri bitirməyə imkan vermədi.

1975-ci il oktyabr ayının 18-də Bakı şəhərində vəfat edən Mehdixan Vəkilov II Fəxri Xiyabanda dəfn olunub. Onun haqqında Azərbaycan SSR Ali və Orta İxtisas Təhsili Nazirliyinin və Azərbaycan Dövlət Pedaqoji İnstitutunun rektorluğunun birgə imzaladığı nekroloqda deyir: "Görkəmli alim, dövlət və maarif xadimi, sevimli müəllim Mehdixan Vəkilovun əbədi xatirəsi onun yoldaşlarının, dostlarının və minlərlə tələbələrinin hafizəsindən heç vaxt silinməyəcəkdir".

Mehdixan Vəkilov 1931-ci ildə Qəbələdə müəllimlik edərkən, heykəltəraş Fuad Əbdürrəhmanovun xalası qızı Ruqiyyə İbrahim qızı Paşabəyova (1916-2006) ilə ailə qurmuşdur. Qızı Çiçək (1939-2007) bioloq idi; Sevinc Ələkbərova (1961) adlı nəvəsi, Leyla (1988) adlı nəticəsi vardır. Oğlu Cavanşir (1951-2013) Azərbaycan Respublikası Xarici İşlər Nazirliyində şöbə müdiri, müşavir vəzifələrində çalışmışdır. 2004-cü il oktyabr ayının 20-də Azərbaycan Respublikasının Təbrizdə Baş Konsulluğunun açılışını təşkil etmişdir. Mehdixan Vəkilovun Ruqiyyə (1982), Mərziyyə (1984) adlı nəvələri, Novruz (2009), Tamerlan (2011) və Mehin (2012) adlı nəticələri var.

## Ədəbiyyat


1. ADPU-nun arxivi.Vəkilov Mehdixan Yusif oğlunun şəxsi işi. № 20, 13 v.
2. ADPU-nun arxivi.Vəkilov Mehdixan Yusif oğlunun şəxsi işi. № 5858, 42 v.
3. Seyidov F.Maarifimizin təkrarsız xəzinəsi (Qazax seminariyası və onun məzunları haqqında). Bakı, 2001, s.187-188
4. Mehdixan Yusif oğlu Vəkilov-70."Gənc müəllim" qəzeti, 28 iyun 1973-cü il
6. Mehdixan Vəkilovun nekroloqu. "Kommunist" qəzeti, 21 oktyabr 1975-ci il
7. ASE, c. 2, Bakı: 1978, səh. 460.
8. Əlibala Hacızadə. Yaradan yaşayır, "İki sahil", 11 dekabr 1991-ci il
9. Vaqif Vəliyev. Görkəmli maarif və elm xadimi, "Azərbaycan müəllimi", 23 sentyabr 1992-ci il
10. Bəhlul Ağayev, Xəlil Köçərli. Görkəmli pedaqoq və tədqiqatçı alim. Mehdixan Vəkilov-100. "Respublika" qəzeti, 26 may 2002-ci il
11. İsmayıl Umudlu. Yaradıcılıq ömrünün izləri. Mehdixan Vəkilovun ədəbi və elmi irsindən ştrixlər. "Respublika" qəzeti, 17 iyul 2009-ci il
12. İsmayıl Umudlu. Vəkiloğulları. Bakı: "QAPP-poliqraf" nəşriyyatı, 2003, səh. 55-61.


***Mehdixan Yusif oğlu Vəkilov***



**MEHDİ SADIQ OĞLU ƏLİYEV**
*Əməkdar elm xadimi, professor*
*(1907- 1972)*

Mehdi Sadıq oğlu Əliyev 1907-ci il dekabrın 21-də Gəncə şəhərində anadan olmuşdur. O,1920-1924-cü illərdə Gəncə Müəllimlər Seminariyasında oxumuş, bir müddət Gəncədə müəllimlik etmişdir. Ali təhsil almaq məqsədi ilə Bakıya gələn Mehdi Əliyev 1925-1930-cu illərdə Azərbaycan Dövlət Universitetinin fizika-riyaziyyat fakültəsində təhsil alır. İstedadlı məzun kimi Azərbaycan Pedaqoji İnstitutuna göndərilir. Elə həmin il SSRİ-də ali təhsil sahəsində aparılan düzgün olmayan siyasətin nəticəsində Azərbaycan Dövlət Universiteti ləğv olunur. Onun ayrı-ayrı fakültələrinin bazası əsasında 4 institut yaradılır ki, onlardan da biri Azərbaycan Dövlət Pedaqoji İnstitutu idi. Universitetin Pedaqoji fakültəsinin bazasında Azərbaycan Dövlət Pedaqoji İnstitutu təşkil olunur. Pedaqoji ixtisasların müəllim heyəti və elmi kadr potensialı tələbələrlə birlikdə ADPİ-yə köçürülür. Pedaqoji İnstitutun həyatının ikinci dövrü başlayır. ADU-nun tanınmış alimləri müəllim kadrları hazırlığına cəlb edilir, institutun təchizatı xeyli yaxşılaşır, tələbələrin sayı artır. Bu illər Mehdi Əliyev üçün uğurlu olur. O, ADPİ-də 1931-1935-ci illərdə Fizika-riyaziyyat fakültəsinin dekanı vəzifəsində çalışır. Dekan vəzifəsində çalışmaqla yanaşı Azərbaycan Tibb İnstitutunda, Azərbaycan Kənd Təsərrüfatı İnstitutunda (institut həmin dövrdə Bakıda yerləşirdi), Azərbaycan Sənaye İnstitutunda, Tbilisidəki Zaqafqaziya Dəmir Yolları İnstitutunda fizikadan mühazirələr oxuyur, ixtisaslı kadrların yetişməsinə öz töhfəsini verir. 1933-cü ildə elmi uğurlarına görə ona dosent elmi adı verilir. Azərbaycan Dövlət Universiteti yenidən təşkil olunduqdan sonra Mehdi müəllim doğma universitetinə qayıtmış, elmi-pedaqoji fəaliyyətini orada davam etdirmişdir. Bacarıqlı təhsil təşkilatçısı, peşəkar fizika müəllimi kimi tanınan

*Mehdi Sadıq oğlu Əliyev*

Mehdi müəllim ADU-da Fizika-riyaziyyat fakültəsinin dekanı vəzifəsinə seçilir. 1941-ci ilin iyun ayında rektor Cəbrayıl Ələsgərov kimi o da tələbələrlə birlikdə könüllü olaraq ön cəbhəyə gedir. NKVD-nin (Daxili İşlər Xalq Komissarlığı ) 30-cu polkunda sıravi əsgər kimi Donbasın müdafiəsində işti-



rak edir. Ağır döyüşlərin iştirakçısı olur. Döyüşlərin birində ağır yaralanır, bir müddət hospitalda müalicə olunur. 1942-ci ilin may ayında hərbiyə uyğun gəlmədiyinə görə tərxis olunur. Yenidən qaynar universitet həyatına qovuşur, 1944-cü ildə Fizika-riyaziyyat fakültəsinin dekanı vəzifəsinə seçilir.

Müharibənin yaratdıqları çətinliklərə baxmayaraq yorulmadan çalışır, coşqun elmi-pedaqoji fəaliyyəti ilə tələbələrin, həmkarlarının və universitet rəhbərliyinin hüsn-rəğbətini qazanır. Mükəmməl elmi-nəzəri hazırlığı, peşəkarlığı, səmərəli təşkilatçılıq qabiliyyəti, yüksək mənəvi-əxlaqi keyfiyyətləri, vətənpərvərliyi və insanseverliyi ilə seçilən Mehdi müəllim 1952-ci ildə təhsilimizin flaqmanı olan ADU-nun tədris işləri üzrə prorektoru kimi daha məsul vəzifəyə irəli çəkilir. O, bu vəzifədə səmərəli fəaliyyət göstərir, tədrisin yüksək səviyyədə təşkilində, müəllimlərin tədris və elmi fəaliyyətlərinin uğurla əlaqələndirilməsində, zəruri ixtisaslar üzrə mütəxəssislərin hazırlanmasında fədakarlıq göstərir. Prinsipiallığı, obyektivliyi, səmimiliyi, xeyirxahlığı, təşkilatçılığı ilə elmi-pedaqoji ictimaiyyət arasında böyük hörmət qazanır, elmdə, tədrisdə və idarəetmədə sayılıb-seçilən, nüfuzlu şəxsiyyətə çevrilir. Vəzifə pillələrində irəlilədikcə Mehdi müəllimin məsuliyyəti də artmış, daha geniş spektrli imkanları üzə çıxmış, onun bu sahədəki fəaliyyəti ADU-da yüksəkixtisaslı kadr hazırlığında mühüm rol oynamışdır.

1962-ci ildə Mehdi Əliyevin elm, təhsil və idarəçilik sahəsindəki zəngin təcrübəsi və yüksək peşəkarlığı nəzərə alınaraq Azərbaycan Dövlət Pedaqoji

İnstitutuna rektor təyin olunur. Onun ADPİ-yə rəhbərliyi dövründə (1962-1965-ci illər) axşam şöbəsi yaradılır, yeni fakültələr, şöbələr, kafedralar təşkil olunur. Xarici dillərin intensiv tədrisinə başlanılır, xarici dillər kafedrası yenidən təşkil



*Ulu öndər Heydər Əliyev ADU-da (1969)*

olunur. Pedaqogika və psixologiya kafedrasının bazasında iki müstəqil kafedra (pedaqogika və psixologiya) yaradılır. Bu təşkilati tədbirlər həmin fənlərin tədrisi keyfiyyətini yüksəltməklə bərabər, ixtisas sahələri üzrə dərslik, dərs vəsaiti yaradılmasına və elmi-tədqiqat işlərinin genişlənməsinə, bu sahədə elmi kadr hazırlığına imkan verdi. Müəllim kadrları hazırlığında keyfiyyət önə çəkildi. Qoşa ixtisaslar ləğv olundu, təlim müddəti 5 illikdən 4 illiyə endirildi. İlk dəfə ixtisaslaşdırılmış Müdafiə Şuraları yaradıldı.

İnstitutda yüksəkixtisaslı müəllim kadrlarının hazırlanması, səmərəli elmi-tədqiqat işlərinin aparılması, sağlam təhsil mühitinin yaradılması, respublikanın peşəkar müəllimlərə olan ehtiyacının ödənilməsi Mehdi müəllimin təşkilatçılıq qabiliyyətinin, elmi erudisiyasının, yüksək mədəniyyətinin və şəxsi nüfuzunun sayəsində mümkün oldu. Mehdi müəllimin rektor kimi Pedaqoji İnstitutda qısa fəaliyyəti ona böyük şan - şöhrət və uğur qazandırdı. Onun fəaliyyəti Azərbaycan KP MK-da və Azərbaycan Ali və Orta İxtisas Təhsili Nazirliyində təqdir olundu. O, yenidən Azərbaycan Dövlət Universitetinə, bu dəfə daha yüksək statusda-rektor kimi qayıtdı. O, bu vəzifədə 26 dekabr 1970-ci ilə kimi ləyaqətlə çalışdı. Universitetin məzunları arasında xüsusi istedadı və bacarığı ilə seçilənlərin keçmiş SSRİ-nin müxtəlif şəhərlərinə, dünya miqyaslı elmi mərkəzlərin aspiranturasına göndərilməsi-

nin təşəbbüskarı oldu, sonralar onların Bakı şəhərində işə qəbul olunmasına, mənzil-məişət şəraitinin yaxşılaşdırılmasına xüsusi qayğı göstərdi. Bu gün də universitetin əməkdaşları arasında özünü M.Əliyevin yetirməsi hesab edən, onun qayğılarından bəhrələnən alimlərimiz onu minnətdarlıq hissi ilə xatırlayırlar. Mehdi müəllimin həmin illərdəki fəaliyyətini AMEA-nın müxbir üzvü, professor Misir Mərdanov belə səciyyələndirir:"Mehdi müəllimin universitetə rəhbərlik etdiyi həmin illərdə onun fədakar əməyi, yüksək təşkilatçılıq məharəti və dərin intellekti sayəsində elm və təhsilimizdə böyük uğurlar qazanıldı. Bu illər doğma universitetimizin tarixində bir sıra yaddaqalan hadisələrlə əlamətdar oldu. Belə ki, bu dövrdə yüksəkixtisaslı kadr hazırlığı və elmi-tədqiqat işləri sahəsində əsaslı uğurlar qazanılmış, universitetdə bir sıra elmi istiqamətlər (məsələn, neft kimyası, fiziologiya, yarımkeçiricilər fizikası və s.) üzrə elmi məktəblər formalaşmış, həmin istiqamətlər üzrə kafedralar və laboratoriyalar yaradılmışdır".

Mehdi Əliyev idarəçilik sahəsində böyük nailiyyətlər qazanmaqla kifayətlənməmiş, elmi tədqiqatla da müntəzəm məşğul olmuşdur. Belə ki, o, 1949-cu ildə "Bərk cisimlərin bərkliyinin rəqs üsulu ilə təyini" mövzusunda dissertasiya müdafiə edərək fizika-riyaziyyat elmləri namizədi alimlik dərəcəsi almışdır.

Fizikanın müxtəlif problemləri ilə bağlı məqalələri həm xarici, həm də milli nüfuzlu elmi jurnallarda nəşr olunmuş, beynəlxalq konfranslarda Azərbaycan elmini ləyaqətlə təmsil etmişdir. Onun zəngin elmi-pedaqoji və metodiki irsi vardır. Azərbaycan dilində fizika terminologiyasının yaradılmasında, ümumtəhsil məktəbləri üçün fizika dərsliklərinin doğma dilimizə tərcümə edilməsində, ümumtəhsil və ali məktəblər üçün fizika ilə bağlı dərslik və dərs vəsaitlərinin hazırlanmasında Mehdi müəllimin mühüm xidmətləri olmuşdur. O, Azərbaycan dilində yazılmış ilk "Optika" dərsliyinin (prof.Niftalı Quliyevlə birlikdə) müəllifi olmuşdur. A.F.İoffenin "Molekulyar fizika kursu"nun Azərbaycan dilinə tərcüməsi də onun adı ilə bağlıdır. Onun elmi redaktorluğu və rəyi ilə fizikanın müxtəlif problemləri ilə bağlı xeyli əsər nəşr olunmuşdur.

Mehdi müəllim qeyri-adi pedaqoji qabiliyyətə və istedada malik alim olmuşdur. O, mexanika, molekulyar fizika və optika üzrə mühazirə oxuyarkən, əvvəlcə tələbələrdə dərsin mövzusuna aid təəccüb və maraq oyadar, yəni motivasiya yaradar və sonra isə mövzunu elmi üslubda yüksək peşəkarlıqla şərh və izah edərmiş. İdarəetmə sahəsində çalışan alimlər dərs keçməyə, mühazirə oxumağa o qədər də həvəs göstərmədikləri halda, Mehdi müəllim mühazirə oxumaqdan xüsusi zövq alarmış. Mehdi müəllimin unikal xüsusiyyətlərini öyrənmək, müəllim kimi, alim kimi, rektor kimi, kafedra müdiri kimi, ən başlıcası isə insan kimi qeyri-adi keyfiyyətlərini səciyyələndirmək baxımından

AMEAnın müxbir üzvü, prof.Misir Mərdanovun xatirələrini bölüşmək yerinə düşər: *"Mən tələbə olanda Mehdi müəllim Universitetə rektor təyin edilmişdi. Mehdi müəllim ortaboylu, irisifətli, eynəkli, xoşsifət, ciddi görkəmli bir insan idi. Universitet dəhlizində onu görən tələbə və müəllimlər hörmət və ehtiramla ona yol verər, baş əyib salamlaşardılar. Mehdi müəllim çox böyük nüfuz sahibi idi. Universitetdə hamı- onu sevənlər də, onu istəməyənlər də onun nüfuzu qarşısında, necə deyərlər, muma dönərdilər. Çünki o, sözünün ağası olan şəxsiyyət idi, müdrik qərarlar verər, haqqı-ədaləti heç zaman pozmazdı. Mən Mehdi müəllimi rektor vəzifəsindən ayrılıb kafedrada dosent kimi çalışdığı illərdə də (1970-1972) çox görmüşəm. O dövrdə hamı ona ehtiramla yanaşar, hörmətlə salamlaşar, yol verərdilər. Mehdi müəllim mənəviyyatca saf, büllur kimi təmiz müəllim idi. O, bir ədalət mücəssəməsi idi. Saflıq, təmizlik, sadəlik, prinsipiallıq, xeyirxahlıq, müdriklik Mehdi müəllimi həmkarlarına, tələbələrinə, yetirmələrinə, bütövlükdə insanlara sevdirən üstün keyfiyyətlər idi...Mehdi müəllim yaxşıların yaxşısı, xeyirxahların xeyirxahı idi".*

Mehdi müəllim haqqında tərcümeyi-hal xarakterli bu yazını hazırlayarkən məndə o böyük insana sonsuz ehtiram hissi yarandı. Arxiv sənədlərini, xatirə yazılarını vərəqlədikcə 65 illik ömrünün 40 illindən çoxunu millətinə ləyaqətlə, şərəflə, namusla və qüsursuz xidmət edən, elm və təhsil təşkilatçısı kimi örnək olan, ziyalılığı, müdrikliyi, insanlığı ilə onu tanıyanların qəlbində özünə əbədi heykəl ucaldan Mehdi müəllimi daha yaxından tanımış oldum.

Professor Mehdi Əliyev 1972-ci il may ayının 4-də dünyasını dəyişib və Fəxri Xiyabanda dəfn olunub. Onun haqqında həmkarları və tələbələri tərəfindən xeyli məqalələr yazılıb, xatirələr qələmə alınıb. Həmkarları onu "nəhəng təşkilatçı, böyük şəxsiyyət, yaradıcı rektor, prinsipial, tələbkar, humanist və qayğıkeş insan, bənzərsiz müəllim" (akademik Ağamusa Axundov), "yüksək təşkilatçılıq məharətinə malik" (akademik Abel Məhərrəmov), "bütöv bir nəslin, ziyalı pleyadasının hamisi" (AMEA-nın müxbir üzvü Məsumə Məlikova), "Azərbaycanı özündən artıq sevən Vətən oğlu" (prof.Müseyib Müseyibov), "böyük müəllim, qayğıkeş insan və müdrik rəhbər" (prof.Faiq Əhmədov), "təhsil fədaisi" (prof.Niftalı Qocayev) kimi səciyyələndiriblər.

Mehdi müəllim həm də xoşbəxt ailə başçısı olmuş, övladlarının mükəmməl təhsil almasına qayğı göstərmişdir. Böyük oğlu fizika-riyaziyyat üzrə fəlsəfə doktoru Emin (1945-2012) atasının ixtisasının davamçısı olub, elmi uğurlarına görə Dövlət Mükafatına layiq görülüb. Digər oğlu Tofiq tanınmış memar, qızı Aliyə xanım isə musiqişünasdır.

Mehdi Əliyevin məsul vəzifələrdə səylə çalışdığı uzun illər ərzində onun fədakar əməyi, yüksək təşkilatçılıq məharəti sayəsində elm və təhsilimizdə mühüm nailiyyətlər əldə edilib. Bu səbəbdən də onun elmi-pedaqoji fəaliy-



*Türkiyənin Prezidenti Cövdət Sunay ADU-da (1967)*

yəti və təhsil təşkilatçılığı sahəsindəki xidmətləri hökumət və dövlət tərəfindən yüksək qiymətləndirilmişdir. O, ”Azərbaycan Respublikasının Əməkdar elm xadimi”, “Azərbaycan Respublikasının Əməkdar müəllimi” fəxri adlarına layiq görülmüş, “Qırmızı Əmək Bayrağı” və digər orden və medallarla təltif olunmuşdur.

Azərbaycanda ziyalıların yubileylərinin keçirilməsi artıq bir ənənə halını alıb. Amma institut və universitet rektorlarının yubileylərinin keçirilməsi isə nadir hallarda olur. 14 noyabr 2007-ci ildə BDU-da universitetin sabiq rektoru, əməkdar elm xadimi M.S.Əliyevin 100 illiyi ilə bağlı möhtəşəm tədbir keçirildi. Elm, təhsil işçilərinin, universitetin professor-müəllim və tələbə kollektivinin iştirakı ilə keçirilən tədbir M.Əliyevə hörmət və ehtiramın ifadəsi kimi yaddaşlara köçdü. BDU- nun rektoru, akademik A.Məhərrəmov Mehdi müəllimi adını əməlləri, fəaliyyətləri ilə xalqımızın tarixinə yazmış insanlarından biri kim dəyərləndirdi, onun xalq qarşısındakı xidmətlərindən danışdı. Alimin həyatı, elmi-pedaqoji fəaliyyəti ilə bağlı məruzə edən fizika fakültəsinin dekanı, professor Rasim Məmmədov dərin biliyi, peşəkar müəllimlik metodikası, səmərəli təşkilatçılıq qabiliyyəti, yüksək mənəvi-əxlaqi keyfiyyətləri, vətənpərvərliyi ilə seçilən M.Əliyevin ömrünün yaddaqalan məqamlarını dilə gətirdi.Ümumiyyətlə, bu böyük insan haqqında deyilənləri saf-çürük etdikdən sonra bir daha yəqin etdim ki, insan ölən anda yox, unudulanda ölür. Mehdi müəllim kimi insanların ömürləri onları xatırlayanların ömrü qədər uzun və barlı-bərəkətlidir.

**Ədəbiyyat**


1. Mərdanov M. Mehdi Əliyev: tanınmış təhsil təşkilatçısı, böyük müəllim//”Azərbaycan məktəbi” jurnalı, 2012, № 5, s.10-16
2. BDU-da universitetimizin sabiq rektoru, Əməkdar elm xadimi M.S.Əliyevin 100 illiyi keçirildi. http://webcache. googleusercontent.com
3. Mehdi Sadıq oğlu Əliyev‎.https://az.wikipedia.org/wiki/Mehdi Əliyev
4. Алиев Мехти Садых оглы – физик, ученый, педагог, ректор АГУ им. С.М. Кирова. https://www.ourbaku.com/index.php


*Mehdi Sadıq oğlu Əliyev*



**ŞÖVQİ SÜLEYMAN OĞLU AĞAYEV**
*psixologiya elmləri doktoru, professor*
*(1926-1975)*

Şövqi Süleyman oğlu Ağayev 23 mart 1926 -cı ildə Şamaxı qəzasının İsmayıllı nahiyəsinin Diyallı kəndində müəllim ailəsində anadan olmuşdur. Atası Süleyman Məcid oğlu ailəsindən qalan varidata sahib olduğuna görə imkanlı olması ilə seçilmişdir. Ona görə də sovetləşmənin ilk illərində həbs edilərək güllələnmişdir. Onda Şövqinin 2 yaşı vardı. İsmayıllı rayonunda yaşayan Şövqi altı yaşında ailəsi ilə birlikdə Bakıya, böyük qardaşı Abdulməcidin yanına köçmüşdür. Həmin vaxt qardaşı Neftayırma Zavodunda sex rəisi vəzifəsində çalışırdı. Anası Səfiyyə xanım evdar qadın idi.O, Bakıya gələndən sonra işləmək məcburiyyətində qaldığından Əli Bayramov adına Qadınlar klubunda işləyirdi. O, 1933-1937-ci illərdə klubda dərzi kimi çalışan Səfiyyə xanım 1942-ci ildə Bakı şəhərində vəfat edir.

Şövqi Ağayev orta təhsilini 1933-1942-ci illərdə Bakı şəhərindəki 173 saylı məktəbdə almışdır. Məktəbdə əlaçı şagird olmuş, müxtəlif mükafatlarla və tərifnamələrlə təltif edilmiş, bacarıqlı pioner kimi şəkli qəzetlərdə çap edilmişdir. 1941-1942-ci illərdə fizika-riyaziyyat müəllimi hazırlayan birillik kursda oxumuş, oranı bitirdikdən sonra Azərbaycan Dövlət Qiyabi Pedaqoji İnstitutunun III kursuna qəbul olunmuşdur. Lakin orada oxumağa davam etməmiş, Azərbaycan Dövlət Tibb İnstitutunun müalicə-profilaktika fakültəsinə daxil olmuşdur. 1942-1947-ci illərdə Tibb İnstitutunu əlaçı təqaüdi ilə oxumuş, oranı fərqlənmə diplomu ilə bitirmişdir. İnstitutu bitirdikdən sonra Azərbaycan SSR Elmlər Akademiyasının Təbabət İnstitutunun aspiranturasına qəbul imtahanlarını uğurla versə də institut ləğv edildiyindən təhsilini davam etdirə bilməmişdir. Şövqi Ağayev 1948 -ci ildə Azərbaycan Dövlət Pedaqoji İnstitutunun psixologiya ixtisası üzrə aspiranturasına qəbul olunmuşdur.

***Şövqi Süleyman oğlu Ağayev***

ADPU-nun arxivində Şövqi Ağayevin aspiranturaya daxil olarkən yazdığı referat işi saxlanılır. Referat işi 24 səhifəlik şagird dəftərində yüksək zövq və hüsnxət qaydası ilə yaşıl rəngli qələmlə yazılmışdır. Şövqi müəllim yaşıl mürəkkəblə yazmağı sevərmiş. Belə ki, onun sənədlərinin içərisində bir neçə dəfə yazdığı şəxsi qeydiyyat vərəqi, tərcümeyi-halı, qəbul imtahanı zamanı ingilis dilindən tərcümə etdiyi mətn vardır. Onların hamısı yaşıl mürəkkəblə yazılmışdır. "Psixologiyanın mövzusu və metodlarının idealist və mexaniki-materialist dərkinin tənqidi" adlı referat işinə 16 sentyabr 1948-ci ildə ADPU-nun psixologiya kafedrasının müdiri Ə.K.Zəkuzadə müsbət rəy vermişdir. ADPU-nun direktor müavini, dos. M.M.Mehdizadə, kafedra müdiri, psixologiya elmləri doktoru Ə.K.Zəkuzadə və dos.F.İbrahimbəylinin daxil olduğu komissiya qarşısında o, psixologiyadan imtahan verərək "əla" qiymət alır. Aspirantura illəri onun üçün uğurlu olur. 18 may 1950-ci ildə rektor Cəfər Hacıyevin sədrliyi ilə keçən İnstitutun Elmi Şurasında onun Stalin mükafatına təqdim edilməsi qərara alınır. Onun haqqında verilən xasiyyətnamədə deyilir ki, o, namizədlik imtahanlarını uğurla verib, dissertasiya üzərində səmərəli işləyir, rus dili və ədəbiyyat fakültəsində psixologiyadan mühazirələr oxuyur, məntiq və psixologiya faküktəsinin II kurs tələbələrinə eksperimental psixologiyadan praktik məşğələlər aparır, institutun ictimai həyatında fəal iştirak edir, partiya təşkilatının tapşırıqlarını vaxtında və dəqiq yerinə yetirir. Öz üzərində ciddi çalışır. Psixologiyadan namizədlik imtahanında uğur qazanmaq üçün elmi rəhbəri prof.Ə.K.Zəkuzadənin müəyyənləşdirdiyi pedaqoji-psixoloji və fizioloji əsərləri oxuyur və onlardan məqbul verir. Onun oxumalı olduğu kitabların siyahısı çox zəngindir. Siyahıya fiziologiya ilə bağlı İ.P.Pavlov və A.A.Orbelinin, eksperimental psixologiya üzrə P.S.Labimovun, psixologiya tarixi üzrə İ.M.Seçenov, M.O.Dessuar, B.K.Ananyev, ümumi psixologiya üzrə C.L.Rubinşteyn, E.Meyman, K.Koffka, E.L.Torndayk, C.Uotson, J.Piaje, N.N.Lonqe, E.V.Titçener, A.Lazurski, İ.İ.Meşannikov, Kornilov, P.P.Blonski, A.N.Leontev və A.A. Smirnovun əsərləri daxil idi. Ş.Ağayev araşdırdığı mövzu ilə bağlı Bakı şəhərindəki 49 və 173 saylı məktəblərdə eksperiment aparır.

Həmin illərdə o, Bakı Maliyyə Kredit Texnikumunda (1947-1951) fizikadan, ADPİ-də (1949-1951) isə psixologiyadan dərs deyir. 1949-cu ildə Moskvaya Psixologiya İnstitutuna göndərilir, o, burada eksperimental psixologiyadan 80 saatlıq kurs keçmişdir. Aspiranturanı uğurla başa vuran Şövqi Ağayev prof.Ə.K.Zəkuzadənin təqdimatı əsasında ADPİ-nin psixologiya kafedrasında assistent kimi pedaqoji fəaliyyətə başlayır. 1954-cü ildə *"Fikri məqsədin xarakterindən asılı olaraq təlim prosesində görmə qavrayışının dinamikası"* mövzusunda namizədlik dissertasiyası müdafiə edərək pedaqoji

elmlər namizədi alimlik dərəcəsi alır. Elmi-nəzəri dəyərliliyi ilə diqqəti cəlb edən bu tədqiqat işi mütəxəssislər tərəfindən yüksək qiymətləndirilir. Akademik A.O.Makovelski rəsmi rəyində yazırdı ki, təlim üçün çox əhəmiyyətli nəticələr-qavrayışın fikri məqsədin xarakterindən asılılığını eksperimental şəkildə əsaslandıran hökmlər bilavasitə təlimi yaxşılaşdırmağa yönəlmişdir. 8 yanvar 1955-ci ildə ona Ali Attestasiya Komissiyası tərəfindən dosent elmi adı verilir. Psixologiya kafedrasında dosent kimi fəaliyyət göstərir. Bir-birinin ardınca orijinallığı ilə seçilən məqalələri nəşr olunur.

60-cı illər onun həyatına daha uğurlu illər kimi yazılır. O, ADPU üzrə 28 sentyabr 1960-cı il tarixli 249 saylı əmrlə yeni yaradılan İbtidai təhsilin pedaqogikası və metodikası fakültəsinin qiyabi şöbəsinə dekan vəzifəsinə təyin olunur. O, bu vəzifədə iki il işləyir. Elmi uğurları və pedaqoji fəaliyyəti ilə seçilən Ş.Ağayev 14 noyabr 1962-ci ildə ADPİ-nin tədris işləri üzrə prorektoru vəzifəsinə irəli çəkilir. 6 fevral 1964-cü ildə o, həm də psixologiya kafedrasına müdir vəzifəsinə təyin olunur. 3 fevral 1965-ci ildə Azərbaycan Dövlət Pedaqoji İnstitutunun rəhbərliyində kadr dəyişikliyi baş verir. ADPİ-nin rektoru işləyən Mehdi Əliyev S.M.Kirov adına ADU-nun rektoru vəzifəsinə təyin olunur. ADPİ-nin rektoru vəzifəsini icra etmək tədris işləri üzrə prorektor dos.Ş.Ağayevə həvalə olunur. Səkkiz gün sonra isə o, Ali və Orta İxtisas Təhsili Komitəsinin əmri ilə Azərbaycan Dövlət Pedaqoji İnstitutuna rektor təyin olunur. Rektor və kafedra müdiri kimi məsuliyyətli vəzifələrdə işləməsinə baxmayaraq elmi işdən ayrılmır, ümumi, yaş və pedaqoji psixologiya ilə bağlı dərslik və dərs vəsaitləri, silsilə məqalələri nəşr olunur. 1967 -ci ildə isə *"Əmək, tərbiyə və inkişaf"* mövzusunda doktorluq dissertasiyası müdafiə etməklə ilk azərbaycanlı psixologiya elmlər doktoru kimi adını elm tarixinə yazdırır. 24 oktyabr 1969-cu ildə SSRİ Ali və Orta İxtisas Təhsili Nazirliyinin yanında fəaliyyət göstərən Ali Attestasiya Komissiyası onun psixologiya elmləri doktoru elmi dərəcəsini təsdiq edir. ADPİ-nin rektoru, psixologiya elmləri doktoru Şövqi Ağayev 14 iyul 1970-ci ildə "tərcümeyi -halının şərhində qeyri səmimilik təzahürünə" görə vəzifəsindən azad edilir. İşdən çıxarılan gün o, 6 səhifəlik "tərcümeyi-halıma aid əlavə qeydlər" yazmalı olur (Yaxşı ki, 30-cu illər deyilmiş, ya güllələnər, ya da Sibirə sürgün edilərdi). Əsəbi və tələsik şəkildə yazılan bu qeydlərdən məlum olur ki, o, 1958-ci ildə Sov.İKP sıralarına daxil olarkən atasının həbs olunub, sonra bəraət aldığını, babasının ruhani olmasını yazmayıb. Babası Hacı Əbdül Məcid Əfəndi Şamaxıda qazı olmuş, 1908-ci ildə vəfat etmişdir. Maarifpərvər, bilikli, millətlər dostluğuna çalışan bir sima olmuşdur. M.Ə.Sabir onun fəaliyyətini və şəxsiyyətini yüksək dəyərləndirmiş, onun vəfatına xüsusi təziyə məktubu yazmışdır ki, həmin şeirlər "Hophopnamənin" III cildinin 36-37-ci

səhifələrində və “İrşad” qəzetinin 23 fevral 1908-ci il sayında çap olunmuşdur. Ana babası Hacı Camı Əfəndi də yüksək rütbəli ruhani olmuş, Göyçayda, İsmayıllıda çalışmışdır. Hacı Məcid Əfəndi -İstanbulda ali dini təhsil alaraq Əfəndi titulu, Albaniyanın Tirana şəhərində İlahiyyat Universitetini bitirib şəriət alimi titulu alıb.

Oğlu Mustafa əfəndi (1860-1930) məscidlər tikdirmiş, Şamaxı quberniya qazisi və s. dini vəzifələrdə işləmişdir. Atası Ağazadə Süleyman Əfəndi Məcid oğlu (sənədlərdə Ağayev Süleyman Məcid oğlu kimi yazmışdır) İsmayıllıda, Göycayda və Şamaxıda müəllim işləmişdir.

Rektor vəzifəsindən azad olunan Şövqi müəllim Psixologiya kafedrasının müdiri kimi pedaqoji fəaliyyətini davam etdirir və həmin kafedraya professor vəzifəsinə seçilir. 12 noyabr 1970-ci ildə Ali Attestasiya Komissiyası onun professor elmi adını təsdiq edir.

Azərbaycan SSR Ali və Orta İxtisas Təhsili Nazirliyi Kollegiyasının 13 noyabr 1974-cü il tarixli qərarına müvafiq olaraq Şövqi Ağayevin rəhbərlik etdiyi psixologiya kafedrasının bazası əsasında iki kafedra - Ümumi psixologiya və Yaş və pedaqoji psixologiya kafedraları yaradıldı.

Ümumi psixologiya kafedrasının üzvlərinin tərkibi aşağıdakı kimi müəyyən edilmişdi:

1.Ağayev Şövqi Süleyman oğlu - psixologiya elmləri doktoru, professor (kafedra müdiri)

2.Məmmədov Arif Umud oğlu - psixologiya elmləri namizədi, dosent

3.Əbdülov Məmmədəli Şamil oğlu - psixologiya elmləri namizədi, dosent əvəzi

4.Baxşəliyev Ərəstun Təriş oğlu - psixologiya elmləri namizədi, baş müəllim

5.Həsənov Hacıbaba Əbdüləli oğlu - baş müəllim

6.Rzayev Baxış İmran oğlu - baş müəllim

7.Tağıyeva Solmaz Məmmədəli qızı - baş müəllim

8.Əlizadə Əkrəm Əsəd oğlu - baş müəllim

9.Abdullayeva Kifayət Nəriman qızı - müəllim

10.Məmmədova Elmira Ələsgər qızı - müəllim

11.Məmmədova Gülnarə Ağamməd qızı - müəllim

Yaş və pedaqoji psixologiya kafedrasının tərkibinə adları aşağıda göstərilən əməkdaşlar daxil edilmişdi:

1.Mehdizadə Zəkəriyyə Məmməd oğlu - psixologiya elmləri namizədi, dosent (kafedra müdiri)

2.Əlizadə Əbdül Əli oğlu - psixologiya elmləri namizədi, dosent

3.Quliyev Edison Məmməd oğlu - psixologiya elmləri namizədi, dosent

4.Əzimov Qulam Eynulla oğlu - psixologiya elmləri namizədi, dosent əvəzi
5.Fərəcov İbad Allahqulu oğlu - psixologiya elmləri namizədi, dosent
6.Abdullayev Əmrulla Abdulla oğlu -baş müəllim
7.Cavadov Nuru Ağahüseyn oğlu - baş müəllim
8.Süleymanova Lətifə Abbas qızı - müəllim

23 dekabr 1974-cü ildə yenidən kafedra müdiri vəzifəsinə seçilən Ş.Ağayev 13 oktyabr 1975-ci ildə rektor prof.Həşim Ağayevə ərizəsində yazır ki, "mənim müalicə məqsədilə müayinəyə ehtiyacımı nəzərə alaraq 16 oktyabr 1975-ci il tarixdən istirahət əvəzi məzuniyyət verilməsinə dair sərəncamınızı xahiş edirəm. Həkimlərin dediyinə görə, bu müayinə uzana bilər". Ərizəsinə rektor 13 oktyabrda, tədris şöbəsi 15 oktyabrda, dispetçer və dekan isə 23 oktyabrda imza atır. Məzuniyyətdə olduğu vaxtda qiyabi pedaqoji fakültədə dövlət imtahanında iştirak etdiyinə görə ona 10 təqvim günü məzuniyyət verilməsi ilə bağlı əmrin layihəsi hazırlanır. Lakin əmr icra olunmur. Belə ki, prof. Şövqi Ağayev 23 oktyabr 1975-ci ildə vəfat edir.

Prof. Şövqi Ağayevin pedaqoji və elmi-pedaqoji kadr hazırlığında mühüm xidmətləri olmuşdur. Onun elmi rəhbərliyi ilə M.Əbdülov, Ə.Baxşəliyev, İ.Məmmədov və Z.Orucov namizədlik dissertasiyası müdafiə etmişdir. Qulam Əzimovun və Nuru Cavadovun dissertasiya işlərinin müzakirəsinin və müdafiəsinin xeyirxahlarından biri olmuşdur. Onun Psixologiya kafedrasına rəhbərlik etdiyi illərdə kafedra Azərbaycanda psixologiya elminin inkişaf mərkəzinə çevrilmişdi. Həmin illərdə beş nəfər (Şövqi Ağayev, Əkbər Bayramov, Muxtar Həmzəyev, Ələddin Qədirov, Əbdül Əlizadə) doktorluq dissertasiyası hazırlamış və müxtəlif illərdə müdafiə etmişlər. O, pedaqogika və psixologiya ilə bağlı onlarla dissertasiyanın rəsmi opponenti və ya rəyçisi olmuşdur. Moskvalı B.F.Voqoni (1969), Düşənbədən gələn R.E.Ustoyev (1972) onun elmi köməyi ilə namizədlik dissertasiyası müdafiə etmişdir.

Prof.Şövqi Ağayevin yaradıcılığı çoxşaxəlidir. Təlim psixologiyası, kiçik məktəbyaşlı şagirdlərin əməyə psixoloji hazırlığı, uşaqlarda mədəni vərdiş və adətlərin tərbiyəsi, ailədə uşaqların nitqinin inkişafı problemləri onun yaradıcılığının əsasını təşkil edir. Prof.Ş.Ağayevin "Uşaqlarda mədəni vərdiş və adətlərin tərbiyəsi" (1961), "Ruh varmı?" (1962), "Ailədə uşağın nitqinin inkişaf etdirilməsi" (1962),"Uşaq psixologiyası məsələlərinə dair" (qiyabiçilər üçün tədris vəsaiti) (1966), "Əmək, tərbiyə və inkişaf" (1967), "Yaş və pedaqoji psixologiya" (Z.Mehdizadə və İ.Fərəcovla birlikdə) (1977) kitabları və onlarla elmi məqalələri məhz həmin elmi problemlərin öyrənilməsi baxımından mühüm əhəmiyyət daşıyır. Onun elmi fəaliyyətində mollanəsrəddinçilərin psixoloji görüşlərinin tədqiqi mühüm yer tutur. O, ilk dəfə Ə.Haqverdiyevin və mollanəsrəddinçilərin psixoloji görüşlərini tədqiq

etmiş, “C.Məmmədquluzadənin psixoloji mülahizələri” (1967), “Böyük yazıçının psixoloji irsi haqqında” (1967) məqalələrini yazmışdır. Ümumiyyətlə, onun psixoloji-pedaqoji irsi 150 çap vərəqindən artıqdır.

Ali məktəb tələbələri üçün psixologiyadan dərs vəsaitlərinin hazırlanmasında prof.Şövqi Ağayevin mühüm xidmətləri var. 1960-1961-ci illərdə nəşr edilən 2 hissəlik "Psixologiya” dərsliyinin ayrı-ayrı bölmələri Ə.Zəkuzadə, Z.Mehdizadə, Ş.Ağayev, A.Abdullayev və M.Mustafayev tərəfindən yazılmışdır. Respublikamızda yaş və pedaqoji psixologiya fənninin ali pedaqoji məktəblərin tədris planına daxil edilməsində, proqramının və “Yaş və pedaqoji psixologiya məsələləri” (1974) adlı ilk dərs vəsaitinin hazırlanmasında prof.Şövqi Ağayev yaxından iştirak etmişdir. Onun vəfatından iki il sonra həmin kitab “Yaş və pedaqoji psixologiya” (1977) adı ilə yenidən nəşr olunmuşdur. Həmin dərsliklər uzun müddət tələbələrin stolüstü kitabı olmuşdur. Kiçikyaşlı məktəblilərin yaş və psixoloji xüsusiyyətlərini dərindən bilən Ş.Ağayev 60-cı illərdə Ə.M.Qarabağlı, N.A.Abdullayevlə birlikdə ibtidai siniflərin ikinci sinfi üçün nəzərdə tutulan və hər il nəşr olunan “Ana dili” dərsliyinin müəlliflərindən biri olmuşdur. O, həm də dərslik müəllifləri ilə birlikdə “İkinci sinfin ana dili dərsliyinə metodik göstərişlər” (1963) yazmışdır. Azərbaycan-rus, Azərbaycan-gürcü elmi-psixoloji əlaqələrinin yaradılmasında da onun xidmətləri olmuşdur. Bakıda, Tbilisidə, İrəvanda keçirilən Zaqafqaziya psixoloqlarının I-VI konfranslarının iştirakçısı olmuş, mühüm psixoloji problemlərlə bağlı maraqlı məruzələrlə yadda qalmışdır. 1957-ci ildə Tbilisidə Zaqafqaziya fizioloqlarının konfransında iştirak etmiş, ”V sinif şagirdlərində həndəsi təsəvvürlərin inkişafı” mövzusunda məruzə ilə çıxış etmişdir.

Prof. Şövqi Ağayev humanist müəllim kimi tələbələrin sevimlisi olmuşdur. Bu xüsusda onun yetirməsi prof.Ə.Baxşəliyev yazır*:”...gözəl insan, əsl müəllim kimi tələbələrin rəğbətini qazanmışdı. Onun mühazirələrindən doymaq olmurdu. Nitqi rəvan, fikri aydın idi. Mühazirəsini həmişə açıq şəkildə keçirdi. Onun mühazirəsində kafedra əməkdaşları, aspirantlar, dissertantlar həvəslə iştirak edirdilər”.*

Ş.Ağayev güclü müşahidə qabiliyyətinə, qüvvətli yaradıcılıq istedadına malik idi. Şövqi müəllim həm də məharətli müəllim və gözəl natiq idi, nikbin, sadə, səmimi, təvazökar, alicənab, mərhəmətli bir insan idi.

Bu baxımdan ADPU-nun Azərbaycan dili və onun tədrisi metodikası kafedrasının professoru Nadir Abdullayevin Şövqi müəllimlə bağlı xatirələri maraq doğurur. Prof.N. Abdullayev xatırlayır ki, Şövqi müəllim rektor olanda mən də institut Həmkarlar İttifaqı Komitəsinin üzvü idim. Hər il 8 Mart Beynəlxalq Qadınlar günü münasibəti ilə institutda çalışan qadınlara ADPİ

Həmkarlar İttifaqı Komitəsi tərəfindən hədiyyələr verilirdi. Həmkarlar İttifaqı Komitəsinin sədri Həmzə Qasımzadənin təklifi ilə qadınlara hədiyyə vermək üçün xeyli parça alınmışdı. Siyahıya uyğun olaraq institutda çalışan dekan, kafedra müdiri, dosent, professor qadınların hər birinə bir pay parça nəzərdə tutulmuşdu. Həmzə Qasımzadə bu məsələ ilə bağlı Şövqi müəllimlə görüşmək üçün rektorluğa gedəndə mən Həmkarlar İttifaqı Komitəsinin otağında idim. Bir azdan rektorun köməkçisi zəng edərək 8 Mart Beynəlxalq Qadınlar günü münasibəti ilə hədiyyə veriləcək qadınların siyahısını istədi. Siyahını rektorluğa mən apardım və Şövqi müəllimə verdim. Şövqi müəllim siyahıya xeyli baxandan sonra, xəfifcə gülümsəyərək dedi*:"Belə olmaz. Adını bu siyahıya yazdığınız dekanın da, kafedra müdirinin də vəziyyəti pis deyil. Siz bu parçanı verin ehtiyacı olan xadimələrə, bir də qızlar yataqxanasında baxıcı işləyən Xanım arvada, balaca-balaca qızları var".* Bu, uzun illər institutda formalaşmış stereotiplərin dağıdılması idi. Bu, Şövqi müəllimin insanlara münasibətinin, mənəvi aləminin, şəxsiyyətinin böyüklüyünün ifadəsi idi.

Prof.Şövqi Ağayev respublikanın ictimai-siyasi həyatında fəal iştirak etmiş, Bakı Şəhər Sovetinin X və XI çağırış deputatı, Azərbaycan Kommunist Partiyasının XXVII qurultayının, Azərbaycan müəllimlərinin V qurultayının, "Bilik" cəmiyyətinin V qurultayının nümayəndəsi və Azərbaycan Psixoloqlar Cəmiyyətinin Rəyasət heyətinin üzvü olmuşdur.

Prof.Şövqi Ağayev bacarıqlı elm və təhsil təşkilatçısı olmaqla yanaşı, həm də gözəl və səmimi ailə başçısı olmuşdur. Firuzə Yusif qızı ilə evli olan Şövqi müəllimin ailəsində üç övlad (Süleyman, Rauf və Səadət) böyümüşdür.

1996-cı ildə Azərbaycan Dövlət Pedaqoji Universitetində prof. Şövqi Ağayevin anadan olmasının 70 illiyi təntənə ilə qeyd edilmişdir.

**Ədəbiyyat**


1.ADPU-nun Arxivi. Professor Şövqi Ağayevin şəxsi işi

3. Baxşəliyev Ə. Psixologiya tarixi oçerkləri.Bakı,Elm,2012, s.350-358

4. Əliyev R.Psixologiya tarixi.Bakı, Elm və təhsil, 2006, s.

5. Məmmədov A. Xatirələrdə yaşayan ömür. "Gənc müəllim" qəzeti, 30 iyun 1991


***Şövqi Süleyman oğlu Ağayev***



**HƏŞİM NİZAM OĞLU AĞAYEV**
*fizika-riyaziyyat elmləri doktoru,*
*professor*
*(1916-1988)*

Həşim Nizam oğlu Ağayev 1916-cı il sentyabr ayının 12-də Lənkəran şəhərində fəhlə ailəsində anadan olub. Atası Mirnizam Mirağa oğlu 1898-ci ildə Lənkəran şəhərində anadan olub. O, Oktyabr inqilabından əvvəl mülkədarın yanında fəhlə kimi çalışıb, sonra kiçik ticarətlə məşğul olub. Buna görə də 1930-cu ildə həbs olunub.

Həşim Ağayev orta təhsilini Lənkəran şəhərindəki 3 saylı orta məktəbdə alıb. 1936-1941-ci illərdə S.M. Kirov adına Azərbaycan Dövlət Universitetinin (indiki BDU) Fizika-riyaziyyat fakültəsində oxuyub. Universiteti bitirdikdən sonra Maştağa rayonundakı 129 saylı tam orta məktəbə direktor vəzifəsinə təyin olunub. İkiillik pedaqoji fəaliyyətdən sonra elmi araşdırmalarla məşğul olmaq məqsədilə 1943-cü ilin mart ayından SSRİ EA-nın Azərbaycan filialının Fizika bölməsinin riyaziyyat şöbəsində kiçik elmi işçi kimi işə başlayır.1944-1947-ci illərdə həmin şöbənin aspiranturasında oxuyur. 1947-ci ildə aspiranturanı bitirdikdən sonra uğurla namizədlik dissertasiyası müdafiə edərək fizika-riyaziyyat elmləri namizədi elmi dərəcəsi alır.

Həşim Ağayev 1948-1953-cü illərdə Azərbaycan SSR-nin EA-nın Fizika və Riyaziyyat İnstitutunun riyaziyyat şöbəsində baş elmi işçi vəzifəsində çalışmış, 1948-1950-ci illərdə isə Azərbaycan Qiyabi Pedaqoji İnstitutunun Cəbr kafedrasına rəhbərlik etmişdir. 1953-1954-cü illərdə Bolqarıstana ezam olunmuş və orada Sofiya Universitetinin Riyazi analiz kafedrasına rəhbərlik etmişdir. Həmin dövrdə onun tərəfindən Universitetin Türk şöbəsi üçün riyazi terminlər lüğəti tərtib edilmişdir.

***Həşim Nizam oğlu Ağayev***

Ezamiyyətdən qayıdandan sonra Həşim Ağayev 1954-cü ildə Azərbaycan SSR-nin EA-nın Rəyasət heyəti tərəfindən Riyaziyyat şöbəsinin rəhbəri təyin olunub. 1957-1959-cu illərdə o, Fizika və Riyaziyyat İnstitutunun elmi hissə üzrə direktor müavini vəzifəsində çalışıb.

Azərbaycan SSR Nazirlər Sovetinin 1959-cu il 27 aprel tarixli 319 №-li qərarı ilə Azərbaycan SSR EA Fizika və Riyaziyyat İnstitutunun riyaziyyat şöbəsinin əsasında müstəqil Riyaziyyat və Mexanika İnstitutu yaradıldıqdan sonra Həşim Ağayev 1959-1963-cü illərdə həmin İnstitutun elmi hissə üzrə direktor müavini vəzifəsində çalışıb. 1964-cü ilin sentyabr ayından 1967-ci ilin fevral ayınadək Riyaziyyat və Mexanika İnstitutunun direktoru vəzifəsini icra etməklə yanaşı, həm də institutun Diferensial tənliklər şöbəsinə rəhbərlik edib.

Həşim Ağayev 14 iyul 1970-ci ildən 5 avqust 1981-ci ilədək V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutunun (indiki ADPU) rektoru olub. Onun dövründə ADPİ-nin strukturunda müəyyən dəyişiklik edildi.

Pedaqoji İnstitutun 1967-ci ildə yaradılan Naxçıvan filialında qısa bir müddətdə 5 kafedra təşkil edildi. Az sonra -1972-ci ildə filialın bazasında Naxçıvan Dövlət Pedaqoji İnstitutu, institutun Xankəndində olan digər bir filialının əsasında isə Xankəndi Pedaqoji İnstitutu (1973) yaradıldı.1500 yerlik tələbə yataqxanası istifadəyə verildi. Kimya, fizika, biologiya və digər tədris laboratoriyaları yeni avadanlıqlarla təchiz olundu. Pedaqoji təcrübənin təşkilinə və tələbələrin müstəqil işlərinə diqqət artırıldı.

ADPİ-nin SSRİ-nin müəllim kadrları hazırlayan institutları, SSRİ EA-nın və SSRİ PEA-nın müvafiq institutları ilə elmi-pedaqoji əlaqələri gücləndirildi. 1976-1980-ci illərdə 678 müəllim SSRİ-nin tanınmış elm və təhsil müəssisələrində ixtisasartırma kurslarına cəlb olundu. Görkəmli rus alimləri B.A.Sadoviç, A.İ.Busev, A.İ.Sokolov, M.İ.Vişkin, B.A.Qorin,Y.A.Saukin, V.F.Nozdrev mühazirə oxumaq üçün instituta dəvət olundu.

Həmin dövrdə Azərbaycan Pedaqoji İnstitutda 53 kafedra fəaliyyət göstərirdi. 10 fakültədə 20 ixtisas üzrə müəllim hazırlığı həyata keçirilirdi. 1970-1971-ci tədris ilində institutda hazırlıq şöbəsi yaradıldı. On il müddətində hazırlıq şöbəsinin 1639 dinləyicisindən 1542 nəfəri müvəffəqiyyətlə imtahan verərək institutun I kursuna qəbul olundu. Bu illər ərzində ümumtəhsil məktəbləri üçün 25870 nəfər yüksəkixtisaslı müəllim kadrı hazırlanmışdı. Pedaqoji kadr hazırlığında 660 nəfər çalışırdı ki, onların da 42 nəfəri elmlər doktoru, professor, 340 nəfəri elmlər namizədi, dosent idi. Namizədlik və doktorluq dissertasiyaları müdafiə edənlərin sayı artdı.

1974-cü ildə institutda orta məktəb müəllimlərinin ixtisasartırma fakültəsi təşkil edildi. 5 il müddətində 1641 nəfər bu kursu uğurla başa vurdu. 1975-ci ildə respublikada peşəyönümü işinin təşkilində mühüm rol oynamış

“Şagirdlərin peşəyönümü” elmi-tədqiqat laboratoriyası yaradıldı. Bütün bunlar Həşim müəllimin institutda həyata keçirdiyi işlərin nəticəsində mümkün olmuşdu. Həmin illərdə Azərbyacan KP MK-nın I katibi Heydər Əliyev iki dəfə instituta gəlmiş, kollektivin qarşısında dərin məzmunlu nitq söyləmiş, professor-müəllim heyətinin qarşısında duran vəzifələrdən danışmışdır. 1973-cü ilin mart ayının 2-də indiki Dövlət Təhlükəsizliyi Xidmətinin Mədəniyyət Mərkəzində institutun 50 illik yubileyində iştirak edən Ulu öndər bu təhsil müəssisəsinin yarıməsrlik şərəfli inkişaf yolundan danışarkən professor-müəllim heyətinin və rəhbərliyin fəaliyyətini yüksək qiymətləndirmişdir. Sonra Pedaqoji İnstitutun yüksək dövlət mükafatı - Qırmızı Əmək Bayrağı ordeni ilə təltif edilməsi haqqında SSRİ Ali Soveti Rəyasət Heyətinin Fərmanını elan edərək, ordeni institutun bayrağına sancmışdır.



*ADPİ-də Respublikalararası elmi konfrans. 6 may 1977-ci il*

Həmin dövr H.Ağayevin şəxsi həyatında da uğurlu illər kimi yadda qalır. SSRİ Nazirlər Şurası yanında Ali Attestasiya Komissiyasının qərarı ilə 1972-ci il may ayının 19-da ona professor elmi adı verilir. 14 yanvar 1977-ci ildə o, doktorluq dissertasiyasını müvəffəqiyyətlə müdafiə edərək fizika-riyaziyyat elmləri doktoru elmi dərəcəsini alır. Həşim Ağayevin qeyri-xətti operator tənliklərinin tədqiqinə həsr olunmuş silsilə işləri onun doktorluq dissertasiyasının əsasını təşkil edir. Funksional analiz, xüsusi törəməli diferensial tənliklər nəzəriyyəsi, funksiyalar nəzəriyyəsi və topologiyanın bir çox sahələrinə H.Ağayevin böyük elmi marağı olmuş və bu sahələrdə apardığı tədqiqatlar mühüm nəticələr vermişdir. H.Ağayevin elmi

işləri, əsasən kvazixətti tənliklər və müxtəlif tipli xüsusi törəməli tənliklər sistemi, qeyri-xətti operator və diferensial-operatorlu tənliklər, ortoqonal funksiyalar sistemi nəzəriyyəsi kimi riyaziyyatın aktual məsələlərinə həsr olunmuşdur. Bir çox görkəmli mütəxəssislərin rəylərinə görə, Həşim Ağayevin işləri riyaziyyatın bir sıra həssas və çətin məsələlərinin həllində əhəmiyyətli irəliləyişlərə səbəb olub. Həşim Ağayevin əsərlərində kəsilən əmsallı yüksək tərtibli kvazixətti, elliptik və parabolik tipli tənliklər üçün sərhəd məsələlərin həllinin təyin edilməsində (qurulmasında) Zere-Şauder prinsipinin tətbiq edilməsinə dair bir sıra mühüm nəticələr vardır.

Həşim Ağayev riyaziyyat elminin fəlsəfi, tarixi və metodoloji məsələlərinə və onun təbliğinə böyük əhəmiyyət verirdi. Onun "Həqiqi ədədlər və limitlər" adlı kitabı və "Riyazi təkliflər (hökmlər) və isbatlar" adlı kitabları bu məsələlərə həsr olunub. O, uzun müddət Riyaziyyat və Mexanika İnstitutunda təbiətşünaslığın (təbiət elmlərinin) fəlsəfi məsələlərinə həsr olunmuş elmi seminara rəhbərlik edib. 1944-cü ildən ömrünün sonuna qədər Həşim Ağayev respublikanın ali məktəblərində - Bakı Dövlət Universitetində, Azərbaycan Pedaqoji İnstitutunda, texniki institutlarda mühazirələr oxuyub, ixtisas seminarları aparıb, diplom işlərinə və aspirantlara rəhbərlik edib.

Onun "Riyaziyyatın mahiyyəti haqqında", "Riyaziyyata yeni baxış" məqalələri bu elmin inkişaf tarixinə və fəlsəfi problemlərinə həsr olunmuşdur. Riyazi terminlərin elmi əsaslarının yaradılmasında da onun mühüm xidmətləri olmuşdur. Azərbaycan SSR Elmlər Akademiyası, Fizika və Riyaziyyat İnstitutu tərəfindən akademik Z.Xəlilovun redaktorluğu ilə çap edilən "Riyaziyyat terminləri lüğəti"nin (1954) ərsəyə gəlməsində Həşim müəllimin böyük əməyi olub.

Respublikada riyaziyyat elminin və riyazi təhsilin inkişafında mühüm xidmətləri olan Həşim Ağayev V çağırış Bakı Şəhər Sovetinin deputatı, Bakı Şəhər Partiya Komitəsinin, Respublika Dövlət Mükafatı Komissiyasının, ali təhsil müəssisələri və elmi idarələrin Həmkarlar İttifaqının Rəyasət Heyətinin üzvü kimi geniş ictimai-siyasi fəaliyyət göstərmişdir.

Həşim Ağayev insanların yaddaşında geniş elmi erudisiyası, humanitar-fəlsəfi düşüncəsi, klassik və müasir ədəbiyyatı yaxşı bilməsi ilə qalıb. O, dərin fəlsəfi-psixoloji şeirlərin müəllifi olsa da onların heç birini nəşr etdirməyib. Karl Veyerştras bu mənada haqlı idi ki, bir az şairliyi olmayan yaxşı riyaziyyatçı ola bilməz. O, böyük Azərbaycan şairi Səməd Vurğunla yaxın dost olub. Vaxtı ilə tələbəsi olmuş professor Nadir Süleymanov həmin illəri belə xatırlayır: *"1955-ci il idi. Universitetdəki (BDU onda indiki İqtisad Universitetinin əsas binasında yerləşirdi- F.R.) mühazirədən sonra Həşim müəllimlə Akademiyanın Rəyasət Heyətinə tərəf gedirdik. Sabir bağına ça-*



*Prof H.Ağayev və prof Ə.Həbibzadə*

*tanda S.Vurğunla qarşılaşdıq. Onlar bir-biri ilə çox mehriban görüşdülər, Həşim müəllim məni özünün gənc aspirantı kimi təqdim etdi, baxmayaraq ki, onda mən hələ tələbə idim. S.Vurğun riyaziyyatla bağlı bir neçə tərifləyici söz deyərək, aspirant üçün çox gəncdir - dedi.*

*Prof. Nadir Süleymanov Həşim müəllimi riyaziyyatın fanatı adlandıraraq yazır ki, o, gənclərdə riyaziyyata maraq oyadar, onların yaxşı işləmələri üçün şərait yaradar, ölkənin (keçmiş SSRİ-nin- F.R.) aparıcı riyaziyyat məktəbləri olan şəhərlərinə göndərər və müntəzəm olaraq onların fəaliyyəti ilə maraqlanar və kömək edərdi. Görkəmli alimləri Bakıya mühazirə oxumağa dəvət edərdi".*

Prof.H.Ağayevin müasir riyaziyyatın müxtəlif problemləri ilə bağlı 3 kitabı, Azərbaycanda və xarici ölkələrdə nəşr olunmuş 70-dən çox elmi məqaləsi nəşr edilib. Onun riyaziyyatçı alimlərin yetişməsində də uğurları böyükdür. Belə ki, onun elmi rəhbərliyi ilə 15 nəfər namizədlik dissertasiyası müdafiə edib.

Həşim Ağayev 2 avqust 1988-ci ildə Bakı şəhərində vəfat edib. O, elmi məktəbi olan alim, bacarıqlı elm və təhsil təşkilatçısı, müdrik müəllim, xeyirxah qəlbə və məlahətli nitqə malik insan, el ağsaqqalı və yüksək zəka sahibi kimi yaddaşlara köçüb.

Həşim Ağayev həm də gözəl ailə başçısı olub. Onun ailəsində (həyat yoldaşı Zəhra xanım) 4 oğul (Nazim, Əzizağa, Ramiz, Təhsil) və 2 qız övladı (Natəvan, Nazimə) böyüyüb.

**Ədəbiyyat**


1. ADPU-nun Arxivi. Həşim Nizam oğlu Ağayevin şəxsi işi.
2. Марданов М, Асланов Р. Предшественники современной математики Азербайджана. Москва, 2016, c. 145- 152
3. Həşim Nizam oğlu Ağayev. https: //az.wikipedia.org/wiki/


***Həşim Nizam oğlu Ağayev***



**AFAD MƏHƏMMƏD OĞLU QURBANOV**
*AMEA-nın müxbir üzvü,*
*filologiya elmləri doktoru, professor,*
*Əməkdar elm xadimi*
*(1929-2009)*

Afad Məhəmməd oğlu Qurbanov 1929-cu il yanvarın 10-da Qərbi Azərbaycanın Kalinino rayonunun əvvəllər Cuci, sonralar isə Qızıl Şəfəq adlanan kəndində yüksək rütbəli hərbçi ailəsində anadan olub. Atası Məhəmməd Qurbanov 1937-ci il repressiyasının qurbanı olmuş, anası Aişəbalı isə elə həmin il həyat yoldaşının müsibətinə və ayrılığına dözmədən dünyasını dəyişmişdir. O, 8 yaşında valideynlərini itirmişdir. Afad Qurbanov orta təhsilini Qərbi Azərbaycanın Qızıl Şəfəq və İlməzli məktəblərində almışdır. Müharibə illərindəki kadr qıtlığı, habelə onun savadı və təşkilatçılıq bacarığı nəzərə alınaraq 1945-ci ildə 16 yaşlı yeniyetmə Qızıl Şəfəq yeddiillik məktəbinin direktoru və Azərbaycan dili müəllimi təyin edilmişdir. Onun ən böyük arzusu ali təhsil almaq olduğundan Tbilisiyə gəlmiş, 1946-cı ildə Gürcüstan Müəllimlər İnstitutuna qəbul olunmuşdur. 1948-ci ildə Gürcüstan Müəllimlər İnstitutunu fərqlənmə diplomu ilə bitirən Afad Qurbanovu Başkeçid rayonundakı Oruzman yeddiillik kənd məktəbinə direktor və Azərbaycan dili və ədəbiyyatı müəllimi təyin etmişlər. Az sonra o, öz xahişi ilə məktəb direktoru vəzifəsindən azad olunaraq Bakıya gəlmiş, V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutunun Dil və ədəbiyyat fakültəsinə daxil olmuşdur. 1951-ci ildə institutu fərqlənmə diplomu ilə başa vuran Afad müəllim bir müddət Gürcüstan Respublikasının Başkeçid rayonundakı Hamamlı kənd orta məktəbinin direktoru vəzifəsində çalışmışdır. Elm və təhsil yolunu seçən Afad Qurbanov A.S.Puşkin adına Tbilisi Dövlət Pedaqoji İnstitutunda qısa müddətli müəllimlik fəaliyyətindən sonra 1956-cı ildə Bakıya qayıtmış və elə həmin il Azərbaycan Dövlət Pedaqoji İnstitutunun Azərbaycan dilçiliyi kafedrasında aspiranturaya daxil olmuşdur. Eyni zamanda, o, ADPİ-də, Bakı

Ali Partiya Məktəbində və Azərbaycan Xarici Dillər İnstitutunun Azərbaycan dili və ədəbiyyatı kafedrasında əvəzçiliklə müəllim işləmişdir. Aspiranturada oxuyarkən Afad Qurbanov Azərbaycan EA-nın müxbir üzvü, prof. Ə.Dəmirçizadənin elmi rəhbərliyi altında Səməd Vurğunun dramaturgiyasının dili üzərində tədqiqat işləri aparmış, elmi işini vaxtından əvvəl yazıb qurtardığı üçün rektorluq tərəfindən mükafatlandırılmış və institutda saxlanılmışdır. 1962-ci ildə A.M.Qorki adına Türkmənistan Dövlət Universitetinin Elmi Şurasının qərarı ilə ona "S.Vurğunun "Vaqif" pyesinin dili və üslubu" mövzusunda müdafiə etdiyi namizədlik dissertasiyasına görə filologiya elmləri namizədi alimlik dərəcəsi verilib. O, 1968-ci ildə Azərbaycan EA-nın İctimai elmlər bölməsində "Müasir Azərbaycan ədəbi dili" mövzusunda doktorluq dissertasiyası müdafiə edib. 1965-ci ildə ona dosent elmi adı verilib. 1970-ci ildə



*Ulu öndər Heydər Əliyev ADPİ-nin 60 illik yubiley tədbirində*

SSRİ Ali və Orta İxtisas Təhsil Nazirliyi yanında fəaliyyət göstərən Ali Attestasiya Komissiyası 1969-cu ildə ona elmlər doktoru elmi dərəcəsi, 1970-ci ildə professor elmi adı vermişdir.

Afad Qurbanov 1959-cu ildən Azərbaycan dilçiliyi kafedrasında assistent, müəllim, 1965-ci ildən dosent vəzifələrində çalışmışdır. O, Azərbaycan Dövlət Pedaqoji İnstitutunun Filologiya fakültəsinin dekan müavini (1967-1968), dekanı (1968-1981) işləmişdir.

***Afad Məhəmməd oğlu Qurbanov***

Azərbaycan SSR Ali və Orta İxtisas Təhsili Nazirliyinin 4 avqust 1981-ci il tarixli qərarı ilə Afad Qurbanov Azərbaycan Dövlət Pedaqoji İnstitutuna rektor təyin edilmişdir. O, bu vəzifədə 7 aprel 1989-cu ilə kimi fəaliyyət göstərmişdir. 1979-cu ildən həyatının sonuna kimi Afad Qurbanov Azərbaycan dilçiliyi kafedrasının müdiri işləmişdir. 1969-cu ildən Azərbaycan SSR Ali və Orta İxtisas Təhsili Nazirliyinin və Maarif Nazirliyinin Azərbaycan dili üzrə Tədris-Metodiki Şuralarının sədr müavini, sonralar Təhsil Nazirliyinin Elmi-Metodiki Şurasının və Təhsil Problemləri üzrə Elmi-Metodik Mərkəzinin və bir çox komissiyaların fəal üzvü olmuşdur. 1979-cu ildən "Azərbaycan toponimlər lüğəti" ensiklopedik nəşrinin, "Dil və ədəbiyyat" məcmuəsinin, "Elm və həyat" jurnalının, "Təhsil" və "Türkologiya" jurnallarının redaksiya heyətinin üzvü, "Dilçilik" elmi-linqvistik və "Onomastika" elmi-onomastik jurnallarının təsisçisi, baş redaktoru olmuşdur. O, 1980-ci ildən bir çox komissiyaların, o cümlədən Azərbaycan Əlifba Komissiyasının sədri, Azərbaycan Milli Elmlər Akademiyasının Terminologiya Komitəsinin, Adlar və Soyadlar üzrə Xüsusi Komissiyanın, Dövlət dili haqqında qanun layihəsinin



*Ulu öndər Heydər Əliyev ADPİ-də*

hazırlanması üzrə Komissiyanın, Əlaqələndirmə Şurasının, Nəsimi adına Dilçilik İnstitutunda Elmi və Müdafiə Şuralarının, Azərbaycan Yazıçılar Birliyinin üzvü olmuşdur.

***Afad Məhəmməd oğlu Qurbanov***

Afad Qurbanov Azərbaycan elminin inkişafında və yüksək ixtisaslı elmi və pedaqoji kadrların hazırlanmasındakı xidmətlərinə görə dəfələrlə Ali Sovetin Rəyasət Heyəti, Milli Elmlər Akademiyasının Rəyasət Heyəti və Təhsil



*Ulu öndər Heydər Əliyev ADPİ-də qəbul imtahanı zamanı*

Nazirliyi tərəfindən fəxri fərmanlara, təltiflərə layiq görülmüşdür. 30 iyun 1983 -cü ildə Azərbaycan Elmlər Akademiyasının müxbir üzvü seçilmişdir. 1983-1989 -cu illərdə Afad Qurbanov Azərbaycan Respublikası "Bilik" cəmiyyətinin natiqlik və mühaziraçilik məharəti komissiyasının sədri və Azərbaycan Ali Məktəbləri Rektorlar Şurasının Rəyasət Heyətinin üzvü olmuşdur. 1992-2009 -cu illərdə A.Qurbanov "Azərbaycan dilinin onomologiyası problemləri" laboratoriyasının müdiri vəzifəsində çalışmışdır.

Afad Qurbanov ölkədən kənarda da geniş yaradıcılıq fəaliyyəti göstərmişdir. O, 1984 -1989-cu illərdə SSRİ Elmlər Akademiyasının Sovet Türkoloqları Komitəsinin üzvü, Tədris-metodiki bölməsinin sədri, Türk onomastikası bölməsi bürosunun üzvü, sonralar həmin komitənin sədr müavini vəzifələrində çalışmışdır.

1992-2000-ci illərdə görkəmli alim Azərbaycan Milli Yaradıcılıq Akademiyasının, Beynəlxalq Pedaqoji Elmlər Akademiyasının, Rusiya Pedaqoji və Sosial Elmlər Akademiyasının, Nyu-York Akademiyasının

akademiki, Türk Dil Qurumunun şərəfli üzvü, Sürəkli Türk Dili Məclisinin həqiqi üzvü, Belçika Onomastika cəmiyyətinin, Finlandiyanın Fin-Uqor cəmiyyətinin və digər təşkilatların həqiqi və ya fəxri üzvü seçilmişdir.

Afad Qurbanov 1981 və 1987-ci illərdə Bakı Şəhər Sovetinin deputatı, 1990-1995-ci illərdə isə Azərbaycan Ali Sovetinin deputatı (millət vəkili) olmuşdur.

Afad Qurbanov 1987-ci ildə ABŞ-ın İndiana Universitetində keçirilmiş Türk Tədqiqatları üzrə İkinci Beynəlxalq Konfransda "Azərbaycan onomastikası sahəsində elmi tədqiqatlar", 1989-cu ildə isə Norveçin Oslo şəhərində keçirilmiş Daimi Beynəlxalq Altayşünaslıq Konfransının 32-ci iclasında "Kutianlar və onların şəxsi adları" mövzularında məruzələrlə çıxış etmişdir.

Azərbaycan dilçiliyinin korifeyləri – Ə.Dəmirçizadə, M.Şirəliyev, Ə.Abdullayev, Ə.Orucov və başqaları ilə adı bir sırada çəkilən Afad Qurbanov Azərbaycan dilçiliyinin əksər sahələrini əhatə edən çoxşaxəli elmi yaradıcılığa malik olmuşdur. Azərbaycan dilçiliyinin elə bir sahəsi yoxdur ki, Afad Qurbanov onu araşdırmamış və münasibət bildirməmiş olsun. O, ümumi dilçilik, türkoloji dilçilik, Azərbaycan dilçiliyi elminin tədqiqinə dair 70-dən çox irihəcmli kitabın və 500-dən artıq elmi-metodiki məqalənin müəllifidir. A.Qurbanovun "Ümumi dilçilik" (2 cilddə), "Türkoloji dilçilik" (5 cilddə), "Müasir Azərbaycan ədəbi dili" (2 cilddə), "Azərbaycan onomologiyasının əsasları" (2 cilddə), "Bədii mətnin linqvistik təhlili", "Azərbaycan şəxs adları ensiklopediyası", "Dünyanın dil ailələri" və s. əsərləri dilçilik elminə dəyərli töhfədir.

O, Azərbaycan dilçilik tarixində elmi məktəb yaratmış dilçilərimizdən biridir. Azərbaycan dili onomalogiyasının müstəqil bir nəzəri dilçilik şöbəsi – elmi məktəb kimi formalaşması onun fəaliyyəti ilə bağlıdır. Onun təşəbbüsü ilə hər il ardıcıl olaraq Azərbaycanın və müxtəlif ölkələrin tədqiqatçı alimlərinin iştirakı ilə onomastika tədqiqatlarına dair elmi konfranslar keçirilmişdir. Onun elmi fəaliyyətinin mühüm bir hissəsini ali məktəb pedaqogikası və metodikası təşkil edir. Onun bir müddət orta məktəbdə, uzun müddət isə ali məktəbdə çalışması elmi yaradıcılığında xüsusi iz qoymuşdur. Alimin nəşr etdirdiyi "Dilçilikdən kurs və diplom işləri" (1985), "Məktəb islahatı və pedaqoji təhsil problemləri" (1985), "Kurator və tələbə" (1989) adlı kitabları müəllimlər üçün faydalı vəsaitlərə çevrilmişdir. O, ilk dəfə olaraq respublika ali məktəblərində tədris edilən dilçilik fənlərini qruplaşdırmış və onların tədrisində bir sistem yaratmağa nail olmuşdur.

***Afad Məhəmməd oğlu Qurbanov***

Azərbaycan KP MK-nın və Azərbaycan SSR Nazirlər Sovetinin birgə qərarı ilə prof.Afad Qurbanova “Azərbaycan dilinin onomologiyası” kitabına görə ***Azərbaycan SSR Dövlət Mükafatı*** verilmişdir.

Afad Qurbanov ictimai-siyasi fəaliyyəti, elmi-pedaqoji uğurları, idarəetmə mədəniyyəti və insani keyfiyyətləri ilə adını Azərbaycanın müasir tarixinə yazmış yüksək zəka sahiblərindən biridir. Mən onu ilk dəfə Filologiya fakültəsinin dekanı kimi görüb tanımışam. Filologiya fakültəsi onda Ketsxoveli küçəsində (indiki akad. Şamil Əzizbəyov küçəsində) yerləşirdi. İnstitutun 3 saylı binası burada – özünün yazılmayan qanunları ilə “idarə” olunan məhəllə kimi tanınan “Kubinka”da yerləşirdi. Filologiya fakültəsində oxuyan tələbə dostumdan kitab almaq üçün institutun 3 saylı binasına getmişdim. Bina köhnə olsa da otaqların hündürlüyü, auditoriyaların genişliyi, dəhlizin səliqə-səhmanı diqqətimi cəlb etmişdi. Dəhlizin divarlarını görkəmli Azərbaycan şair və yazıçılarının yağlı boya ilə işlənmiş irihəcmli şəkilləri bəzəyirdi. Tənəffüs vaxtı olduğundan bir az da səs-küy var idi. Elə bu vaxt dəhlizə bir sakitlik çökdü, eşitdiyim söz bu oldu: “Afad müəllim gəlir”. Hamı dərsə getdi, dəhlizdə indi BDU-nun professoru olan Şamil Vəliyevlə mən qaldım. Afad müəllim Şamili əlaçı bir tələbə və qrup nümayəndəsi kimi yaxşı tanıyırdı. Şamildən mənim kimliyimi soruşdu. O da mənim Pedaqoji fakültənin tələbəsi olduğumu, Afad müəllimin “Müasir Azərbaycan dili” kitabını almaq üçün onun yanına gəldiyimi bildirdi. Afad müəllim bu təqdimatdan xoşhal oldu və getdi. O böyük insanla tanışlığımız belə başladı. Onun kitabları bizim istifadə etdiyimiz əsas dərslik idi.

İlk görüşümüzdən az sonra Afad müəllim ADPİ-yə rektor təyin olundu. Filologiya fakültəsindəki qayda-qanunlar instituta köçürüldü. İlk növbədə sərt və ciddi nizam-intizam yaradıldı. Tədris-köməkçi heyətinin işə davamiyyətinə nəzarət gücləndirildi. Səhv etmirəmsə, institutda ilk dəfə ümumi tabel yaradıldı. Tədris-köməkçi heyətin işə gələndə və gedəndə imza etməsi tələbi qoyuldu. İnstitutun ayrı-ayrı struktur bölmələrinin, fakültələrin və kafedraların işi yenidən quruldu. Fakültələr və kafedralar arasında yaxşı mənada rəqabət yaradıldı, ilin fakültəsi, ilin kafedrası seçildi. İnstitutun yeni loqosu hazırlandı (Həmin loqo 2016-cı ilə qədər istifadə olundu). Tədris binaları əsaslı şəkildə təmir olundu. İnstitutun həyətində tikintisi yarımçıq qalan 14 mərtəbəli binanın tikintisi başa çatdırıldı. Binanın açılışı çox böyük təntənə ilə baş tutdu. Həmin tədbirlə bağlı “Gənc müəllim” qəzetinin 11 yanvar 1985-ci il sayında oxuyuruq*:”Yeni il ərəfəsində - dekabrın 29-da qocaman institutumuz bayram libasına bürünmüşdür. Son illər bu tədris ocağının həyatında əlamətdar hadisələr tez-tez olur. Bu gün isə heç birinə bənzəmirdi. Səhər tezdən şən musiqi sədaları ətrafa yayıldı.*

*Həyətə toplaşmış müəllim və tələbələrin baxışlarından sonsuz sevinc, fərəh duyulurdu. Hamı institutun yeni tədris korpusunun istifadəyə verilməsini intizarla gözləyirdi. Bu münasibətlə keçirilən mitinqdə Azərbaycan SSR ali və orta ixtisas təhsili naziri Q.H.Əliyev, Azərbaycan SSR Nazirlər Soveti elm, texnika və tədris müəssisələrinin müdir müavini Q.Əmirov, 26 Bakı komissarları Rayon Partiya Komitəsinin birinci katibi X.J.Xəlilov, institutun rektoru, Azərbaycan SSR Elmlər Akademiyasının müxbir üzvü, Əməkdar elm xadimi, professor A.M.Qurbanov, institutun professor-müəllim heyəti, tələbələr və qonaqlar iştirak edirdilər. Təntənəli mitinqi Azərbaycan SSR ali və orta ixtisas təhsili naziri Q.H.Əliyev açdı. İnstitutun rektoru Azərbaycan SSR Elmlər Akademiyasının müxbir üzvü, Əməkdar elm xadimi, professor A.M.Qurbanov, professor H.Qədirov, professor Ə.Əlizadə, Tarix fakültəsinin IV kurs tələbəsi, Lenin təqaüdçüsü C.Qocayeva və b. çıxış etdilər.* Tədbirdə Riyaziyyat fakültəsinin dekanı dos. F.Abdullayev yeni korpusun istifadəyə verilməsi münasibəti ilə yazdığı şeiri oxudu".

Afad Qurbanovun gərgin zəhməti hesabına tamamlanmış tədris korpusunun ümumi sahəsi 8 min kvadratmetrdir. Binanın birinci, ikinci, üçüncü mərtəbələrində kitabxana yerləşirdi. Korpusda sürətlə hərəkət edən 6 lift quraşdırılmışdır. Onlardan dördü tələbələr, ikisi kitabxana üçündür. Müəllim və tələbələr üçün nəzərdə tutulan iki ixtisaslaşdırılmış oxu zalından eyni zamanda 700 nəfər istifadə edə bilir.

O dövrdə institutda təmir işləri yüksək zövqlə aparılmışdır. İnstitutun əsas binasının həyətində və daxilində binanın memarlıq quruluşuna ciddi xələl gətirən sonradan tikilmiş əlavə otaqlar Afad müəllimin göstərişi ilə söküldü. Xüsusilə, ikinci mərtəbədə Böyük zalın qarşısındakı kiçik və darısqal otaqlar ləğv edilərək indiki Heydər Əliyev lektoriyası olan zal (əvvəl burada siyasi dərslər keçirilərdi) düzəldildi. Böyük zal demək olar ki, "böyüklüyünü" itirmişdi. Sınıq-salxaq stulları, nimdaş pərdələri və rəngi solmuş divarları ilə kənd klubunu xatırladırdı. Zalın interyerinə uyğun gəlməyən köhnə lüstrlər (çilcıraqlar) tavana yaxşı bərkidilmədiyindən hər an qopub düşə bilərdi. Qısa bir vaxtda zal əsaslı təmir edildi, müasir dəbə uyğun pərdələr sifariş verildi, yeni lüstrlər (çilçıraqlar) və oturacaqlar quraşdırıldı. Zalın əvvəlki möhtəşəmliyi özünə qaytarıldı. İnstitutun yubileyi ilə bağlı binanın tərtibatında iştirak etmiş Əməkdar rəssam Soltan Atayev xatırlayır ki, *Afad müəllim çox zövqlü insan idi. Hər şeyə özü şəxsən nəzarət edirdi. Pərdələrin parçasını, dizaynını özü bəyənmişdi, pərdəlik parçanı Leninqraddan alıb gətirmişdilər. Lüstrlər üçün Buzovnada yerləşən zavoda dəfələrlə özü getmişdi. Həm zaldan, həm də dəhlizdən asılan bütün lüstrlər (çilçıraqlar) büllurdan hazırlanmışdı. Qiymətləri çox baha olsa da əksəriyyətini ona pay vermişdilər. Tavanın*

*bəzək işlərini mənə həvalə etmişdi. Təmir və bərpa işlərini elə aparmalı idim ki, orijinallığa xələl gəlməsin. Çətinliklə olsa da Afad müəllimi razı sala bildim. Tövsiyələrini eşidəndə mənə elə gəlirdi ki, o, filoloq yox, bərpaçı-rəssamdır. Sonra onun tapşırığı ilə Ü.Hacıbəyli küçəsindən instituta daxil olanda birinci mərtəbənin pilləkəninin üstündə divar boyu institutun layiq görüldüyü Qırmızı Əmək Bayrağı ordeninin, üçüncü mərtəbədə isə K.Marks, F.Engels və V.İ.Leninin mozaikasını düzəltmişdim".*

"İbtidai hərbi və fiziki təlim" fakültəsinin yerləşdiyi S.Rüstəm küçəsindəki tədris binasının fasadında idmançılara həsr olunmuş böyük həcmli mozaika da Soltan müəllim tərəfindən ərsəyə gətirilmişdi.

İnstitutda iki yeni ixtisasın - "Musiqi və nəğmə" və "İbtidai hərbi və fiziki təlim"in təşkili və inkişafı Afad müəllimin adı ilə bağlıdır. "İbtidai hərbi və fiziki təlim" fakültəsi üçün ayrılan binanın əsaslı şəkildə təmir edilməsi, tədrisin keyfiyyətli təşkili üçün silah-sursatların, hərbi maşınların alınması, maşınlar üçün boksların tikilməsi onun gərgin zəhmətinin bəhrəsidir. Fakültənin yerləşdiyi bina hərbi hissəni xatırladırdı. Nizam-intizam və daxili qayda-qanun, hətta salamlaşma da tam hərbi qaydalara uyğun qurulmuşdu. Hərbiyə aid fənləri tədris edən müəllimlər (zabitlər) və tələbələr mütləq uniforma geyinməli idilər. Uniforma geyinməyən zabit və tələbələr binaya daxil ola bilməzdilər. Bu fakültə Qafqazda birinci, SSRİ-də isə dördüncü idi. Ulu öndər H.Əliyevin diqqət və qayğısı əsasında yaradılmış bu fakültənin işinə Moskva çox qısqanclıqla yanaşırdı.



"İbtidai hərbi və fiziki təlim" fakültəsinin 2500-dən çox məzunu zabit rütbəsinə layiq görülüb. 80-ci illərdə Azərbaycanda milli dildə ali təhsil verən hərbi məktəbin olmadığını nəzərə alsaq, o zaman Afad müəllimin bu fədakarlığının əsl mahiyyəti aydın olar. Fakültənin məzunları orta məktəbdə hərbi rəhbər işləməklə yanaşı, həm də Müdafiə, Daxili İşlər, Milli Təhlükəsizlik nazirliklərində, Sərhəd Qoşunları, Miqrasiya Xidməti və Hərbi Səfərbərlik Dövlət Xidmətində çalışırlar.

***Afad Məhəmməd oğlu Qurbanov***

Qarabağ müharibəsində fakültənin məzunları əsl qəhrəmanlıq nümayiş etdirmiş, öz şücaətlərinə görə “Azərbaycan Bayrağı" ordeni ilə təltif edilmiş, Milli Qəhrəman adına layiq görülmüşlər.

Həmin illərdə institutda ən müasir avadanlıqlarla (diapozitiv, diafilm, kinofilm) təchiz edilmiş ixtisaslaşdırılmış kabinet təşkil olunmuşdu. Təlim prosesində televiziyadan və elektron hesablama maşınlarından geniş istifadə olunurdu. İnstituta qəbul imtahanları zamanı binanın həyətində bir neçə televizor quraşdırılmışdı. Valideynlər televizor vasitəsilə uşaqlarını görür, həm də cavablarını eşidirdilər. O dövrdə imtahanların bu formada təşkili böyük novatorluq idi ki, onun da müəllifi Afad müəllim idi.

Afad müəllim rektor olanda mən II kursun tələbəsi idim. Oxuduğum Pedaqoji fakültə indiki H.Əliyev adına Müasir Təhsil Kompleksinin yanındakı dənizçilərin yataqxanasında yerləşirdi. (Həmin bina 2015-ci ildə sökülərək yerində istirahət parkı salınıb). Bina 30-cu illərdə tikilmişdi, uzun müddət dənizçilərin yataqxanası olmuşdu. Onu da qeyd edim ki, “Əhməd haradadır?” filminin yataqxana ilə bağlı hissəsi məhz burada çəkilmişdi. Afad müəllim rektor təyin olunandan sonra Bakının müxtəlif yerlərində yerləşən Coğrafiya (Dağıstan küçəsi, 31), Filologiya (Ketsxoveli küçəsi), Pedaqoji və Mühəndis-pedaqoji fakültələrinin (Ənvər Qasımzadə küçəsi, 58) müəllim və tələbələri ilə görüşü oldu. Görüşdən sonra fakültə Elmi Şuralarında fakültənin inkişaf planlarının müzakirəsi oldu. Pedaqoji fakültə Elmi şurasında (Lenin təqaüdü ilə oxuduğuma görə, fakültə elmi şurasının üzvü idim) Afad müəllim institutda aparılan quruculuq və təmir-tikinti işlərindən, tədrisin keyfiyyətinin yüksəldilməsi ilə bağlı həyata keçirilən işlərdən danışdı. Pedaqoji fakültənin binasının təmirə ciddi ehtiyacı olduğunu bildirdi və həm də əlavə etdi ki, keyfiyyətli tikinti materialları tapmaq çətindir. Tikinti idarələrinə etdiyimiz xahişlərin əvəzinə daha böyük “xahişlər” edilir. Çətinliklərə baxmayaraq qısa bir müddətdə binada təmir - tikinti işlərinə başlanıldı. Yataqxana otaqlarının arakəsmələri ləğv edilərək mühazirə otaqlarına çevrildi, auditoriyalar, kafedralar, dekanlıqlar əsaslı təmir edildi. Birinci mərtəbədə oxu zalı yaradıldı. Musiqi şöbəsi üçün yataqxananın bir hissəsi boşaldıldı. Xeyli musiqi avadanlığı alındı. Müəllim və tələbələr üçün nəzərdə tutulmuş yeməkxana yüksək zövqlə təmir edildi. Müəllimlərin nahar etmələri üçün kabinetlər yaradıldı. O dövrün tələbələrindən biri kimi deyə bilərəm ki, yeməkxana müasir restoranları xatırladırdı, divarın yarısı və sütunlar mebel taxta ilə üzlənmişdi, qapı və pəncərələr dəyişdirilmiş, tavan incə zövqlə bəzədilmişdi. yeni stol və stullar alınmışdı. Tavandan asılan büllur çilçıraqlarla bərabər divar boyu və sütunlarda əski lampanı xatırladan müasir lampalar quraşdırılmışdı. Mühəndis pedaqoji və bədii qrafika fakültəsinin və Pedaqoji

fakültənin bütün tədbirləri, “Yeni il” şənliyi, ad günləri həmin yeməkxanada keçirilərdi. Yemək o qədər keyfiyyətli və ucuz idi ki, Tibb Universitetinin oğlan tələbələri də  nahar vaxtı bizim yeməkxanaya gələrdi. Onu da qeyd edim ki, Afad müəllimdən sonra həmin yeməkxana bina sökülənə kimi bir dəfə də olsun təmir edilmədi.

Afad müəllim səliqə - səhmanı sevən adam idi. Geyimi, yerişi, duruşu, nitqi, hərəkəti, sözünün kəsəri və nüfuzu ilə  əsl nümunə məktəbi idi. Onun verdiyi tapşırığı icra etməmək mümkünsüz idi. O, əvvəlcə zəruri şərait yaradar, sonra isə tələb edərdi. O dövrdə institutumuzun oğlan yataqxanaları Dərnəgüldə, qız yataqxanası isə Pedaqoji fakültənin yerləşdiyi binada (Ənvər Qasımzadə küçəsi, 58) idi. Afad müəllim tələbələrin daha çox vaxt keçirdiyi yataqxanalara ciddi fikir verirdi. Yataqxanaların təmirindən tutmuş səliqə - səhmanına qədər onun diqqətində idi.Yataqxanaların foyesində, mərtəbərinin dəhlizində, pilləkənlərində gül - çiçəkdən tərpənməyə yer yox idi. Yaşıllaşdırma idarəsindəki dostunun bağışladığı güllərin hesabına həm institut, həm də yataqxanalar  yaşıllağa bürünmüşdü. Yataqxanalarda keçirilən tədbirlərlə özü şəxsən iştirak edərdi. İbtidai təhsilin pedaqogikası və metodikası kafedrasının müdiri dos.Yaqut xanım Rzayeva (həmin dövrdə institutun partiya təşkilatı komitəsinin katibi olub) xatırlayır ki, həftənin bazar günləri ya rektorluqdan (prorektorlar), ya partiya təşkilatı komitəsindən, ya komsomol təşkilatı komitəsindən, ya da həmkarlar təşkilatından bir nəfər məsul şəxs yataqxanada növbətçi olardı. Afad müəllim özü də mütəmadi olaraq yataqxanaya gələr, tələbələrin şəraiti ilə tanış olar, istək və arzularını dinləyərdi. Yadımdadır ki, Dərnəgüldəki 4 saylı yataqxanada qalırdıq. Bazar günü idi, saat  10 olardı. Bir də  gördük ki, qapı açıldı, Afad müəllim  otağa girdi. Onunla gələnlər və  komendant Çingiz içəri  daxil oldu. Afad müəllim bir-bir bizdən yataqxana, yataqxananın  kitabxanası, yeməkxanası, yataq dəstlərinin hər həftə dəyişdirilib - dəyişdirilməməsi, otaqların vaxtlı-vaxtında təmizlənib-təmizlənməməsi ilə bağlı fikrimizi soruşdu. Sonra dəhlizin baş hissəsində yerləşən əl-üz yuyulan otağa və mətbəxə baş çəkdi. Dəmir borunun birindən cüzi şəkildə su sızırdı, onun təcili dəyişdirilməsinə göstəriş verdi. Yadımda qalan o olub ki, Afad müəllim heç nəyə uzaqdan baxıb keçmirdi, hər şeyə  diqqətlə baxırdı, bəzən də əli ilə yoxlayırdı.

80-ci illərdə Azərbaycanda pedaqogika və fənlərin tədrisi metodikası ixtisası üzrə 200-ə yaxın gəncin namizədlik dissertasiyasının müdafiəsinin təşkili və keçirilməsi də Afad müəllimin adı ilə bağlıdır. Həmin dövrdə aspiranturanın nüfuzu xeyli yüksək idi. Xeyli gənc namizədlik əsərlərini tamamlasa da respublikada İxtisaslaşdırılmış Müdafiə Şurası olmadığından ya başqa respublikalara gedir, ya da illərlə növbə  gözləməli olurdu. Pedaqoqlar

arasında yaranan süni qarşıdurmanın əziyyətini aspirant və dissertantlar çəkirdi. Afad müəllim Moskvada olarkən SSRİ Nazirlər Soveti yanında Ali Attestasiya Komissiyasının rəhbərliyi ilə danışıqlar apararaq ADPİ-nin nəzdində pedaqoji elmlər üzrə Müdafiə Şurasının yaradılmasına icazə ala bilmişdi. SSRİ Ali Attestasiya Komissiyası 5 avqust 1986-cı ildə və 2 mart 1989-cu ildə ADPİ-nin nəzdində pedaqoji elmlər üzrə institutun rektoru, AMEA-nın müxbir üzvü, prof.Afad Qurbanovun sədrliyi ilə Dissertasiya Şurasının yaradılması haqqında qərar qəbul etmişdi.

Afad müəllim mənim tərcümeyi - halıma yazılmış çox az insanlardan biridir. Belə ki, onun rektorluğu dövründə ən yüksək tələbə təqaüdünə - Lenin təqaüdünə layiq görülmüşəm, pedaqogika tarixi və nəzəriyyəsi ixtisası üzrə aspiranturaya daxil olmuşam, sədrliyi ilə namizədlik dissertasiyası müdafiə etmişəm və "Şagirdlərin peşəyönümü" elmi-tədqiqat laboratoriyasında kiçik elmi işçi kimi fəaliyyətə başlamışam. Afad müəllim Nərimanov seçki dairəsindən Milli Məclisə deputat seçiləndə təbliğatçısı olmuşam. Afad müəllim yaratdığı "Onomastika" elmi-tədqiqat laboratoriyasının rəhbəri olanda mən də "Şagirdlərin peşəyönümü" elmi-tədqiqat laboratoriyasının müdiri idim. Elmi laboratoriyalarla bağlı məsələləri Afad müəllimlə, Mürsəl müəllimlə (prof.Mürsəl Həkimov "Folklorşünaslıq" elmi-tədqiqat laboratoriyasının müdiri idi) birlikdə müzakirə edərdik.

Afad müəllimin ən böyük xidmətlərindən biri də institutun giriş qapısını Ü.Hacıbəyli küçəsinə keçirməsi oldu. 1901-ci ildə Bakı Kommersiya Məktəbi üçün tikilən həmin binanın giriş qapısı bulvar tərəfdən - Merkuryevski küçəsindən idi. Sonra küçə bir müddət Zubovskaya adlanmışdı. Sonra isə küçəyə türk millətinin qatı düşməni olan Şaumyanın adı verilmişdi. (Hazırda akademik Zərifə Əliyevanın adını daşıyır). Moskvaya və SSRİ-nin digər şəhərlərinə institutla bağlı göndərilən və orada gələn bütün sənədlərdə ünvan kimi Şaumyan küçəsi yazılırdı. Bu ünvanın Bakının bir erməni şəhəri təəssüratı yaratdığını yaxşı bilən Afad müəllim institutun giriş qapısının və ünvanın dəyişdirilməsinə nail oldu. Təbii ki, bu, Heydər Əliyevin milli özünüdərklə bağlı apardığı uzaqgörən siyasəti nəticəsində mümkün olmuşdu. Afad müəllim ermənilərin xislətindən xəbərdar olduğundan bacardığı qədər onlarla mübarizə aparırdı.

Afad müəllim zahirən nə qədər sərt görünsə də, daxilən o qədər humanist və insanpərvər idi. İnstitutun bütün əməkdaşlarına diqqət və qayğı göstərirdi. Yaxşı xatırlayıram ki, ikinci mərtəbədə ümumi şöbənin (dəftərxananın) qabağındakı divardan böyük stend asılmışdı. Həmin stentdə yubileyləri olan institut əməkdaşlarının şəkli vurulardı və onun haqqında məlumat yerləşdirilərdi. Yubilyar hökmən institutun Elmi Şurasına dəvət olunar, ona Fəxri fərman və

qiymətli hədiyyə verilərdi. Bu da təbii ki, əməkdaşlarda xoş əhval-ruhiyyə yaratmaqla daha yaxşı işləməyə həvəs yaradardı.

Afad müəllim ictimai-siyasi, elmi-pedaqoji və idarəetmə qabiliyyətini üzvü surətdə birləşdirməyi bacarmış və bu sahənin hər birində uğur qazanmış elm və təhsil xadimi idi. Onu sələflərindən fərqləndirən əsas keyfiyyətlərdən biri işgüzarlığı ilə yanaşı təsərrüfat –maliyyə işlərini yaxşı bilməsi idi.

80-ci illərin ikinci yarısında onun institutdakı quruculuq işlərindən respublikada hamı danışırdı. Belə deyirdilər ki, Afad müəllimi Bakı Şəhər Xalq Deputatları Sovetinin İcraiyyə Komitəsinə sədr vəzifəsinə aparacaqlar. Amma elə oldu ki, Azərbaycanda baş verən ictimai-siyasi vəziyyət tamam fərqli məcrada inkişaf etdi. Ulu öndər H.Əliyevin Moskvada ali vəzifədən uzaqlaşdırılması, Ermənistan-Azərbaycan Dağlıq Qarabağ münaqişəsi Bakıda siyasi çəkişmələrə rəvac verdi, qruplaşmalar yarandı.

Afad müəllim rektor vəzifəsindən imtina etsə də Milli Məclisin deputatı, kafedra müdiri və elmi-tədqiqat laboratoriyasının müdiri kimi ömrünün sonuna kimi şərəf və ləyaqətlə çalışdı.

Hər bir elm xadiminin fəaliyyətinin bir hissəsini çalışdığı sahə üzrə elmi kadrlar yetişdirmək işi təşkil edir. A.Qurbanov 60-dan çox elmlər namizədi və elmlər doktoru yetişdirmişdir.

Millətin tarixi taleyində rol oynayan insanlar heç vaxt unudulmur, zaman-zaman xatırlanır və yad edilir. Afad Qurbanov da belə alimlərdən, yüksək əxlaq və fəzilət sahibi olan insanlardan biridir.




*Prof.A.Qurbanovun yubileyi münasibətilə hazırlanmış poçt markası*

23 may 2019-cu ildə AMEA-nın əsas binasında görkəmli dilçi alim, türkoloq və ictimai xadim, müasir Azərbaycan əlifbasının müəllifi və onomastika elmi məktəbinin banisi, Əməkdar elm xadimi, Dövlət mükafatı laureatı, AMEA-nın müxbir üzvü Afad Qurbanovun anadan olmasının 90 illik yubileyinə həsr edilən respublika elmi konfransı keçirildi. Tədbirdə AMEA-nın prezidenti, akademik Akif Əlizadə çıxış edərək görkəmli alim Afad Qurbanovun mənalı ömür yolundan, onun zəngin elmi-pedaqoji fəaliyyətindən, qazandığı uğurlardan danışaraq qeyd etdi ki, adı Azərbaycan dilçiliyinin korifeyləri ilə bir sırada çəkilən, bütün dövrlərdə türk və Avropa dilçiləri tərəfindən orijinal




*ADPU- da prof. A.Qurbanova həsr olunmuş Beynəlxalq konfrans.*
*Sağdan: Təhsil nazirinin müavini Məhəbbət xanım Vəliyeva,*
*ADPU-nun rektoru, prof. Cəfər Cəfərov, Türk Dil Qurumunun sabiq rəhbəri,*
*prof.Şükrü Halük Akalın (2019)*

elmi konsepsiyalar müəllifi kimi rəğbətlə qəbul edilən Afad Qurbanov dilçilik elminin inkişaf etdirilməsində öz səylərini əsirgəməyib. Azərbaycan dilçiliyi ilə yanaşı, dünya dilçiliyinin və türkologiyanın inkişafına öz töhfəsini verib. Onun yazdığı "Ümumi dilçilik" əsəri bu gün də ali təhsil müəssisələrində yeganə dərs vəsaiti olaraq istifadə edilir. Sonra Azərbaycan Respublikası Təhsil nazirinin müavini İdris İsayev çıxış edərək Afad Qurbanovun Azərbaycan elm və təhsilinin inkişafındakı rolundan bəhs etdi. Rusiya Elmlər Akademiyasının vitse-prezidenti akademik Taliya Xabriyeva REA-nın prezidenti, akademik Aleksandr Sergeyevin konfrans iştirakçılarına ünvanladığı məktubu oxudu.

Azərbaycan Dövlət Pedaqoji Universitetinin rektoru, prof. Cəfər Cəfərov "Afad Qurbanovun təhsil təşkilatçılığı", Türk Dil Qurumunun rəhbəri, professor Gürer Gülsevin "Afad Qurbanov və ortaq türk dili", Humanitar Elmlər Bölməsinin akademik-katibi, akademik Teymur Kərimli "Afad Qurbanov və onomastika elmi məktəbi", Nəsimi adına Dilçilik İnstitutunun direktoru, akademik Möhsün Nağısoylu "Afad Qurbanov və dilçilik elminin inkişafı", A.A.Bakıxanov adına Tarix İnstitutunun direktoru, akademik Yaqub Mahmudov "Tarixdə Afad Qurbanov (Qaraqurbanlılar) şəcərəsi", Azərbaycanda Atatürk Mərkəzinin müdiri, akademik Nizami Cəfərov

***Afad Məhəmməd oğlu Qurbanov***



*ADPU-da prof. A.Qurbanovun xatirə lövhəsinin açılışı*

“Afad Qurbanov və ümumi dilçilik”, Türk Dil Qurumunun sabiq rəhbəri, professor Şükrü Halük Akalın “Afad Qurbanov və müasir Azərbaycan əlifbası” mövzularında məruzələrlə çıxış etdilər.

Daha sonra “Azərmarka” MMC-nin direktoru Leyla Güləliyeva Afad Qurbanovun yubileyi münasibətilə hazırlanmış poçt markasını təqdim etdi. Bundan başqa, görkəmli alimin Xatirə kitabı və 13 cildlik seçilmiş əsərləri ictimaiyyətə təqdim olundu. Sonda professor Afad Qurbanovla bağlı sənədli film nümayiş etdirildi.

Respublikada prof.Afad Qurbanovla bağlı silsilə tədbirlər davam etdirildi. Ömrünün bütöv bir hissəsini - 70 ilə yaxın bir dövrünü Azərbaycan Dövlət Pedaqoji Universiteti ilə bağlayan Afad Qurbanovun burada 90 illik yubileyinə həsr olunmuş “Müasir dilçiliyin aktual problemləri” Beynəlxalq elmi konfrans keçirildi. Konfransda Türkiyədən, Rusiyadan və digər xarici ölkələrdən alimlər, universitet rektorları, Litvanın ölkəmizdəki fövqəladə və səlahiyyətli səfiri Valdas Lastauskas iştirak etdi. Konfransdan öncə Afad Qurbanovun elmi-pedaqoji və ictimai-siyasi fəaliyyətini əks etdirən sərgi nümayiş etdirildi, həmçinin uzun illər çalışdığı Filologiya fakültəsinin Azərbaycan dilçiliyi kafedrasında alimin xatirə lövhəsinin açılışı oldu. Sonra ADPU-nun Böyük zalında konfransın plenar iclası keçirildi. Konfransda ADPU-nun rektoru, professor Cəfər Cəfərov, təhsil nazirinin müavini Məhəbbət Vəliyeva, Türk Dil Qurumunun sabiq sədri, prof.Şükrü Halük Akal, AMEA-nın Humanitar elmlər bölməsinin akademik-katibi, M.Füzuli adına Əlyazmalar İnstitutunun






*Prof. A.Qurbanovun 90 illik yubiley tədbirində. Soldan: prof. Mahirə Hüseynova, dos Sevda Zamanova, prof.Mirvari İsmayılova, prof.Məhərrəm Hüseynov, prof.Asəf Zamanov, prof.Fərrux Rüstəmov, dos.Məlahət Babayeva*

direktoru, akademik Teymur Kərimli, İ.Cavaxişvili adına Tbilisi Dövlət Universitetinin Türk dili və ədəbiyyatı kafedrasının müdiri, prof. Marika Jikia, Serbiya Elmlər və İncəsənət Akademiyasının Serb Dili İnstitutunun İdarə Heyətinin üzvü, prof.Marija Dindic çıxış edərək A.Qurbanovun türkologiya

elminin inkişafına verdiyi dəyərli töhfələrdən bəhs etdilər. Bakı Slavyan Universitetinin dekanı, prof.Fidan Qurbanova A.Qurbanovun nəfis şəkildə nəşr edilmiş 13 cildlik əsərləri barədə məlumat verdi. Ailə üzvləri adından prof.Yaqub Qurbanov çıxış etdi. Konfransda 4 bölmədə (Ümumi dilçilik, Türkoloji dilçilik, Onomalogiya və Praktik dilçilik) 140-dan çox məruzə dinlənilərək müzakirə edildi.




*Prof. Afad Qurbanovun ailə üzvləri xatirə lövhəsinin açılışında*

Azərbaycan Dövlət Pedaqoji Universitetinin bir əsrlik tarixində onun 31 rektoru (direktoru) olub. Həmin rektorlardan yalnız Cəlil Məmmədzadəyə (5 illik), prof. Əhməd Seyidova (25 illik), Həşim Ağayevə (50 illik), prof.Afad Qurbanova (60 illik) və akademik Yusif Məmmədova (85 və 90 illik) institutun yubileylərini dövlət səviyyəsində keçirmək nəsib olub. Afad müəllim rektor olanda institut yüksək ixtisaslı pedaqoji və elmi-pedaqoji kadrlar hazırlığında, xalq maarifinin inkişafında böyük xidmətlərinə görə və yaradılmasının 60 illiyi ilə əlaqədar olaraq Azərbaycan SSR Ali Sovetinin Rəyasət Heyətinin Fəxri Fərmanı ilə təltif olunub. İndiki Şəhriyar adına klubda keçirilmiş yubiley tədbirinin iştirakçısı kimi deyə bilərəm ki, tədbir çox yüksək səviyyədə keçdi. Azərbaycan KP MK-nın I katibi H.Əliyev çox səmimi bir çıxış etdi və Fəxri Fərmanı Afad müəllimə şəxsən özü təqdim etdi. Yubiley ili institutun əməkdaşları üçün bayrama çevrilmişdi. Həmin il Azərbaycan SSR Ali Soveti Rəyasət Heyəti institutun əməkdaşlarının təltif edilməsi ilə bağlı 2 dəfə Fərman imzalamışdı. 3 iyun 1981-ci il tarixli Fərmanla 4 nəfər

"Əməkdar elm xadimi", 4 nəfər "Azərbaycan SSR əməkdar ali məktəb işçisi" fəxri adına layiq görülmüşdü. Həmin dörd nəfərdən biri də Afad müəllim idi. 23 dekabr 1981-ci il tarixli Fərmanla isə 1 nəfərə Əməkdar elm xadimi, 7 nəfərə "Azərbaycan SSR Əməkdar ali məktəb işçisi" fəxri adı verilmişdi, 12 nəfər Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin Fəxri Fərmanı ilə təltif olunmuşdu.



*Prof A.Qurbanov və ailə üzvləri*

80 illik mənalı ömür yaşamış böyük alim, böyük insan Afad müəllimin vəfatı ilə bağlı imzalanmış nekroloqda yazılırdı: "Təvazökar insan, görkəmli alim, yorulmaz təşkilatçı, böyük müəllim və pedaqoq A.M.Qurbanovun nurlu xatirəsi onu sevənlərin, tələbələrinin, aspirantlarının, Azərbaycan elmi ictimaiyyətinin yaddaşında əbədi yaşayacaqdır". Çünki o, adını millətin təhsil və elm tarixinə yazmağı bacarıb.

**Ədəbiyyat**


1. ADPU-nun arxivi. Professor Afad Qurbanovun şəxsi işi. 146 v.
2. Afad Qurbanov. Bakı, Elm, 2010
3. Afad Qurbanov. Azərbaycan elm və mədəniyyət xadimləri. Biblioqrafiya. Bakı, Elm, 2006
4. Tanrıverdi Ə. Türkologiyamızın Afad Qurbanovu. Bakı, "İmak", 2018, 244 s.
5 .Sadıqova S. Dilçilik elmində Afad Qurbanov irsi. Bakı, 2018
6. Seyidəliyev N.Afad Qurbanov və ümumi dilçilik.Bakı, 2019, 420 s.
6.. http://www.afadgurbanov.az/


***Afad Məhəmməd oğlu Qurbanov***



**SƏLVƏR RİZA OĞLU ASLANOV**
*Azərb.MEA-nın müxbir üzvü, tarix elmləri doktoru, professor (1930- 2000)*

Səlvər Riza oğlu Aslanov 1930-cu il noyabrın 11-də Bakı şəhərində qulluqçu ailəsində anadan olub. Orta təhsilini Şamxor (Şəmkir) şəhər orta məktəbində alıb. 1949-cu ildə Azərbaycan Dövlət Universitetinin tarix fakültəsinə daxil olub. 1950-ci ildə M.V.Lomonosov adına Moskva Dövlət Universitetinin tarix fakültəsinin ikinci kursuna köçürülüb.

1954-cü ildə həmin universiteti uğurla başa vuran Səlvər Aslanov Bakıya qayıdır.V.İ.Lenin adına Muzeyin Bakı filialında kiçik elmi işçi kimi əmək fəaliyyətinə başlayır. Elmi fəaliyyətlə yanaşı geniş ictimai fəaliyyətlə məşğul olmağa başlayır. 1955-ci ildə komsomol işinə keçir. O, bir müddət respublika komsomol təşkilatında işlədikdən sonra ÜİLKGİ-nin təlimatçısı vəzifəsinə irəli çəkilir. 1960-1961-ci illərdə Azərbaycan LKGİ MK-nın katibi işləmişdir. 1961-1963-cü illərdə Azərbaycan KP MK-da təbliğat-təşviqat şöbəsi müdirinin müavini, sonra müdiri işləmişdir. 1963-1964-cü illərdə Sov.İKP MK-nın Zaqafqaziya bürosunun inspektoru olmuş, sonra Bakı Şəhər Partiya Komitəsinin katibi seçilmişdir. M.V.Lomonosov adına Moskva Dövlət Universitetinin Sov.İKP tarixi kafedrasının aspirantı olmuş, 1961-ci ildə namizədlik dissertasiyası, 1965-ci ildə doktorluq dissertasiyası müdafiə etmişdir. Doktorluq dissertasiyasında 1928-1941-ci illərdə respublikada sənayenin inkişafında Azərbaycan Kommunist Partiyasının oynadığı rol araşdırılmışdır. SSRİ Ali Attestasiya Komissiyası tərəfindən 1966-cı ildə ona professor elmi adı verilmişdir. Həmin illərdə onun Azərbaycanda sənayenin inkişafı ilə bağlı Moskvada və Bakıda monoqrafiyaları və nüfuzlu elmi nəşrlərdə silsilə məqalələri nəşr olunur. 1971-ci ildə Moskvanın “Ekonomika” nəşriyyatı tərəfindən “Azərbaycan SSRİ xalq təsərrüfatı sistemində” adlı fundamental monoqrafi-

yası işıq üzü görür. Keçmiş SSRİ-də nüfuzlu partiya tarixçisi kimi tanınan Səlvər Aslanov SSRİ-də sənayeləşmənin gedişi, partiya quruculuğu və partiya tari- xi ilə bağlı Moskvada nəşr olunan kollektiv əsərlərin müəlliflərindən biri kimi tanınır. 1966-cı ildə Sov.İKP üzvlüyünə qəbul edilir.

Səlvər Aslanov 1966-1973-cü illərdə D.Bünyadzadə adına Azərbaycan Xalq Təsərrüfatı İnstitutuna rəhbərlik edir. Onun rəhbərliyi ilə həmin illərdə institut xeyli inkişaf edir, xalq təsərrüfatının müxtəlif sahələri üzrə xeyli milli kadr hazırlanır. 1974-cü ildə Səlvər Aslanov Azərbaycan Dövlət Pedaqoji İnstitutunun Sov.İKP tarixi kafedrasına müdir vəzifəsinə seçilir. Həmin vəzifədə o, 1979-cu ilədək uğurla fəaliyyət göstərir. O, 7 aprel 1989-cu ildən 9 mart 1994-cü ilə kimi Azərbaycan Dövlət Pedaqoji Universitetinin rektoru vəzifəsində çalışır. Onun dövründə Azərbaycan Respublikasının Nazirlər Kabinetinin 1991-ci il tarixli qərarı ilə Azərbaycan Dövlət Pedaqoji İnstitutu universitetə çevrilir. Az sonra onun təşəbbüsü ilə Azərbaycan Respublikasının Nazirlər Kabinetinin 1991-ci il tarixli qərarı ilə Universitetə Nəsirəddin Tusinin adı verilir.

Həmin illərdə Ermənistanın Azərbaycana təcavüzü başlamışdı. Xankəndində başlayan erməni təcavüzü günü-gündən genişlənirdi. Nəcəf Quliyev, Nazim Axundov, Kamil Quliyev, Xasay Cabbarov, Süleyman Zeynalov, Ənvər Əhməd, Mirələm Vəliyev, Abbas Abbasov, Yusif Ağayev, Zabil Bayramov, Şahlar Quliyev, Bəşir Fərəcov, Yusif Fərzəliyev, Eldar Məmmədov kimi dəyərli alimlərimizin çalışdığı Xankəndi Pedaqoji İnstitutu erməni millətçilərinin əməllərinə, məkrli planlarına maneçilik törətdiyindən, 1988-ci il mayın 16-da institutun Azərbaycan şöbəsinin müəllim və tələbələri fiziki və mənəvi təzyiqlərə məruz qalaraq Xankəndindən qovuldu. Pedaqoji kollektiv Şuşa şəhərində müvəqqəti sığınacaq tapdı, daha sonra isə Gəncəyə köçürüldü. (Qeyd edək ki, Xankəndi Pedaqoji İnstitutu 1969-cu ildə Pedaqoji İnstitutun filialı kimi təşkil olunmuşdu. Həmin filialın bazası əsasında 1973-cü ildə müstəqil Xankəndi Pedaqoji İnstitutu yaradılmışdı).

Azərbaycan şöbəsi Şuşada Pedaqoji Universitetin filialı kimi fəaliyyətə başladı. Filialın fəaliyyətini təşkil etmək məqsədilə prof.S.Aslanov, prof.Məlikməmməd Cəbrayılov, riyaziyyat və onun ibtidai kursunun tədrisi metodikası kafedrasının baş müəllimi Qulu Qasımov Şuşa şəhərinə ezam olunur. Həmin dövrdə Pedaqoji Universitetin tədris işləri üzrə prorektoru vəzifəsində çalışan prof.Məlikməmməd Cəbrayılov o günləri belə xatırlayır*:"Qarabağ hadisələri başlananda erməni millətçiləri Xankəndi Pedaqoji İnstitutunu hədəfə almışdılar. Bu institutun Qarabağ bölgəsində təhsilin, maarifçiliyin inkişafında müstəsna xidmətləri olmuşdu. Azərbaycanlı müəllim və tələbələr Xankəndindən qovulanda onlar Şuşada yerləşdilər.*

***Səlvər Rıza oğlu Aslanov***

*Xankəndi Pedaqoji İnstitutunun Azərbaycan şöbəsi ADPU-nun filialı kimi yenidən təşkil olunanda rektor Səlvər Aslanov, mən və Qulu müəllim Şuşaya getməli olduq. Vəziyyət həddən artıq təhlükəli idi. Mən onda gördüm ki, Səlvər müəllim çox cəsarətli, vətənpərvər və qorxmaz adamdır. Biz Ağdama getdik, oradan da Xankəndindən keçməklə Şuşaya qalxdıq. Bizi az sonra müdafiə naziri olan general Dadaş Rzayev müşayiət edirdi. Səlvər Aslanov o dövrdə Azərbaycan Ali Sovetinin deputatı idi. Şuşada filial üçün yaxşı bir bina ayrılmışdı. Filiala rəhbərlik dos.Mail Alıcanova həvalə olunmuşdu. Filialın müəllimləri, tələbələri ilə maraqlı və yadda qalan görüşlərimiz oldu. Tədrisin təşkili ilə bağlı xeyli təklif və tövsiyələrimiz oldu. Bütün çətinliklərə baxmayaraq filialın professor-müəllimləri əzmlə çalışırdılar. Kollektivdə nikbin əhval-ruhiyyə hökm sürürdü. Tələbələrin hamısı Şuşaya qayıtmışdı. Axşama yaxın Ağdama qayıtmalı idik. Xəbər gəldi ki, ermənilər daha da azğınlaşıb, azərbaycanlıların maşınlarını gülləbaran edir, insanları girov götürürlər. Biz vertolyotla Ağdama, oradan da maşınla Bakıya gəldik. Səhərisi gün Səlvər müəllim rektoryanı müşavirə çağırdı.Şuşa filialı ilə bağlı prorektorlara və struktur rəhbərlərinə konkret tapşırıqlar verdi. Şuşa filialı sonra Gəncəyə, oradan da Ağcabədiyə köçürüldü. Ağcabədi filialı Azərbaycan Müəllimlər İnstitunun tərkibinə verilənədək (13 iyun 2000-ci il) Azərbaycan Dövlət Pedaqoji Universitetin rəhbərliyinin diqqət və qayğısı ilə əhatə olundu".*

Səlvər Aslanov Azərbaycan tarixi və siyasi elmlər sahəsində tanınmış alim olmuşdur. Onun elmi fəaliyyətinin əsas istiqamətini Azərbaycan Respublikasının sənayeləşdirilməsi, iqtisadi qüdrətinin möhkəmləndirilməsi, habelə totalitar sovet rejimi şəraitində Azərbaycanın müstəqilliyi uğrunda mübarizə və digər məsələləri araşdırmaq təşkil etmişdir. Səlvər Aslanov hər bir fəaliyyətində Azərbaycan xalqının tarixi keçmişini, inqilabi - demokratik hərəkatını elmi cəhətdən obyektiv işıqlandırmağa, cəmiyyətin, kütlələrin tarixi şüurunu düzgün formalaşdırmağa çalışmışdır. Azərbaycan torpağının bütövlüyünü qorumaq, millətlərarası münasibətləri qaydaya salmaq, xalqımızın dinc həyatını təmin etmək məqsədilə ilə xeyli işlər görmüşdü. Səlvər Aslanov Azərbaycan dilinin dövlət dili kimi hər yerdə işlədilməsində, onun rolunun yüksəldilməsində, beynəlmiləl məktəblərdə Azərbaycan dilini tədris etmək üçün ixtisaslı kadrların hazırlanması işində bütün imkanlardan bacarıqla istifadə etmişdir. Şəxsi işində saxlanan sənədlərdə institut rəhbərliyi və həmkarları onu vətənpərvər, təvazökar, xeyirxah, erudisiyalı alim, təhsil təşkilatçısı, böyük iş təcrübəsinə malik peşəkar işçi, tabeliyində olanlara qarşı olduqca səmimi bir insan kimi səciyyələndirirlər.

13 sentyabr 1974-cü ildə ADPİ-nin Tarix fakültəsinin dekanı dos.Həmzə Qasımzadənin onun haqqında müsabiqə komissiyasına təqdim etdiyi rəy-

də yazırdı:"*Səlvər müəllim istedadlı alimdir, yaxşı yoldaşdır, təvazökar insandır, gözəl təşkilatçıdır, bacarıqlı işçidir. O, həmişə işdə yenilik axtarır, irəli sürülən hər bir məsələyə yaradıcı yanaşmağı bacarır. Rəhbər işçi üçün tələb olunan əsas keyfiyyətlər onun savadlılığı, işgüzarlığı, təşkilatçılığı, möhkəm iradəli olması və mədəni rəftarıdır. Səlvər müəllimdə bunların hamısı vardır. Onun təmiz ürəyi vardır, xeyirxahdır, təvazökardır, səmimidir. Bunlar isə yüksək məziyyətlərdir. S.Aslanov yoldaşın işgüzarlığına şübhə ola bilməz. O, institutun ictimai işlərində də yaxından iştirak edir."*

Səlvər Aslanov respublikanın ictimai-siyasi həyatında fəal iştirak etmiş ziyalılardan biri olmuşdur. O, yeddinci çağırış Azərbaycan SSR Ali Sovetinin, VII-VIII çağırış Bakı Şəhər Sovetinin deputatı seçilmişdir. Azərbaycan KP-nin XXVI qurultayında Azərbaycan KP MK-nın üzvlüyünə namizəd seçilmişdir. Bakı Şəhər Partiya Komitəsinin büro üzvü olmuşdur. Azərbaycan KP-nin XXXII qurultayının nümayəndəsi olmuşdur.




*ADPU-nun rektoru, prof.S. Aslanov, tədris işləri üzrə prorektor, prof.M.Cəbrayılov ADPU-nun Şuşa filialının əməkdaşları ilə. Şuşa şəhəri, 1991*

1991-ci il 18 oktyabrda Azərbaycanın dövlət müstəqilliyi haqqında Konstitusiya Aktının qəbulunda xüsusi fəallıq göstərmişdir. O, ictimai-siyasi fəaliyyətini elmi-pedaqoji yaradıcılığı ilə uğurla əlaqələndirmiş, səmərəli nailiyyətlər əldə etmişdir.

Belə ki, o, 90-dan çox elmi məqalənin və 10 monoqrafiyanın müəllifi olmuşdur. Onun əsərlərinin ümumi həcmi 300 çap vərəqindən artıqdır. ABŞ-da, İraqda, Kubada, Qvineyada, Moskvada, Leninqradda (indiki Sankt-Peterburqda) keçirilən bir sıra beynəlxalq konfrans və simpoziumlarda iştirak etmişdir.

***Səlvər Rıza oğlu Aslanov***

Çoxşaxəli yaradıcılığı elmi ictimaiyyət tərəfindən təqdir olunan S.Aslanov 1989-cu ildə Azərbaycan Elmlər Akademiyasının müxbir üzvü seçilmişdir. SSRİ Sosioloqlor Assosiyasının, SSRİ Jurnalistlər İttifaqının, SSRİ Ali və Orta İxtisas Təhsili Nazirliyinin Elmi-Metodik Şurasının, S.M.Kirov adına ADU-nun Müdafiə Şurasının üzvü olmuşdur.

Prof.Səlvər Aslanovun pedaqoji və elmi-pedaqoji kadrlar hazırlığında mühüm xidmətləri olmuşdur. Bilavasitə onun elmi rəhbərliyi ilə 8 nəfər dissertasiya müdafiə edərək tarix elmləri namizədi alimlik dərəcəsi almışdır. O, Bakı, Moskva, Tbilisi, Mahaçqala və İrəvanda keçirilən Müdafiə Şuralarında 4 nəfərin doktorluq, 12 nəfərin namizədlik dissertasiyasının rəsmi opponenti kimi çıxış etmişdir.

Onun əməyi, elm və təhsil təşkilatçılığı sahəsindəki xidmətləri dövlət tərəfindən yüksək dəyərləndirilmişdir. SSRİ Xalq Təsərrüfatı Nailiyyətləri sərgisinin iştirakçısı olmuş, sərginin 2 qızıl medalı, "Leninin 100 illik yubileyi", "Əməkdə fərqlənməyə görə", "Əmək veteranı" medalı, "Şərəf Nişanı" ordeni və Azərbaycan SSR Ali Sovetinin Rəyasət Heyətinin, SSRİ Xalq Təhsili Nazirliyinin, SSRİ və Azərbaycan SSR "Bilik" cəmiyyətinin Fəxri Fərmanları ilə təltif olunmuşdur.

AMEA-nın müxbir üzvü, tarix elmləri doktoru, professor Səlvər Aslanov nümunəvi ailə başçısı olmuşdur. Ailəsində iki oğul (Azad və Ayaz) və bir qız ( Leyla) böyümüşdür.

Prof.Səlvər Aslanov 2000-ci ildə Bakı şəhərində vəfat etmişdir.

## Ədəbiyyat


1. ADPU-nun Arxivi. Səlvər Riza oğlu Aslanovun şəxsi işi. 56 v.
2. Məmmədov Y.Azərbaycan Dövlət Pedaqoji Universiteti-90. Bakı, Təhsil, 2012, s.131
3. Azərbaycan Respublikasının Nazirlər Kabinetinin "V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutunun Universitetə çevrilməsi haqqında" qərarı. "Gənc müəllim" qəzeti, 26 aprel 1991-ci il
4. Azərbaycan Respublikasının Nazirlər Kabinetinin "V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji Universitetinin adının dəyişdirilməsi haqqında" qərarı. "Gənc müəllim" qəzeti, 25 dekabr 1991-ci il



**NİZAMİ MƏNAF OĞLU XUDİYEV**
*filologiya elmləri doktoru, professor, Əməkdar elm xadimi (1949)*

Nizami Mənaf oğlu Xudiyev 1949-cu il aprelin 1-də Naxçıvan Muxtar Respublikasının Şahbuz rayonunda anadan olub. 1955-1966-cı illərdə Naxçıvan şəhər 1 və 2 saylı və Şahbuz qəsəbə orta məktəbində, 1966-1970-ci illərdə Azərbaycan Dövlət Pedaqoji İnstitutunun filologiya fakültəsində təhsil alıb. Təhsil illərində "Nizami Gəncəvi" adına təqaüdlə oxuyub, fakültə komsomol komitəsinin katibi olub. İnstitutu fərqlənmə diplomu ilə bitirən Nizami Xudiyev fakültə elmi şurasının qərarı ilə "Azərbaycan dilçiliyi" kafedrasında müəllim saxlanılıb. Hərbi xidmətdən (1972-1973) sonra həmin kafedrada pedaqoji fəaliyyətini davam etdirib (1973-1975), baş müəllim (1975-1981) və fakültə həmkarlar təşkilatının sədri (1974-1979) vəzifələrində çalışıb. 1978-ci ildə "Abdulla Şaiqin nəsr dili (leksika və frazeologiya)" mövzusunda dissertasiya müdafiə edərək filologiya elmləri namizədi alimlik dərəcəsi alıb. 1981-ci ildə ona SSRİ Ali Attestasiya Komissiyası tərəfindən dosent elmi adı verilib. 1981-1990-cı illərdə "Azərbaycan dilçiliyi" kafedrasında dosent vəzifəsində çalışan N.Xudiyev 1979-1991-ci illərdə ADPU-nun Həmkarlar İttifaqı Komitəsinə rəhbərlik edib. 1990-cı ildə "Azərbaycan ədəbi dili lüğət tərkibinin inkişaf qanunauyğunluqları" mövzusunda doktorluq dissertasiyası müdafiə edərək filologiya üzrə elmlər doktoru alimlik dərəcəsi alıb. Elə həmin ildə də "Azərbaycan dilçiliyi" kafedrasına professor vəzifəsinə seçilib.

1991-1994-cü illərdə ADPU-nun I prorektoru vəzifəsində çalışıb. Həmin illərdə Universitetdə bir neçə prorektorluq (tədris işləri üzrə, elmi işlər üzrə, iqtisadi məsələlər üzrə, inzibati-təsərrüfat işləri üzrə) var idi. Qısa müddətdə ADPU-nun rektoru (1994-1996) vəzifəsində çalışan Nizami Xudiyev 1996-2005-ci illərdə Azərbaycan Dövlət Televiziya və Radio Verilişləri Şirkətinin, 2005-2006-cı illərdə Azərbaycan Dövlət Televiziya və Radio Verilişləri Qapalı Səhmdar Cəmiyyətinin sədri olub.

***Nizami Mənaf oğlu Xudiyev***



*Ulu öndər Heydər Əliyev və prof. Nizami Xudiyev*

Prof.Nizami Xudiyev 1995 və 2000-ci ildə 2 saylı Şərur-Babək seçki dairəsindən, 2005-ci ildə 56 saylı Xaçmaz kənd seçki dairəsindən Milli Məclisə deputat seçilib, Elm və təhsil məsələləri daimi komissiyasının üzvü olub. Müxtəlif dövlət və media mükafatlarına layiq görülüb. Azərbaycan Milli Elmlər Akademiyasının Dilçilik İnstitutunda, ADPU-da, BDU-da, Naxçıvan Dövlət Universitetində namizədlik və doktorluq dissertasiyaları üzrə Müdafiə Şuralarının üzvü olub, elmi və elmi-pedaqoji kadr hazırlığında səmərəli fəaliyyət göstərib. Lütfi-Zadə adına Amerika Beynəlxalq Müasir Elmlər Akademiyasının və Nyu-York Elmlər Akademiyasının həqiqi üzvü seçilib. O, YAP Siyasi Şurasının və İdarə Heyətinin, Azərbaycan Yazıçılar Birliyinin, Azərbaycan Jurnalistlər Birliyinin, Azərbaycan Ziyalılar Cəmiyyətinin İdarə Heyətinin üzvüdür.

Prof.Nizami Xudiyev Azərbaycan-Amerika Birləşmiş Ştatları, Azərbaycan - Belarus, Azərbaycan - Böyük Britaniya, Azərbaycan - Hindistan, Azərbaycan - Pakistan, Azərbaycan - Türkiyə parlamentlərarası əlaqələr üzrə işçi qruplarının üzvü olub. 2001-ci ildə İngiltərənin Kembric Bey nəlxalq Bioqrafiya Mərkəzi tərəfindən "İlin beynəlxalq ziyalısı" adına və "Qızıl medal"a" layiq görülüb. Eyni zamanda Kembric Beynəlxalq Bioqrafiya İnstitutu prof. Nizami Xudiyevi 2002-ci ildə "XXI əsrin intellektualı" seçərək onu xüsusi medal və diplomla təltif edib. Elmi uğurlarına və bu sahədəki səmərəli fəaliyyətinə görə Kembric Beynəlxalq Bioqrafiya İnstitutunun baş direktorunun müavini vəzifəsinə seçilib. 2002-ci ildə Amerika Birləşmiş Ştat-

ları Bioqrafiya İnstitutunun üzvü seçilib və adı "XXI əsrin böyük ziyalıları" (ali nəşr) kitabına daxil edilib. 2004-cü ildə Ankara şəhərində keçirilmiş Türk dili Qurultayında "Türk dilinə xidmət" ödülü ilə mükafatlandırılıb. Amerikanın Dünya Ədəbiyyatı Akademiyasının "Humanitar və fəlsəfə elmləri üzrə Sokrat sədri" (2004) seçilib və Kembric Beynəlxalq Bioqrafiya İnstitutunun "Beynəlxalq Şərəf Ordeni" (2004) ilə təltif edilib. Amerika Birləşmiş Ştatları Bioqrafiya İnstitutu tərəfindən "2005-ci İlin Adamı" seçilib və xatirə medalı ilə təltif edilib. Müxtəlif elmi nəşrlərin redaksiya heyətinin üzvüdür. Dövlət, hökumət və parlament nümayəndə heyətinin tərkibində xarici ölkələrdə respublikamızı təmsil edib.

Çoxşaxəli yaradıcılıq bioqrafiyasına malik olan N.Xudiyev 2001-ci ildə Əməkdar elm xadimi fəxri adına layiq görülüb. O, dilçilik elminin və türkologiyanın müxtəlif sahələrinə aid 60-dan çox monoqrafiya, dərslik və dərs vəsaitinin, kitab və kitabçanın, 50 -dan çox sənədli filmin ssenarasinin, 400-dən artıq elmi və publisistik məqalənin müəllifidir. Onun yaradıcılığında ədəbi dil tarixi, ümumi dilçilik, türkoloji dilçilik, müasir Azərbaycan dili, tərcümə və bədii əsərlərin dili, elektron kütləvi informasiya vasitələrinin dili, ali və orta məktəb didaktikası mühüm yer tutur.

Nizami Xudiyev orta məktəblərin 3, 4, 5, 10, 11-ci sinifləri üçün "Azərbaycan dili", 2-ci sinifləri üçün "Oxu", xüsusi məktəblər üçün "Azərbaycan dili" və "Ana dili" dərsliklərinin müəlliflərindən biridir. "Azərbaycan ədəbi dilinin təşəkkülü" (1990), "Tərcümə ədəbiyyatı və ədəbi dilimiz" (1991), "Azərbaycan ədəbi dili tarixi" (1995), "Azərbaycan ədəbi dilinin sovet dövrü" (1989), "Heydər Əliyev və Azərbaycan dili" (1997), "Xalq və dövlət naminə" (2004), "Yazıçı dili və üslubu" (1988), "Radio, televiziya və ədəbi dil" (2007), "Xalqın tarixi haqqı: dilimiz, varlığımız" (2003), "Zamanın axarı ilə (I-II" (2004, 2008), "Şəxsiyyət və zaman" (2003), "Uğurlu yolun layiqli davamçısı" (2007), "YAP dünənin, bu günün, sabahın partiyasıdır" (2007), "Cənubi Azərbaycanda ədəbi dilimizin dünəni və bu günü" (2011), "Qədim türk yazılı abidələrinin dili" (2015) və digər fundamental əsərlərin müəllifidir. Onun bir sıra kitab və məqalələri xarici ölkələrdə (İran, Türkiyə, Rusiya, Almaniya, İraq, İsveçrə, Qazaxıstan, Özbəkistan, Türkmənistan, Qırğızıstan və s.) nəşr olunub.

Professor N.Xudiyev onun həyatında mühüm rol oynamış görkəmli dilçi-alim Əbdüləzəl Dəmirçizadənin 110 illiyinə həsr olunmuş "Professor Ə.Dəmirçizadə dünyası" (2019) adlı monoqrafiya hazırlayıb. Monoqrafiyada Ə.Dəmirçizadənin həyatı, yaradıcılığı və elmi-pedaqoji fəaliyyəti haqqında xatirə, düşüncə və mülahizələr öz əksini tapıb.

***Nizami Mənaf oğlu Xudiyev***

Nizami Xudiyev türkoloq-alim kimi respublikamızda və Moskva, Nalçik, Bişkek, Ufa, Aşqabad, Daşkənd, Gülüstan, Alma-Ata, Ankara, İstanbul, Əskişəhər, İzmir, Adana, Konya və başqa şəhərlərdə keçirilən nüfuzlu türkoloji tədbirlərin – qurultay, beynəlxalq simpozium və elmi konfransların nümayəndəsi olub, bu mötəbər toplantılarda elmi məruzələrlə çıxış edib.

Nizami Xudiyev Azərbaycan Respublikasının ictimai-siyasi və mədəni həyatında fəal iştirakına görə 2009-cu ildə "Şöhrət" ordeni, 2012-ci ildə "Azərbaycan Respublikası Qabaqcıl təhsil işçisi" döş nişanı, 2013-cü ildə "Ən yaxşı vətənpərvər tədqiqatçı alim "Qızıl medalı ilə təltif edilib. Azərbaycan Respublikasının Prezidenti İ.Əliyevin 4 aprel 2019-cu il tarixli Sərəncamı ilə prof.N.Xudiyev respublikanın ictimai-siyasi həyatında fəal iştirakına görə Azərbaycan Respublikası Prezidentinin fərdi təqaüdünə layiq görülüb. Azərbaycan Dövlət Pedaqoji Universitetinin, müxtəlif təşkilatların və media qurumlarının Fəxri Fərmanı ilə təltif olunub.



*Prof. Nizami Xudiyevin 70 illik yubileyində:*
*Soldan: prof N.Xudiyev, Baş nazirin müavini Əli Əhmədov, ADPU-nun rektoru, prof. Cəfər Cəfərov və rektorun köməkçisi Riyad Rüstəmli*

10 aprel 2019-cu ildə ADPU-nun möhtəşəm zalında professor Nizami Xudiyevin 70 illik yubileyinə və elmi-pedaqoji fəaliyyətinin 50 illiyinə həsr olunmuş tədbir keçirilmişdir. Tədbirdə ADPU-nun rektoru, professor Cəfər Cəfərov, Baş Nazirin müavini Əli Əhmədov, akademik İsa Həbibbəyli, akademik Kamal Abdulla, akademik Nizami Cəfərov, akademik Möhsün Nağısoy-



*ADPU-nun rektoru, prof Cəfər Cəfərov prof. Nizami Xudiyevi 70 illik yubileyi münasibəti ilə təbrik edərkən*

lu, AMEA-nın müxbir üzvü, prof. Vəli Əliyev, prof. Zahid Xəlil, prof. Qulu Məhərrəmli, filologiya üzrə elmlər doktoru İlham Cəfərsoy çıxış edərək professor N.Xudiyevin xeyirxah, nəcib, qayğıkeş insan, dəyərli ziyalı, fədakar alim, yüksək səviyyəli peşəkar mütəxəssis, bacarıqlı elm və təhsil təşkilatçısı, ölkəmizin ictimai-siyasi həyatında fəal iştirak edən əsl vətəndaş olduğunu, dövlətə və dövlətçiliyə sədaqətlə xidmət etdiyini bildirdilər. Prof.B.Xəlilov "Professor Nizami Xudiyevin elmi-pedaqoji və ictimai-siyasi fəaliyyəti" mövzusunda məruzə ilə çıxış edərək professor N. Xudiyevi zəngin, mənalı və şərəfli ömür yolu keçən, Azərbaycan dilçiliyində öz mövqeyi, dəst-xətti olan görkəmli dilçi-alim, istedadlı və təcrübəli müəllim kimi səciyyələndirdi.

Tədbirdə Azərbaycan Təhsil İşçiləri Azad Həmkarlar İttifaqı Respublika Komitəsinin sədr müavini Mirzə Cəfərzadə professor N.Xudiyevə Komitənin yubiley medalını təqdim etdi. Professor N.Xudiyev çıxış edərək yubiley tədbirinin təşkilatçılarına təşəkkür etdi, bundan sonra da xalqa, dövlətə sədaqətlə, vicdanla xidmət edəcəyini bildirdi.

**Ədəbiyyat**

1. Y.Məmmədov.Azərbaycan Dövlət Pedaqoji Universiteti-90.Bakı, Təhsil, 2012, s.132
2. Nizami Manaf oğlu Xudiyev.Biblioqrafiya.Bakı, Elm,2002
3. Xudiyev N. Ömürdən səhifələr.Bakı, Elm və təhsil, 2018

***Nizami Mənaf oğlu Xudiyev***



**BƏHLUL İSFƏNDİYAR OĞLU AĞAYEV**
*biologiya elmləri doktoru, professor (1937)*

Bəhlul İsfəndiyar oğlu Ağayev 1937-ci ilin oktyabr ayının 28-də Qərbi Azərbaycanın Qafan rayonunun Pəyəhan kəndində anadan olmuşdur.

1956-cı ildə Qafan rayon Gığı kənd orta məktəbini, 1963-cü ildə Azərbaycan Dövlət Universitetini bitirmişdir. 1963-1970-ci illərdə Sabirabad və Saatlı rayonlarında müəllim işləmişdir. 1966-cı ildə Azərbaycan EA Zoologiya İnstitutunun aspirantura şöbəsinə daxil olmuşdur. 1971-ci ildə namizədlik dissertasiyası müdafiə edərək biologiya elmləri namizədi alimlik dərəcəsi almışdır. 1990-cı ildə Kiyev şəhərində Ukrayna Elmlər Akademiyasının Zoologiya İnstitutunda "Şərqi Zaqafqaziyanın şıqqıltılı böcəkləri (Elateridae, Coleoptera)" mövzusunda dissertasiya müdafiə edərək biologiya elmləri doktoru elmi dərəcəsini almışdır.

1970-ci ildən taleyini Azərbaycan Dövlət Pedaqoji İnstitutunun (indiki ADPU) Zoologiya kafedrası ilə bağlamışdır. O, burada laborant, assistent, baş müəllim, dosent (1977-1991), professor (1991-2017) vəzifələrində işləmişdir. 1973-1977-ci illərdə Kimya-biologiya fakültəsinin dekan müavini olmuşdur. 1977-2017-ci illərdə Zoologiya kafedrasına rəhbərlik etmişdir.

Prof.Bəhlul Ağayev 1994-1996-cı illərdə ADPU-nun tədris işləri üzrə prorektoru, 1996-2006-cı illlərdə rektoru vəzifəsində çalışmışdır.

Dövlətə və dövlətçiliyə sədaqəti ilə seçilən ADPU-nun professor-müəllim və tələbə heyəti professor Bəhlul Ağayevin rektor olduğu illərdə də ictimai-siyasi fəallığı ilə seçilmişdir. Həmin illərdə, eləcə də sonralar Pedaqoji Universitet Səbail rayonunda siyasi tədbirlərin keçirildiyi mərkəzə çevrilmidir. Burada dövlətçiliyə qarşı zidd hərəkət edən müxalif qüvvənin for-



*Rektorluqda müşavirə*

malaşmasına imkan verilməmişdir. Azərbaycan Respublikasının Prezidenti Heydər Əliyevin iqtisadi-siyasi, elmi-mədəni və dövlətçiliklə bağlı həyata keçirdiyi tədbirlər birmənalı olaraq dəstəklənmiş, tələbələrdə dövlətçilik təfəkkürünün formalaşması istiqamətində çoxşaxəli işlər görülmüşdür. Ümummilli lider Heydər Əliyev haqq dünyasına qovuşduqdan sonra rektor Bəhlul Ağayevin təşəbbüsü ilə Azərbaycan Dövlət Pedaqoji Universitetində onun heykəli ucaldılmışdır. Ali təhsil müəssisələri içərisində ilk dəfə ADPU-da Ulu öndərin abidəsinin ucaldılması bir neçə cəhətdən əhəmiyyətli idi.

*Birincisi,* Heydər Əliyev sözün həqiqi mənasında müəllim idi; o, Naxçıvan Pedaqoji Texnikumunun və ADU-nun Tarix fakültəsinin məzunu olmuşdu.

*İkincisi,* Heydər Əliyev bizim universitetin hamisi və qayğıkeşi idi, bir neçə dəfə burada olmuş, professor-müəllim və tələbə kollektivi ilə görüşmüş, qəbul imtahanını izləmiş, 2 dəfə yüksək dövlət mükafatını rəhbərliyə təqdim etmiş, xeyli əməkdaşın mükafatlandırılmasına xeyir-dua vermişdi.

*Üçüncüsü,* Heydər Əliyev bütövlükdə Azərbaycan cəmiyyətinin müəllimi, müəllimlər müəllimi idi. Cəmiyyətdə müəllim nüfuzunun yüksəldilməsində onun böyük xidmətləri olmuşdu.

*Dördüncüsü,* gələcəyin müəllimlərində azərbaycançılıq ideologiyasının formalaşmasında Ulu öndərin məğrur duruşlu bu abidəsi böyük rol oynayır. Onu qeyd edim ki, abidənin Milli Məclisin, Səbail Rayon İcraiyyə Hakimiyyətinin, Yeni Azərbaycan Partiyasının yüksək səviyyəli nümayəndələrinin, ali



*ADPU-da 20 Yanvar faciəsinin 10 illiyinə həsr olunmuş tədbir*
*Soldan: prof. Vilayət Əliyev ( prorektor), Hidayət Orucov (Dövlət müşaviri), prof. Bəhlul Ağayev (rektor), Elmar Qasımov (təhsil nazirinin müavini), prof. Məlikməmməd Cəbrayılov (prorektor)*

təhsil müəssisələri rektorlarının və ADPU-nun professor-müəllim heyətinin iştirakı ilə çox təntənəli şəkildə açılışı oldu. Sonra qonaqlar yeni təmir olunmuş "Heydər Əliyev vətənpərvərlik məktəbi"nin auditoriyası (indi "Heydər Əliyev Məktəbinin Lektoriyası" adlanır) ilə tanış oldular. Heydər Əliyevin həyatı və titanik fəaliyyətinin mühüm məqamlarını əks etdirən stendlər, çoxşaxəli fəaliyyəti ilə bağlı Azərbaycan, rus və digər xarici dillərdə nəşr edilən çoxsaylı kitablar, müasir dizayn və təchizat qonaqlarda xoş əhval-ruhiyyə yaratdı. Qonaqların iştirakı ilə Heydər Əliyev vətənpərvərlik məktəbinin ilk məşğələsi oldu.



*Şəhidlər Xiyabanında:*
*prof B.Ağayev (rektor),*
*prof. M.Cəbrayılov (prorektor)*

Universitetimizin brendinə çevrilən Böyk zalın əsaslı şəkildə yenidən təmiri prof.Bəhlul Ağayevin təşəbbüsü ilə Əməkdar rəssam, pedaqogika üzrə

fəlsəfə doktoru, dosent Soltan Atayev tərəfindən həmin illərdə aparılmışdır. Prof.Bəhlul Ağayevin ən mühüm xidmətlərindən biri də kiçik zalın əsaslı şəkildə yenidən qurulmasıdır. Zal müasir dizayn əsasında əsaslı təmir olunmuş, döşəmə və pəncərələr dəyişdirilmiş, öndə rəhbərlik üçün xüsusi kürsü düzəldilmiş, divar boyunca Ulu öndərə həsr edilmiş stendlər düzülmüş, yeni oturacaqlar quraşdırılmış, çilçıraqlar asılmışdır.



*ADPU-nun rektoru, prof Bəhlul Ağayev*
*Zoologiya kafedrasının əməkdaşları ilə (2000)*

Prof.Bəhlul Ağayev 2000-2006-cı illərdə ADPU-nun nəzdində fəaliyyət göstərmiş "Ümumi pedaqogika, pedaqogika və təhsilin tarixi" və "Təlim və tərbiyənin nəzəriyyəsi və metodikası" ixtisasları üzrə Müdafiə Şurasının sədri olmuşdur. Onun rəhbərlik etdiyi Müdafiə Şurasında - 20 fevral 2003-cü ildə "Azərbaycanda pedaqogika elminin inkişaf yolları" mövzusunda doktorluq dissertasiyası müdafiə etmişəm. Mənim dissertasiya müdafiəmin maraqlı bir tarixçəsi var. Əsəri Azərbaycan Respublikası Prezidenti yanında Ali Attestasiya Komissiyasına 1999-cu ilin əvvəlində təqdim etsəm də, müdafiə üçün icazə verməyə tələsmirdilər. Hamı kimi Bəhlul müəllim də məni görən kimi "hələ bir şey yoxdu?"-deyə soruşardı. On ilə yaxın idi ki, respublikada pedaqogika sahəsində doktorluq dissertasiyası müdafiəsi keçirilməmişdi. Nəhayət ki, dissertasiya işinin ADPU-da prof. Bəhlul Ağayevin sədrliyi ilə müdafiəsinə icazə verildi.

***Bəhlul İsfəndiyar oğlu Ağayev***



*Soldan: dos. Y.Əliyev, dos. Y.Qaraməmmədli, prof.B.Ağayev (rektor), prof. N.Xudiyev, prof M.Cəbrayılov, dos. Z.Sərdarov*

Müdafiə prosesində respublikanın pedaqoq alimlərinin, demək olar ki, hamısı iştirak edirdi. Böyük məharət və ustalıqla Müdafiə Şurasının iclasını keçirən Bəhlul müəllim səsvermədən sonra zala enərək anamla görüşdü, onu təbrik edərək dedi:"Anam mənim müdafiəmdə iştirak etməyib, Sizi zalda görəndə elə bil öz anamı gördüm". Onda bir daha hiss etdim ki, inanclı insan olan Bəhlul müəllimin necə incə və yumşaq qəlbi vardır.

Prof.Bəhlul Ağayev 2001-ci ildə Beynəlxalq Elmlər Akademiyasının, 2002-ci ildə Beynəlxalq Pedaqoji Akademiyanın həqiqi üzvü seçilmişdir. O, 7 dərsliyin, 9 dərs vəsaitinin, 4 monoqrafiyanın müəllifi, 12 fənn proqramının tərtibçisidir.100-ə yaxın elmi, metodiki və publisistik məqalənin müəllifidir. "Ümumi entomologiya. I hissə.(1979), "Ümumi entomologiya. II hissə. (1981), "Onurğasızlar zoologiyasından laboratoriya məşğələləri"(1997), "Biologiyadan suallar və cavablar: (sınaq testləri ilə)" (1999), "Onurğasızlar zoologiyasından praktikum" (1993), "Biologiya (Sorğu materialları) (1998), "Zoocoğrafiya (Zoologiyanın əsasları ilə) (1999), "Onurğasızlar zoologiyası" (1985) "Ümumi entomologiya" (2004), "Onurğasızlar zoologiyasından laboratoriya məşğələləri" (2004), "Onurğasızlar zoologiyası" (2008) dərslik və dərs vəsaitləri tələbələr üçün dəyərli mənbədir.

Bəhlul Ağayev 2017-ci ildən ADPU-nun Bioloiya və onun tədrisi metodikası kafedrasının professorudur.

***Bəhlul İsfəndiyar oğlu Ağayev***



**YUSİF ƏBÜLFƏT OĞLU MƏMMƏDOV**

*AMEA-nın həqiqi üzvü, ,fizika-riyaziyyat elmləri doktoru, professor, Əməkdar elm xadimi (1950)*

Yusif Əbülfət oğlu Məmmədov 24 yanvar 1950-ci ildə Qərbi Azərbaycanın Sisyan rayonunun Dəstəgird qəsəbəsində anadan olub.1956-1966-cı illərdə qəsəbədəki orta məktəbdə oxuyub və oranı qızıl medalla bitirib. 1966-1971-ci illərdə Azərbaycan Dövlət Universitetinin Mexanika-riyaziyyat fakültəsində təhsil alıb. Universiteti fərqlənmə diplomu ilə bitirən Y.Məmmədov akademik Məcid Rəsulovun tövsiyəsi ilə Riyazi fizika tənlikləri kafedrasında assistent saxlanılıb. 1979-cu ildə həmin kafedrada baş müəllim, 1980-ci ildə dosent, 1991-ci ildə professor vəzifəsinə seçilib.

1992-1993-cü illərdə İstanbul Texniki Universitetində professor kimi çalışıb. 1993-cü ilin axırlarında Bakıya qayıdan Y.Məmmədov BDU-nun Riyazi fizika tənlikləri kafedrasının müdiri, 2000-ci ildə isə Tətbiqi riyaziyyat və kibernetika fakültəsinin dekanı vəzifəsinə seçilib.

2004-2006-cı illərdə BDU-nun I prorektoru - elmi işlər üzrə prorektor, 2006 - 2016-cı illərdə Azərbaycan Dövlət Pedaqoji Universitetinin rektoru vəzifəsində çalışıb.

Prof.Y.Məmmədovun elmi tədqiqatlarının aparıcı istiqamətini diferensial tənliklər və riyazi fizikanın mühüm problemlərinin araşdırılması təşkil edir. O, akademik M.Rəsulovun layiqli davamçısı olmaqla yanaşı, *adi və xüsusi törəməli diferensial tənliklər nəzəriyyəsinin* digər sahələrində də bir sıra mühüm nəticələr əldə etmişdir. Onun elmi tədqiqatlarının əhatə dairəsi çoxşaxəli olmaqla, riyaziyyatın maraqlı, mürəkkəb və az tədqiq olunan sahələrini əhatə edir. O, universitetin V kursunda oxuyarkən Novosibirsk Dövlət Universitetində keçirilmiş tələbələrin Ümumittifaq elmi konfransında elmi maraq doğuran məruzəsi xüsusi diploma layiq görülüb. Məruzənin materialları Ümumittifaq "Diferensial tənliklər" məcmuəsində dərc edilib.

***Yusif Əbülfət oğlu Məmmədov***




*Soldan: prof.Abdulla Mehrabov, Fəzail Ağamalıyev (Milli Məclisin üzvü), Əli Əhmədov, (YAP sədrinin müavini-icra katibi ), prof. Yusif Məmmədov (rektor), prof. Vilayət Əliyev, akademik Budaq Budaqov, prof. Əjdər Ağayev*

Y.Məmmədov XX əsrin 70-ci illərinin əvvəllərində tipə məxsus olmayan dəyişən əmsallı tənliklər üçün birölçülü Koşi və qarışıq məsələlərin korrekt qoyuluşu problemini tədqiqat predmetinə çevirir. Tədqiqat əsasında alınmış nəticələr "Diferensial tənliklər", "Azərbaycan EA-nın Xəbərləri", "ADU-nun elmi əsərləri" məcmuə və jurnallarında nəşr olunur. O, 1974-cü ildə "Korrekt birölçülü məsələlər və onların həllinin analitik göstərişi" mövzusunda namizədlik dissertasiyası müdafiə edərək fizika-riyaziyyat elmləri namizədi alimlik dərəcəsi alır. Dissertasiyanın ən mühüm yeniliyi ondan ibarət idi ki, o zaman belə məsələlər yalnız sabit əmsallı tənliklər üçün görkəmli rus riyaziyyatçıları Q.E.Şilov, Q.V.Dikopolov tərəfindən öyrənilmişdi. Sonralar Y. Məmmədov 70-ci illərin axırlarında "Birkhof və Tamarkin mənada requlyar olmayan spektral məsələlər və uyğun qarışıq məsələlərin" tədqiqi ilə məşğul olur. Bu sahədə apardığı sistemli araşdırmalar ona uğur qazandırır. "Birkhof və Tamarkin mənada requlyar olmayan spektral məsələlər və uyğun qarışıq məsələlər"in tədqiqi ilə bağlı dəyərli nəticələr əldə edir. Bu sahədə ilk nəticələrdən biri də görkəmli rus riyaziyyatçıları A.A.Şkalikov və A.P.Xromovla yanaşı, həm də Y. Məmmədova məxsusdur. Onun əsərlərində diferensial operatorların rasional dəstəsi üçün requlyarlıq, sanki requlyarlıq və nor-

mallıq problemləri tədqiq olunmuş, ilk dəfə olaraq belə operatorların məxsusi və qoşma elementləri üzrə ayrılış düsturu verilmişdir. O, ilk dəfə cırlaşan adi diferensial operatorlar üçün sonsuz tərtibli məxsusi ədədlərin varlığını göstərmiş, məxsusi ədədlər çoxluğunun sonlu limit nöqtələri ətrafında requl-




*ADPU-nun 85 illik yubiley tədbiri*
*Soldan: rektor, prof Y.Məmmədov, Təhsil naziri, prof. M.Mərdanov, Səbail RİH-nin başçısı S.Ələkbərov (2006)*

yarlıq, sanki requlyarlıq və normallıq anlayışlarının elmi əsaslarını vermişdir. Uyğun qarışıq məsələləri tədqiq edən prof.Yusif Məmmədov bu məsələlər üçün İ.T.Petrovskinin Koşi məsələlərinin korrektliyi üçün verdiyi məşhur “A” şərtinin analoqunu tapmışdır. Bununla o, eyni zamanda Sobolyev-Qalperin tipli tənliklər üçün qarışıq məsələlərin həllinə baza yaratmış, ilk dəfə olaraq çıxıqlar üsulunun müstəvinin sonlu hissəsində sıxlaşan məxsusi ədədlər çoxluğuna malik birölçülü qarışıq məsələlərin həllinə tətbiqinin mümkünlüyünü isbat etmişdir. O, sübut etməyə nail olmuşdur ki, İ.Q.Petrovski mənada korrekt sistemlər üçün requlyar sərhəd şərtli qeyri-korrekt qarışıq məsələlər və eləcə də qeyri-korrekt sistemlər üçün korrekt qarışıq məsələlər də mövcuddur.

Onun bu sahədə tədqiqatları 1990-cı ildə Tbilisi Riyaziyyat İnstitutunun İxtisaslaşmış Dissertasiya Şurasında müdafiə etdiyi “Ümumi şəkilli adi diferensial tənliklər sistemi üçün spektral məsələlərin tədqiqi və uyğun qarışıq məsələlərin həlli üçün çıxıqlar üsulunun əsaslandırılması” mövzusunda doktorluq dissertasiyasında ümumiləşdirilmişdir. Əldə olunmuş nəticələr “Diferensial tənliklər”, “SSRİ EA-nın məruzələri”, “Azərbaycan EA-nın Xəbərləri” jurnallarında öz əksini tapmışdır. Prof.Y.Məmmədov 1991-1998-ci illərdə

bir sıra yeni, praktik və nəzəri əhəmiyyətli nəticələr əldə etmişdir. Tətbiqi əhəmiyyətli işləri içərisində ən mühümləri kimi onun özülü elastik mühitdə dalğanın yayılması probleminin model tənliyi üçün qarışıq məsələlərin həlli sxemini əsaslandırmasını, eksponensial strafikasiyalı (laylanmış) mayelərin dinamikası tənlikləri üçün ümumi şəkilli birölçülü qarışıq məsələləri tam tədqiq etməsini, cırlaşan sərhəd rejimində elektrik dövrəsində sönmə dekrementinin loqarifmik artım sürətini ortaya çıxar.masını, Şredinger tipinə cırlaşan parabolik tənliklər üçün ilk dəfə olaraq qarışıq məsələnin həllinin varlığı və yeganəliyini isbat etməsini və həll üçün analitik ifadə tapmasını göstərmək olar. Onun ikitərtibli adi diferensial tənliklər üçün spektrial məsələnin requlyarlığının və istənilən dərəcədən sanki requlyarlığının potensial funksiyasının periodiklik xassəsi ilə ifadə olunan meyarını tapması çox mühüm nəzəri nəticə kimi qiymətləndirilir. Əldə olunmuş bu nəticələr "Azərbaycan EA-nın məruzələri", "Azərbaycan EA-nın Riyaziyyat və Mexanika İnstitutunun əsərləri", "Turkish journal of Mathematics", "Commun. Theor. Phys" (Beijing, China) və s. jurnallarda nəşr olunmuşdu.




*Hacəttəpə Universitetinin rektoru, prof.T.Özgen, fakültə dekanı,prof. B.Akkoyunlu, ADPU-nun rektoru, prof.Y.Məmmədov (2011)*

Prof.Y.Məmmədov klassik bir problemi ciddi kompleks sıxlıq funksiyalı Şturum-Liuvil tənliyi üçün məxsusi ədədlər haqqında məsələni orijinal ideyalarla tədqiq edərək, analitik sıxlıq funksiyası halında məxsusi ədədlərin asimptotikasını tapmışdır. O, bu məsələ haqqında Azərbaycan Riyaziyyat Cəmiyyətinin iclasında məruzə etmiş, tədqiqatın əsas ideyalarını "BDU-nun xəbərləri" məcmuəsində (1998), tezislərini isə Afinada keçirilmiş "Riyazi anaiz və onun tətbiqləri" (2000) və M.V.Lomonosov adına MDU-da akademik İ.Q.Petrovskinin xatirəsinə həsr olunmuş Beynəlxalq konfransların materiallarında (2001) nəşr etdirmişdir. Tədqiqatın əhəmiyyəti və dəyərini göstərmək üçün qeyd edək ki, bu sahədə nüfuzlu alim sayılan M.V.Fedoryuk "Асимитотические методы для дифференциальных уравнений" (M., «Наука», 1983) monoqrafiyasının 127-ci səhifəsində yazmışdır: "Bu istiqamətdə bir nəticə belə məlum deyil və ehtimal ki, belə assimptotik düsturlar ola bilməz". Prof Y.Məmmədov Moskva, Novosibirsk, Tbilisi, Afina, İstanbul, Zəncan şəhərlərində keçirilmiş müxtəlif




*ADPU-nun Pedaqoji fakültəsinin 50 illik yubiley tədbiri*
*Soldan: Hacəttəpə Universitetinin fakültə dekanı, prof B.Akkoyunlu, Təhsil naziri M.Mərdanov, rektor, prof. Y.Məmmədov, AMEA-nın Şərqşünaslıq İnstitutunun direktoru, akademik G.Baxşəliyeva, Pedaqoji fakültənin dekanı, prof. F.Rüstəmov (2011)*

miqyaslı konfranslarda Azərbaycan riyaziyyat elmini layiqincə təmsil etmişdir. Onun məruzələri V.İ.Steklov adına Riyaziyyat İnstitutunun, MDU-nun mexanika-riyaziyyat, riyaziyyat və kibernetika fakültələrinin, Novosibirsk Dövlət Universitetinin, Ukrayna EA–nın Tətbiqi Riyaziyyat İnstitutunun, Tbilisi Riyaziyyat İnstitutunun elmi seminarlarında görkəmli riyaziyyatçı alimlərin (V.P.Mixaylov, A.A.Dezin, A.Q.Kostyuçenko, A.A.Şkalikov, A.Q.Şveşnikov, S.A.Qabov, L.V.Skrıpnik, M.V.Fedoryuk, V.N.Vraqov, İ.T.Kıquradze və b.) böyük marağına səbəb olmuşdur.

Prof. Yusif Məmmədovun fəaliyyət istiqamətlərindən birini də milli riyaziyyatçı kadrların hazırlanması təşkil edir. Onun rəhbərliyi ilə 20 fəlsəfə doktoru və 3 elmlər doktoru dissertasiyası müdafiə olunmuşdur. O, çoxsaylı fəlsəfə doktoru və elmlər doktoru dissertasiyalarının rəsmi opponenti olmuşdur. BDU və AMEA-nın Riyaziyyat və Mexanika İnstitutunun nəzdində elmlər doktoru və fəlsəfə doktoru alimlik dərəcələri verən Müdafiə Şurasının üzvü kimi səmərəli fəaliyyət göstərmiş, ayrı-ayrı vaxtlarda ADPU-nun nəzdindəki Müdafiə Şurasının və Azərbaycan Respublikası Prezidenti yanında AAK-ın riyaziyyat və mexanika elmləri üzrə Ekspert Şurasının sədri olmuşdur. O,




*ADPU-da prof.Mərdan Muradxanovun anadan olmasının 100 illiyinə həsr olunmuş tədbir*

Təhsil Nazirliyi Kollegiyasının, YUNESKO-nun “Elmi biliklərin və texnologiyaların etikası” Azərbaycan Komitəsinin üzvü, Təhsil Nazirliyi nəzdində fəaliyyət göstərən fasiləsiz pedaqoji təhsil üzrə Koordinasiya Şurasının sədri olmuşdur. “ADPU-nun Xəbərləri” elmi məcmuəsinin baş redaktoru, “AMEA-nın Xəbərləri”, “BDU-nun Xəbərləri”, “Riyaziyyat və Mexanika İnstitutunun Əsərləri”, “Sumqayıt Dövlət Universitetinin Xəbərləri”, “Kurikulum” jurnallarının redaksiya heyətinin üzvü kimi səmərəli fəaliyyət göstərmişdir. Onun Azərbaycanın və xarici ölkələrin nüfuzlu nəşrlərində 120-dən artıq elmi əsəri nəşr olunmuşdur.

Azərbaycan Respublikasının Prezidenti İ.Əliyevin 21 aprel 2006 -cı il tarixli Sərəncamı ilə o, Azərbaycan Dövlət Pedaqoji Universitetinə rektor vəzifəsinə təyin olunub. Prof.Y.Məmmədovun rektor kimi fəaliyyət göstərdiyi illər respublikada təhsilin bütün səviyyə və pillələrində, o cümlədən ali pedaqoji təhsil sahəsində intensiv islahatlar həyata keçirilirdi. O, Təhsil Nazirliyi nəzdində fəaliyyət göstərən fasiləsiz pedaqoji təhsil üzrə Koordinasiya Şurasının sədri kimi həyata keçirilən islahatların strategiya və taktikasının hazırlanmasında yaxın iştirak edir, işçi komissiyaların səmərəli fəaliyyət göstərmələri üçün öz köməyini əsirgəmirdi. Respublikada müəllim kadrları hazırlığını həyata keçirən təhsil müəssisələrinin professor-müəllimlərinin də təmsil olunduğu Koordinasiya Şurası ali pedaqoji təhsilin məzmununun təkmilləşdirilməsi, yeni tədris planlarının və standartlarının tərtibində uğurlu işlərə imza atdı.

Yeni dövrün çağırışlarına uyğun olaraq ADPU-nun maddi-texniki bazasının möhkəmləndirilməsi və infrastrukturunun yeniləndirilməsi, tədrisin



*ADPU-nun 90 illik yubiley tədbirində*
*Təhsil naziri M.Mərdanov və rektor prof.Y.Məmmədov*

keyfiyyətinin yüksəldilməsi, müəllim kadrları hazırlığının təkmilləşdirilməsi istiqamətində xeyli işlər görüldü. İctimai-siyasi, elmi-pedaqoji və kütləvi tədbirlərin keçirildiyi böyük zal yenidən quruldu, oturacaqlar yeniləndi. Şamaxıda universitetin müəllim-tələbə kollektivi üçün tədris-təcrübə mərkəzinin tikintisinə başlanıldı.

Respublikada tələbələrin təlim nailiyyətlərinin test üsulu ilə qiymətləndirilməsi ilk dəfə ADPU -da həyata keçirildi. "İlin müəllimi", "İlin alimi" müsabiqələri keçirildi, qaliblər mükafatlandırıldı. Universitetin beynəlxalq əlaqələri genişləndi, müxtəlif ölkələrlə tələbə, müəllim mübadiləsi, birgə konfransların və simpoziumların keçirilməsinə diqqət artırıldı, Türkiyənin və Avropanın bir neçə universiteti ilə möhkəm elmi-pedaqoji əlaqə yaradıldı. Yeni elmi-tədqiqat və tədris laboratoriyaları, kompüter mərkəzi quruldu və müasir avadanlıqlarla təchiz edildi. Universitetimiz Avropa Pedaqoji Universitetlərinin Assosiyasına üzv qəbul olundu. Elmi-pedaqoji kadr hazırlığın sahəsində uğurlu addımlar atıldı. Prof.Y.Məmmədovun sədrliyi ilə ADPU-da Ümumi pedaqogika, pedaqogika və təhsilin tarixi, təlim və tərbiyənin nəzəriyyəsi və metodikası ixtisasları üzrə Dissertasiya Şurası yaradıldı.

Yusif müəllimin ən mühüm xidmətlərindən biri də ADPU-nun 85 və 90 illik yubiley tədbirlərini təntənəli şəkildə dövlət səviyyəsində keçirilməsi oldu. Qeyd edək ki, Universitetin yubileyi son dəfə 1981-ci ildə keçirilmişdi. 25 il müddətində Universitetin yubileyinin keçirilməsinə təşəbbüs göstərilsə də



*ADPU-nun rektoru, prof Y.Məmmədov, Pedaqoji fakültənin dekanı, prof F.Rüstəmov (2011)*

buna nail olunmamışdı. Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin sərəncamı ilə keçirilmiş 85 və 90 illik yubiley tədbirlərində Azərbaycanda təhsilin inkişafındakı xidmətlərinə görə ADPU-nun əməkdaşlarından 2 -si "Şöhrət ordeni", 26 -sı "Tərəqqi medalı", 5 -i "Əməkdar elm xadimi", 39 -u "Əməkdar müəllim", 2 -si "Əməkdar jurnalist", 1-i "Əməkdar mühəndis", 1-i "Əməkdar mədəniyyt işçisi" fəxri adlarına, 1 nəfəri isə Azərbaycan Respublikasının fərdi təqaüdünə layiq görüldü.

Prof.Yusif Məmmədovun elmi və pedaqoji fəaliyyəti dövlət tərəfindən yüksək qiymətləndirilib. 2000-ci ildə ona Azərbaycan Respublikası Prezidenti Heydər Əliyevin sərəncamı ilə Əməkdar elm xadimi fəxri adı verilib. 2001-ci ildə Azərbaycan Milli Elmlər Akademiyasının müxbir üzvü, 2017-ci ildə həqiqi üzvü (akademiki) seçilib. 2010-cu ildə Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin Sərəncamı ilə "Şöhrət" ordeni ilə təltif olunub. 2016- 2017-ci illərdə Azərbaycan Respublikası təhsil nazirinin müşaviri vəzifəsində çalışan akademik Yusif Məmmədov hazırda BDU-nun Riyazi fizika tənlikləri kafedrasının müdiri vəzifəsində çalışır.

**Ədəbiyyat**


1. Məmmədov Y. Azərbaycan Dövlət Pedaqoji Universiteti-90.Bakı, Təhsil, 2012, s.163
2. Kərimov M., Hacıyev A. Elmi məktəbi və təşkilatçılığı ilə tanınan alim. "Azərbaycan" qəzeti, 2 yanvar 2010-cu il
3. Rüstəmov F., Rzayev R. İstedadlı alim, görkəmli elm və təhsil təşkilatçısı. "Azərbaycan müəllimi" qəzeti, 22 yanvar 2010-cu il
4. Mehrabov A., Abbasov Ə. Görkəmli riyaziyyatçı alim. "525-ci qəzet", 6 fevral 2010-cu il


***Yusif Əbülfət oğlu Məmmədov***



**CƏFƏR MƏMMƏD OĞLU CƏFƏROV**
*tarix üzrə elmlər doktoru, professor (1960)*

Cəfər Məmməd oğlu Cəfərov 1960-cı il aprel ayının 21-də Naxçıvan şəhərində mühəndis ailəsində anadan olmuşdur. 1977-ci ildə Bakı şəhəri 158 №-li orta məktəbi bitirmiş və Azərbaycan Dövlət Universitetinin Tarix fakültəsinə daxil olmuşdur. 1980-1983-cü illərdə universitetin göndərişi əsasında təhsilini Moskva Dövlət Universitetinin (MDU) Tarix fakültəsində davam etdirmişdir. 1983-cü ildə Moskva Dövlət Universitetinin Tarix fakültəsinin aspiranturasına daxil olmuş, 1987-ci ildə dissertasiya işini müdafiə edərək tarix elmləri namizədi alimlik dərəcəsi almışdır. Moskvada təhsil alan Azərbaycan Tələbə və Aspirantları Şurasının sədr müavini olmuşdur.

1987-1994-cü illərdə Bakı Dövlət Universitetinin Tarix fakültəsində böyük laborant, Azərbaycan tarixi kafedrasında müəllim, baş müəllim, dosent vəzifəsində çalışmışdır. 1990-1994-cü illərdə BDU-da Tarix üzrə İxtisaslaşmış Dissertasiya Şurasının elmi katibi, 1992-1994-cü illərdə Tarix fakültəsinin dekan müavini, 1994-1998-ci illərdə Azərbaycan Respublikası Gənclər və İdman Nazirliyinin Gənclərlə İş üzrə Baş İdarəsinin rəisi vəzifəsində çalışmışdır.

1998-2003-cü illərdə BMT İnkişaf Proqramı və Azərbaycan hökumətinin "Azərbaycanda QHT/İƏT-lərin institusional potensialının artırılması ilə Vətəndaş Cəmiyyətinin gücləndirilməsi" birgə layihəsinin milli koordinatoru olmuşdur. 2000-2001-ci illərdə Fulbrayt proqramının qalibi kimi ABŞ Dövlət Departamentinin təqaüdü ilə Nyu-York Universitetinin Dövlət İdarəçiliyi Məktəbində tədqiqatçı alim vəzifəsində çalışmış, dərslərdə iştirak etmiş, mühazirələrlə çıxış etmişdir. Həmin dövrdə həm də BMT-nin mərkəzi

qərargahında "Elektron Hökumət" layihəsinin icraçılarından biri olmuşdur.

2002-ci ildə Azərbaycan Respublikasının Prezidenti tərəfindən Azərbaycan Respublikasının İnsan Hüquqları üzrə Müvəkkili (Ombudsman) vəzifəsinə təqdim olunan 3 namizəddən biri olmuşdur. 2001-ci ilin noyabr ayında keçirilən Dünya Azərbaycanlılarının I Qurultayında Dünya Azərbaycanlılarını Əlaqələndirmə Şurasının İdarə Heyətinin üzvü seçilmiş, 2003-2004-cü illərdə Beynəlxalq Mətbuat Mərkəzinin (BMM) direktoru vəzifəsində işləmişdir.

2004-2006-cı illərdə BMT İnkişaf Proqramı və Azərbaycan hökumətinin "Azərbaycan Respublikasında yoxsulluğun azaldılması məqsədilə daxili turizmin səmərəli inkişafının təmin olunması üzrə Azərbaycan Respublikasının Gənclər, İdman və Turizm Nazirliyinə institusional yardım" birgə layihəsinin milli koordinatoru olmuşdur.

17 fevral 2010-cu ildə AMEA-nın A.A.Bakıxanov adına Tarix İnstitutunda tarix üzrə elmlər doktoru alimlik dərəcəsi almaq üçün doktorluq dissertasiyası müdafiə edib. 2013-cü ildən professordur.

Azərbaycan tarixinin müasir problemləri, XX əsrin 20-ci illərinin sonu, 30-cu illərdə kənddə mədəni quruculuq işləri, vətəndaş cəmiyyətinin inkişafı, dövlət idarəçiliyi və cəmiyyətin demokratikləşməsi, Azərbaycanda turizmin və ali pedaqoji təhsilin inkişaf perspektivləri ilə bağlı respublikada və xaricdə nəşr olunan 90-dan çox kitabın, tədris-metodiki vəsaitin və elmi məqalənin müəllifidir. 36-dan çox xarici ölkədə keçirilən 100-ə yaxın beynəlxalq seminar, konfrans və simpoziumun iştirakçısı olmuşdur.

Prof.Cəfər Cəfərov elmi-pedaqoji fəaliyyətini təhsil təşkilatçılığı və quruculuğu ilə peşəkarlıqla əlaqələndirməyi bacaran, qurucu rektor imici qazanan azsaylı elm və təhsil xadimlərindən biridir. Azərbaycan Turizm və Menecment Universitetinin təşkili və inkişafının ilk on ili onun çoxşaxəli fəaliyyəti ilə bağlıdır.

Azərbaycan Respublikasının Prezidenti İ.Əliyevin 2005-ci il 25 avqust tarixli Fərmanı və Azərbaycan Respublikası Nazirlər Kabinetinin 2006-cı il 13 fevral tarixli qərarı ilə yaradılan bu universitetin qurucusu prof.Cəfər Cəfərov olub. O, 5 iyul 2006-cı ildə Azərbaycan Turizm İnstitutu adı ilə yaradılan bu təhsil ocağına rektor vəzifəsinə təyin edilib. Onun işgüzarlığı, peşəkarlığı və əzmkarlığı nəticəsində qısa bir müddətdə tədris üçün zəruri olan infrastruktur qurulub, öz missiyası və dəyərləri olan professsor-müəllim və tədris-köməkçi heyət formalaşdırılıb. 15 sentyabr 2006-cı il tarixində 200 tələbə, 1 fakültə və 3 ixtisasla tədris fəaliyyətinə başlayan institut ildən-ilə inkişaf edərək ali təhsil tariximizdə özünəməxsus yer tutub. Dünya təcrübəsindən bəhrələnməklə təhsil sahəsində bir sıra yeniliklərə imza atıb, beynəlxalq standartlara uyğun karyera yönümlü proqramların tədbiqi



*Avstriyanın IMC Krems Tətbiqi Elmlər Universiteti ilə Azərbaycan Turizm və Menecment Universiteti arasında "İkili diplom" proqramına dair əməkdaşlıq müqaviləsinin imzalanma mərasimi*

ilə məşğul olub, beynəlxalq əməkdaşlığa xüsusi önəm verib. Belə ki, ölkə tarixində ilk dəfə 2007-ci ildə Azərbaycan Turizm İnstitutu və Avstriyanın IMC Krems Tətbiqi Elmlər Universiteti ilə bakalavr pilləsi üzrə ikili diplom haqqında müqavilə, 2011-ci ildə isə daha geniş tərkibdə Azərbaycan və Avstriya prezidentləri yanında, Azərbaycan Turizm İnstitutu və Avstriyanın IMC Krems Tətbiqi Elmlər Universiteti arasında magistratura sahəsində əməkdaşlıq müqaviləsi imzalanıb. Avropa Komissiyasının təhsil sahəsində qrant ayırdığı proqramlar çərçivəsində institutun 50-dən artıq əməkdaşı müsabiqə yolu ilə xarici universitetlərə ezam olunub, orada əhəmiyyətli tədqiqatların aparılmasında iştirak edib. İnstitut əməkdaşları Avropa İttifaqının TEMPUS proqramı çərçivəsində həyata keçirilən bir neçə layihədə iştirak edib. Ənənəvi olaraq Fulbrayt, Robert Boş Fondu, Almaniya Beynəlxalq Əməkdaşlıq Təşkilatı, Fransa İnstitutu proqramları çərcivəsində instituta ingilis, alman, fransız və ispan dilini tədris edən xarici mütəxəssislər dəvət olunub. 2008-ci ildə BMTİP və Mədəniyyət və Turizm Nazirliyinin dəstəyi ilə Azərbaycan ali təhsil müəssisələri arasında ilk dəfə olaraq burada Tədqiqat və İnkişaf Mərkəzi qurulub. Mərkəzdə Avropa Komissiyası, BMT-nin İnkişaf Proqramı, Almaniya Beynəlxalq Əməkdaşlıq Təşkilatı, BMU, IUCH/POSC, GFA, Almaniyanın Ekologiya Nazirliyi, Azərbaycan Respublikasının İqtisadi İnkişaf Nazirliyi, ATİB, Azərbaycan Respublikasının Prezidenti yanında QHT-lərə Dövlət Dəstəyi Şurası və digər təşkilat və qurumların dəstəyi ilə ölkəmizin turizm potensialının araşdırılmasına dair 20-dən çox tədqiqat layihəsi həyata keçirilib.

***Cəfər Məmməd oğlu Cəfərov***



*Avstriyanın IMC Krems Tətbiqi Elmlər Universiteti ilə Azərbaycan Turizm və Menecment Universiteti arasında "İkili diplom" proqramına dair əməkdaşlıq müqaviləsinin imzalanma mərasimi*

İnstitut az bir müddət ərzində öz hədəfinə nail olub, regionda turizm ixtisası üzrə yüksəkixtisaslı kadr hazırlığı həyata keçirən təhsil və tədqiqat mərkəzi statusu qazanıb. Ali təhsil ocağı fəaliyyətə başladığı gündən tədris prosesində şəffaflıq təmin edilib, təhsilin məzmununda tətbiqiliyə və beynəlmiləllik prinsiplərinin təmin edilməsinə səy göstərilib. Ölkənin digər ali təhsil müəssisələrindən fərqli olaraq Azərbaycan Turizm İnstitutunda ilk gündən tədrisin Bolonya sisteminin prinsipləri əsasında təşkil edilməsi, Avropa təhsil müəssisələri ilə səmərəli əməkdaşlıq qurmağa imkan verib.

Prof.C.Cəfərovun təşəbbüsü ilə "tədris-təlim-təcrübə-tədqiqat" modelinə üstünlük verən Azərbaycan Turizm İnstitutu bir çox beynəlxalq təşkilatlarda layiqincə təmsil olunub. Onun instituta rəhbərlik etdiyi illərdə 30 xarici ali məktəb, 34 beynəlxalq təşkilat və şəbəkə ilə əlaqələr qurulub, inkişafa və tərəqqiyə hədəflənən müqavilələr imzalanıb. Bağlanmış müqavilələr əsasında institutun tələbələrinin əksəriyyəti Türkiyə, İsrail, Şimali Kipr Türk Cümhuriyyəti, Almaniya,Yunanıstan və bu kimi bir çox ölkələrdə yay tanışlıq və istehsalat təcrübəsi keçiblər. Bu unikal təhsil müəssisəsində ali təhsil pilləsinin bütün səviyyələrində (bakalavriatura, magistratura, doktorantura və əlavə təhsil) kadr hazırlanır. Əlavə təhsil turizm sektorunda işləyən insanların sahə üzrə təhsil almasına imkan yaradır.

***Cəfər Məmməd oğlu Cəfərov***




*ADPU-da Gənclər gününə həsir olunmuş tədbir*

İnstitutda bacarıqlı xidmət personalının hazırlanması üçün Təlim Mərkəzi yaradılmış və həmin mərkəz tərəfindən Bakı ilə yanaşı, turizm potensialının yüksək olduğu bölgələrdə də "Bələdçi", "Turoperator və turagent" və "Qeydiyyat/Ön buro" peşə istiqamətləri üzrə kurslar təşkil olunmuşdur. Məzunların əksəriyyəti ölkənin nüfuzlu turizm müəssisələrində uğurla fəaliyyət göstərirlər. Onlar Azərbaycan Turizm İnstitutunun Məzunları Assosiasiyasını (ATİMA) yaratmış və onu qeyri-hökumət təşkilatı kimi dövlət qeydiyyatından keçirmişlər.

2013-cü ildə institutda turizm və xidmət sahəsində elmi tədqiqatların nəticələrini nəşr etmək məqsədilə prof.Cəfər Cəfərovun baş redaktorluğu ilə "Turizm və qonaqpərvərlik tədqiqatları" adlı elmi jurnal təsis edilmişdir. Jurnal iqtisad, tarix elmləri, sənətşünaslıq və memarlıq elmləri üzrə Azərbaycan Respublikasının Prezidenti yanında Ali Attestasiya Komissiyasının dissertasiyaların əsas nəticələrinin dərc olunması tövsiyə edilən dövri elmi nəşrlərin siyahısına daxil edilmişdir.

Turizm İnstitutunun bazasında Azərbaycan Turizm və Menecment Universitetinin yaradılması ilə bağlı Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin 22 dekabr 2014-cü il tarixli Sərəncamı ilə bu təhsil müəssisəsi özünün inkişafının keyfiyyətcə yeni mərhələsinə qədəm qoymuş, daha böyük layihələrə imza atmışdır.Təkcə onu qeyd etmək kifayətdir ki, elektron universitet ideyası çərçivəsində Azərbaycan Turizm və Menecment Universiteti Maliyyə Nazirliyinin və Təhsil Nazirliyinin sifarişi ilə "SİNAM" şirkətinin




*ATMU-nun rektoru, prof. C.Cəfərov (rektor), Biznez idarəçiliyi fakültəsinin dekanı, dos.S.Əliyev*

hazırladığı "FERABİ" proqramı ilə təchiz olunmuş ilk ali təhsil müəssisəsindən biridir.

Universitetin Kitabxana - İnformasiya Mərkəzinin fondunda turizm və tətbiqi elmlər sahəsi üzrə əməkdaşların müəllifi olduğu, müəssisəyə hədiyyə olunmuş və xaricdən alınmış 16 mindən cox informasiya daşıyıcısı toplanıb. Mərkəz Mədəniyyət və Turizm Nazirliyinin dəstəyi ilə İRBİS-64 avtomatlaşmış kitabxana-informasiya sistemi ilə təchiz edilib və müxtəlif elektron kitabxana şəbəkələrinə qoşulub.

Prof. Cəfər Cəfərovun Azərbaycan Turizm və Menecment Universitetinə rəhbərlik etdiyi 10 il ərzində bu təhsil müəssisəsi sürətli inkişaf yolu keçmiş, kollektivin işgüzarlığı və peşəkarlığı nəticəsində institutdan universitetə çevrilmiş, turizm və menecment üzrə kadr hazırlığında uğurlu nəticələrə imza atmışdır.

Və bir də tale yazısı var ki, ondan qaçmaq olmaz. İnsanlar dünyaya müxtəlif missiyalarla gəlirlər. Millətin milli kimliyinə çevrilən işıqlı zəka sahibləri İlahi missiya daşıyıcılarıdır. Zaman gəlir ki, onlar xalqın mənəviyyat pasportuna çevrilirlər. Təbii ki, belə insanların sırasında məktəb yaradan (xüsusilə də universitet), dərslik yazan və müəllim hazırlayanlar xüsusi hörmətə və ehtirama layiqdirlər. Çünki milli ideologiyanı və millətin mənəviyyatını məhz onlar formalaşdırırlar. Universitetlər milli inkişafın barometridir. Milli elmi potensialın formalaşması universitetlərin müqəddəs divarları arasında baş verir. Milləti yaşadan onun universitetləridir. Universitetlər yaşadıqca qurucularını (ilk rektorlarını) da yaşadırlar. Xoşbəxt həmin insanlardır ki, İlahi quruculuq missiyasını məhz onlara həvalə edib. Azərbaycan Turizm və Menecment Universiteti də professor Cəfər Cəfərovun həyatının ayrılmaz hissəsi olmaqla, yaratdığı ən möhtəşəm əsərdir.

Azərbaycan Respublikası Prezidenti İ.Əliyevin 23 iyun 2016-cı il tarixli sərəncamı ilə prof. Cəfər Cəfərov Azərbaycan Dövlət Pedaqoji Universitetinin rektoru vəzifəsinə təyin olunmuşdur.

***Cəfər Məmməd oğlu Cəfərov***



*Azərbaycan Turizm və Menecment Universitetinin ilk fəxri doktoru Ümumdünya Turizm Təşkilatının Baş katibi Taleb Rifai Elmi Şura üzvləri ilə birlikdə*

Belə deyirlər ki, tarix təkrar olunur. 2 dəfə (1927-1929 və 1941-1943-cü illərdə) Pedaqoji İnstitut Azərbaycan Dövlət Universitetinə birləşdirilib, Azərbaycan SSR Ali Sovetinin 26 mart 1959-ci il tarixli qərarı ilə Azərbaycan Qiyabi Pedaqoji İnstitutu bütövlükdə və 1 iyul 1959-cu il tarixli qərarı ilə isə Gəncə Pedaqoji İnstitutunun Tarix-filologiya fakültəsi Azərbaycan Dövlət Pedaqoji İnstitutunun tərkibinə verilib. Həmişə birləşmələr və ayrılmalar müəyyən problemlər yaradıb.

Prof.C.Cəfərov ADPU-ya rektor təyin edilməmişdən əvvəl həmin birləşmə məsələsi yenidən təkrar olunmuşdu. Azərbaycan Müəllimlər İnstitutunun Azərbaycan Dövlət Pedaqoji Universitetinə (ADPU) qoşulması haqqında Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev 26 noyabr 2015-ci ildə Sərəncam imzalamışdı. Lakin sərəncamın tələbinə uyğun olaraq birləşmə tam başa çatmamışdı. Unifikasiyanı sona çatdırmaq, professor-müəllim və tələbə heyətini yerləşdirmək ağır bir proses idi.

Prof.Cəfər Cəfərovun qətiyyəti nəticəsində bütün obyektiv və subyektiv çətinliklərə, narazılıqlara baxmayaraq birləşmə prosesi qısa bir zamanda başa çatdı, universitetin sakit həyatı bərpa edildi və ciddi quruculuq işlərinə başlanıldı. Azərbaycan Müəllimlər İnstitutunun ADPU-ya birləşməsi və onun filiallarının (Ağcabədi, Cəlilabad, Quba, Şəki və Şamaxı) universitetin strukturuna çevrilməsi nəticəsində ADPU ölkədə pedaqoji kadr hazırlığı ilə məşğul olan




*Soldan:prof.F.Rzayev, prof.C.Cəfərov (rektor), dos, S.Əliyev*

vahid ixtisaslaşmış ali təhsil müəssisəsinə çevrildi. Bununla yanaşı, Nazirlər Kabinetinin 3 fevral 2016-cı il tarixli qərarı ilə Bakı Sənaye-Pedaqoji Kolleci Azərbaycan Dövlət Pedaqoji Kollecinə (ADPK) qoşularaq, sonuncu ADPU-nun nəzdində Azərbaycan Dövlət Pedaqoji Kolleci kimi fəaliyyət göstərməyə başladı.

Bununla da ADPU inkişafının keyfiyyətcə yeni mərhələsinə qədəm qoydu. Bu məqsədlə 2016-cı ilin ikinci yarısında Təhsil Nazirliyinin tapşırığı və prof. Cəfər Cəfərovun rəhbərliyi ilə universitetin "Transformasiya üçün Yol Xəritəsi" və "Tədrisin Keyfiyyətinin Yüksəldilməsinə dair 10 illik Strateji İnkişaf Planı" adlı iki fərqli strateji inkişaf layihələri hazırlandı.

Yerli və beynəlxalq ekspertlərin ADPU-da apardığı tədqiqatlar nəticəsində verdikləri təklifləri nəzərə alaraq "ADPU-2021" Strateji İnkişaf Planı hazırlandı və icrasına başlanıldı.

Pedaqoji kadr hazılrlığının keyfiyyətini yüksəltmək məqsədilə öncə Pedaqoji Universitetdə prof.Cəfər Cəfərovun rəhbərliyi ilə əsaslı islahatların aparılmasına başlanıldı. ADPU-nun "Səbail" tədris korpusunda əsaslı təmir işləri həyata keçirildi. Heydər Əliyev Fondunun maliyyə dəstəyi ilə 14 mərtəbəli tədris binası əsaslı şəkildə yenidən quruldu.

İnfrastrukturun və insan resurslarının yeniləşdirilməsi, sağlam təhsil mühitinin yaradılması, ümumtəhsil məktəbləri və xarici ölkələrin pedaqoji kadr



*Azərbaycan Respublikası Prezidentinin Administrasiyasının humanitar siyasət məsələləri şöbəsinin müdiri prof. Fərəh Əliyeva, Azərbaycan Respublikası Təhsil naziri Ceyhun Bayramov və ADPU-nun rektoru, prof.Cəfər Cəfərov təhsil sərgisində (2018)*



*Azərbaycan Respublikası Prezidentinin Administrasiyasının humanitar siyasət məsələləri şöbəsinin müdiri prof. Fərəh Əliyeva, Azərbaycan Respublikası Təhsil naziri Ceyhun Bayramov və ADPU-nun rektoru, prof.Cəfər Cəfərov təhsil sərgisində (2019)*

***Cəfər Məmməd oğlu Cəfərov***




*ADPU-da Humanist pedaqogika üzrə II beynəlxalq konfrans.
Sağdan: prof. C.Cəfərov (rektor), Təhsil naziri C.Bayramov, akademik
Ş.Amonaşvili, akademik İ.Həbibbəyli*



*ADPU-da doktorant və gənc tədqiqatçıların XXII Respublika konfransı.
Soldan: ADMİU-nun rektoru, prof. C.Mahmudova, BMU-nun rektoru,
prof. H.Məmmədov, AAK sədri,prof. F.Mustafayev, Elmin İnkişaf Fondunun
icraçı direktoru, dos E.Babayev, Təhsil naziri C.Bayramov, ADPU-nun rektoru,
prof.C.Cəfərov, ADİU-nun rektoru, prof. Ə.Muradov, ADNSU-nun rektoru,
prof. M.Babanlı (2018)*

***Cəfər Məmməd oğlu Cəfərov***





*ADPU-nun rektoru, prof.C.Cəfərov Heydər Əliyev Mərkəzində ulu öndərin xatirəsinə həsr olunmuş tədbirdə çıxış edərkən*



*ADPU-da TÜRKSOY kafedrasının açılışı. Soldan, ön sırada: prof.E. Quliyev, dos.L.Həsənova, rektor, prof.C.Cəfərov, TÜRKSOY-un baş katibi prof.D.Kaseinov, dos.Ş.Əliyeva, dos.Ş.Pənahov; arxa sırada: dos.V.İsrafilov, prof.Ə.Tanrıverdi, prof.Y.Babayev, prof.F.Rüstəmov, Elçin Qafarlı, M.Beppayev, prof.A.Zamanov, prof.B.Xəlilov, A.Atabiyev (2018)*

***Cəfər Məmməd oğlu Cəfərov***




*Sağdan: dos.R.Sadıqov (şöbə müdiri), prof.A.Zamanov (prorektor), prof.F.Rzayev (prorektor), K.Pirverdiyeva (prorektor), E.Əmrullayev (Təhsil naziri), prof. C.Cəfərov (rektor), dos.E.Aslanov (prorektor), Ü.Mehdiyev (rektorun müşaviri)*




*Sağdan: prof.A.Zamanov (prorektor), prof.M.Hüseynova (prorektor), prof C.Cəfərov (rektor), dos.E.Aslanov (prorektor), prof F.Rzayev (prorektor)*




*Bakı Dövlət Universitetində Pedaqoji Universitetin 100 illik yubileyinə həsr olunmuş tədbir*



*Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universitetində Pedaqoji Universitetin 100 illik yubiley tədbiri*



*Rektor, prof.C.Cəfərov Dövlət Təhlükəsizliyi Xidmətinin Heydər Əliyev adına Akademiyasında xatirə kitabını imzalayarkən*



*6 saylı məktəb - liseydə "Novruz mühazirələri" (2017)*

***Cəfər Məmməd oğlu Cəfərov***

hazırlığını həyata keçirən ali məktəbləri ilə əlaqələrin genişləndirilməsi, "Açıq qapı" günlərinin keçirilməsi, yüksək bal toplayan tələbələrin universitetə cəlbi, müəllim kadrları hazırlığının nəzəri və praktiki problemləri ilə bağlı respublika və beynəlxalq səviyyəli konfransların təşkili, xarici və milli təhsil ekspert-



*ADPU-da Beynəlxalq qadınlar gününə həsr olunmuş tədbir*

lərinin, elm və sənət adamlarının iştirakı ilə "Pedaqoji Forum"un təşkili, xarici ölkələrin müvafiq universitetləri ilə elmi əlaqələrin və qarşılıqlı əməkdaşlığın qurulması, adlı tələbə təqaüdlərinin təsisi, universitetdə nəşr olunan jurnalların elmi statusunun və periodikliyinin təmin edilməsi ilə bağlı uğurlu layihələr həyata keçirildi. Kafedra müdiri, professor, dosent, baş müəllim və müəllim vəzifələrinin tutulması qaydalarında mütərəqqi dəyişiklik edildi, müəllimlərin əməkhaqqına illik fəaliyyətlərinə görə əlavələr olundu.

Yeni yanaşma universitet əməkdaşlarının seçki sistemi və tədris prosesi ilə bağlı baxışlarında köklü dəyişikliyin yaranmasına səbəb olmaqla yanaşı, elmi-metodiki hazırlığı, İKT bacarığı, yeni təlim texnologiyalarına bələdliyi ilə seçilən müəllimlərin uğur qazanmasını təmin edib. Professor-müəllimlərin elmi-pedaqoji fəaliyyətinin reytinq sistemi ilə qiymətləndirilməsi, əməyinin stimullaşdırılması, tələbə nailiyyətlərinin qiymətləndirilməsində şəffaflığın, obyektivliyin və humanizmin tam bərqərar edilməsi təlimin keyfiyyətinin yüksəlməsinə səbəb olmaqla yanaşı, ölkədə Azərbaycan Dövlət Pedaqoji Universiteti ilə bağlı fərqli bir imicin formalaşmasını təmin etmişdir.

Bu müsbət imic təbii ki, ADPU əməkdaşlarının məsuliyyətini artırmış, ali pedaqoji təhsildə köklü məzmun islahatlarının həyata keçirilməsinə istiqamətləndirmişdir. ADPU-dan millətin, cəmiyyətin və dövlətin gözləntiləri çoxdur.

***Cəfər Məmməd oğlu Cəfərov***

Həyata keçirilən bu tədbirlər nəticəsində ADPU-da son 3 ildə xeyli uğurlu nəticələr əldə edilmişdir. Belə ki, 2018-ci ildə qəbul planı 98,7% dolmuşdur. 2014/15-ci tədris ilində ADPU-ya qəbul olunmuş tələbələrdən cəmi 20 nəfəri 500-dən çox bal topladığı halda, 2017/2018-ci tədris ilində 273 nəfər, 2018/19-cu tədris ilində isə 562 nəfər (onlardan 35-i filiallar üzrə) olmuşdur. Bu da 5 ildə təxminən 27 dəfə, 1 il ərzində isə 2 dəfə artım deməkdir. Həmçinin 2014/15-ci tədris ilində ADPU-ya qəbul olunanlar arasında 600-dən çox bal toplayan tələbə olmadığı halda, 2017/18-ci tədris ilində 2 nəfər, 2018/19-cu tədris ilində isə 16 nəfər (onlardan 4-ü filiallar üzrə) ADPU-nu seçmişdir.



*Müəllimliyə qəbul imtahanında yüksək nəticə göstərən məzunların bir qrupu ilə rektorluqda görüş (2019)*

2019-2020-ci tədris ilində ADPU-ya ali təhsilin bakalavriat səviyyəsində 8 fakültə, 22 ixtisas üzrə 2293 nəfər tələbə qəbul olunub. 1441 nəfər tələbə dövlət sifarişi əsasında, 852 nəfər tələbə isə ödənişli əsaslarla qəbul olunub. Bu il 365 nəfər gənc 500-dən çox bal toplayaraq ADPU-ya qəbul olunub. Onlardan 183 nəfər Filologiya fakültəsinə, 64 nəfər Tarix və coğrafiya fakültəsinə, 40 nəfər Riyaziyyat fakültəsinə, 27 nəfər Kimya və biologiya fakültəsinə, 11 nəfər İbtidai təhsil fakültəsinə qəbul olunub. Yeni tədris ilində ADPU-nun Şəki filialına 9 ixtisas üzrə 220 nəfər, Quba filialına 6 ixtisas üzrə 202 nəfər, Ağcabədi filialına 5 ixtisas üzrə 137 nəfər, Şamaxı filialına 5 ixtisas üzrə 143 nəfər, Cəlilabad filialına 4 ixtisas üzrə 131 nəfər qəbul olunub.

ADPU-nun nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecinə (ADPK) 9 illik təhsili bazasından 592 nəfər tələbə, 11 illik təhsil bazasından 292 nəfər



*"Fənn olimpiadaları və müsabiqələri"nin qalibləri olan tələbələrlə birlikdə*

tələbə qəbul olunub. Ümumiyyətlə, ADPU-ya filiallar və kolleclə birlikdə 4010 nəfər tələbə qəbul olunub ki, onlardan da 352 nəfəri 500-dən, 3 nəfəri 600-dən çox bal toplayıb.

2019/20-ci tədris ilində ADPU-ya ali təhsilin magistratura səviyyəsində qəbulun nəticələri də qənaətbəxş olub. ADPU-ya ali təhsilin magistratura səviyyəsində 20 ixtisas, 22 ixtisaslaşma üzrə 310 nəfər qəbul olunub. Onlardan 125 nəfəri dövlət sifarişi əsasında, 185 nəfəri isə ödənişli əsaslarla qəbul olunub. Bu uğurlu göstəricilərə isə son illər ADPU-da idarəetmə və təhsil sahəsində həyata keçirilən genişmiqyaslı islahatlar nəticəsində nail olunub.

ADPU-da filiallar və Pedaqoji Kolleclə birlikdə təxminən 20 minə yaxın tələbə təhsil alır. Ali təhsilin bakalavriat səviyyəsində 8 fakültədə (Filologiya, Tarix və coğrafiya, Riyaziyyat, Kimya və biologiya, Fizika, İbtidai təhsil, Məktəbəqədər təhsil, İncəsənət və fiziki tərbiyə) 22 ixtisas, magistratura səviyyəsində isə 18 ixtisas üzrə pedaqoji kadr hazırlanır.

Universitet tələbələrinin təhsil-tərbiyəsi və peşəkar müəllim kimi yetişməsi ilə 77 elmlər doktoru, 61 professor, 273 dosent, 385 fəlsəfə doktoru və onlarla müəllim çalışır. ADPU-da gələcək müəllimlərin peşə hazırlığında pedaqoji təcrübəyə xüsusi diqqət verilir. Tələbələrimiz Bakının ən qabaqcıl məktəblərində pedaqoji təcrübə keçirlər. Bu məqsədlə Azərbaycan Respublikası təhsil nazirinin 20 iyul 2016-cı il tarixli əmri ilə Bakı şəhərindəki



*ADPU-da Beynəlxalq konfrans.Soldan, ön sırada: prof.P.Amonaşvili, dos.Ə.Abbasov, prof.C.Cəfərov (rektor),akademik Ş.Amonaşvili, prof.H.Əhmədov, prof.E.Bəylərov, A.Seyidov, dos.Q.Novruzov, prof.F.Rüstəmov, dos.R.Xəlilov (2018)*

M.Rahim adına 7 saylı tam orta məktəbin 2016/17-ci tədris ilindən etibarən ADPU-nun baza məktəbinə çevrilib. Bu əmrin verilməsi ölkəmizdə ardıcıl şəkildə həyata keçirilən təhsil islahatlarının, eləcə də yüksəkixtisaslı pedaqoji kadr hazırlığının tərkib hissəsidir və nəticə etibarilə təhsilin keyfiyyətinin yaxşılaşmasına xidmət edir.

ADPU-da hazırda daxili yazışmalar elektron formada aparılır və universitetdə Elektron Universitetin vacib platforması olan elektron-tədris sistemi çalışır. Həmçinin professor-müəllim heyəti beynəlxalq elmi jurnallara çıxış imkanlarını təmin edən "Web of Science" elmi bazasına sərbəst formada daxil olub, oradakı elmi jurnallar və məqalələr haqqında geniş məlumatlar əldə edir. Universitetin professor-müəllim heyətinin bu sahədəki peşəkarlığını atrımaq məqsədilə "Clarivate Analytics"in əməkdaşları tərəfindən ADPU-da bir neçə dəfə seminarlar təşkil olunub. Bunun nəticəsində Pedaqoji Universitet elmi məhsuldarlığın artım dinamikasına görə bir çox universitetləri qabaqlamışdır. Belə ki, statistik məlumatlara görə 2016-cı illə müqayisədə 2017-ci ildə ADPU-da nəşr aktivliyi xeyli artmışdır. Bunun da nəticəsində 2018-ci ildə "Clarivate Analytics" şirkəti tərəfindən ADPU son "İnkişaf sürəti"nə görə 3 ilin "Web of Science»" elmi bazasının "Ən mütərəqqi Universitet"i mükafatına layiq görülmüşdür. ADPU əməkdaşlarının elmi nəşrlərinin müqayisəli təhlili göstərir ki, 1975-2018-ci illərdə




*Azərbaycan  müəllimlərinin XV qurultayı*
*Soldan: prof.M.İlyasov, dos.Y.Rzayeva, prof.C.Cəfərov.*
*prof A.Zamanov, prof. F.Rüstəmov (2018)*

çap olunmuş 303 beynəlxalq elmi məqalənin 58-i son 3 ilə (2016, 2017, 2018) aiddir. Bu da ümumi nəticənin 20%-i deməkdir.

Prof.Cəfər Cəfərov  praktik fəaliyyəti və nəzəri ideyaları ilə dövlətin və dövlətçiliyin möhkəmlənməsinə xidmət edən, geniş ictimai-siyasi fəaliyyəti ilə  seçilən, pedaqoji və elmi-pedaqoji kadr  hazırlığındakı problemləri dilə gətirməklə  yanaşı, həm də onların  aradan qaldırılması yollarını göstərən vətənpərvər ziyalılarımızdandır. 2016-2019-cu illərdə Pedaqoji Universitetdə fəaliyyət göstərən "Ümumi pedaqogika, pedaqogika və təhsilin tarixi", "Təlim və tərbiyənin nəzəriyəsi və metodikası" ixtisasları üzrə Dissertasiya Şurasına rəhbərliyi zamanı göstərdiyi elmi tələbkarlıq və  prinsipiallıq bunu sübut edir. Onun Azərbaycan müəllimlərinin XV  qurultayının "Ali təhsil: mövcud vəziyyət, perspektivlər" adlı  panel sessiyasında spiker kimi çıxışı və "Müəllim hazırlığında yeni trendlər" adlı məruzəsi Azərbaycanda pedaqoji kadr hazırlığı sahəsində ADPU-da son illərdə aparılan islahatların istiqamətlərinin şərhinə, qazanılan təcrübənin ümumiləşdirilməsinə və inkişaf persperktivlərinin müəyyənləşdirilməsinə həsr edilmişdi. Nəzəri-metodoloji və praktik dəyərliliyi ilə seçilən məruzə həm panel iştirakçıları, həm də Təhsil Nazirliyinin rəhbərliyi tərəfindən yüksək dəyərləndirilmişdir.

Prof.Cəfər Cəfərovun həyata keçirdiyi planlı və məqsədyönlü strategiya nəticəsində Elm İnkişaf Fondu /“Clarivate Analytics”ADPU-nu Web of

Science üzrə son 3 ildə ölkənin ən mütərəqqi universitetlərindən biri seçib.

Pedaqoji Universitetin respublikanın ali təhsil müəssisələri arasında reytinqinin ildən-ilə yüksəlməsinin nəticəsidir ki, AzEdu.az təhsil portalının keçirdiyi sorğunun nəticələrinə görə, ADPU *"İlin ən yaxşı ali təhsil müəssisəsi"* (2018) elan olunmuşdur.

"Məktəb guşəsi" jurnalının Azərbaycanın 43 ali məktəbinin tələbələri arasında apardığı sorğu Pedaqoji Universitet üçün uğurlu olub. *"Təhsil almaq üçün hansı universiteti seçərdiniz?* nominasiyasına görə ADPU ikinci, *"Hansı universitetin rektoru tələbəyə və cəmiyyətə əlçatandır?* nominasiyasına görə isə birinci yeri tutub. Uğurlu nəticəyə görə prof.Cəfər Cəfərov "Məktəb guşəsi" jurnalının təsis etdiyi "Təşəkkürnamə" ilə təltif edilib.

Son illərdə ADPU-da elm və təhsillə bağlı beynəlxalq və respublika səviyyəli konfrans, simpozium və dəyirmi masaların keçirilməsi, xarici ölkə universitetlərinin tanınmış alimləri ilə görüşlərin təşkili ənənə halını alıb. Hər il TEC xətti ilə tələbələrin və magistrantların elmi araşdırmalarına həsr olunmuş konfranslar keçirilir. ADPU-nun elm sahəsində qazandığı uğurların nəticəsidir ki, Təhsil Nazirliyinin razılığı ilə 2018-ci ildə Doktorant və gənc tədqiqatçıların XXII Respublika konfransı məhz Pedaqoji Universitetdə keçirilmişdir. Təhsil naziri C.Bayramovun və ali məktəb rektorlarının iştirak etdiyi respublika ali məktəb tələbələrinin mötəbər elmi məclisinin materialları ADPU tərəfindən nəfis şəkildə nəşr edilərək iştirakçılara təqdim olunub.Tədbirin yüksək səviyyədə təşkilinə görə ADPU rəhbərliyinə Təhsil Nazirliyinin təşəkkürü elan olunub.

Prof.C.Cəfərovun təşəbbüsü ilə universitetin nüfuzunun yüksəldilməsi və təhsilin keyfiyyətinin artırılması ilə bağlı bir sıra tədbirlər və layihələr həyata keçirilir. Bu baxımdan ABŞ-ın Corc Vaşinqton Universiteti ilə magistr hazırlığı ilə bağlı ikili diplom proqramı layihəsini xüsusi qeyd etmək olar. 31 yanvar 2020-ci il tarixində Azərbaycan Dövlət Pedaqoji Universiteti və Corc Vaşinqton Universiteti arasında ikili diplom proqramı üzrə saziş imzalanmışdır. Həmin sazişin şərtlərinə görə, 2020/21 və 2021/22-ci tədris illərində menecment (təhsilin təşkili və idarə-olunması) ixtisasına 25 nəfər magistrant qəbul olunmuşdur.

2013-2016-cı illərdə "Turizm və qonaqpərvərlik tədqiqatları" jurnalının baş redaktoru olan prof.Cəfər Cəfərov hazırda "ADPU-nun Xəbərləri", "Təhsildə İKT", "Tarix, insan və cəmiyyət" jurnallarının baş redaktoru, "Azərbaycan məktəbi", "Kurikulum" və Moskvada nəşr edilən "İnsan kapitalı" ("Человеческий капитал") elmi-praktik jurnallarının redaksiya heyətinin üzvüdür. O, həm də 2015-ci ildən Rusiya Federasiyasının Prezi-



*ADPU-da Bilik günü (2019)*

denti yanında Rusiya Xalq Təsərrüfatı və Dövlət İdarəçiliyi Akademiyasının Dövlət İdarəçilik və İdarəetmə İnstitutunun (İGSU) və Beynəlxalq Kommunikologiya Akademiyasının "Kommunikologiya" ("Коммуникология") beynəlxalq elmi jurnalının redaksiya heyətinin üzvüdür.

Prof.Cəfər Cəfərov 2000-ci ildə ABŞ Dövlət Departamenti tərəfindən maliyyələşən və Beynəlxalq Tədqiqat və Mübadilə Təşkilatı (İREX) tərəfindən idarə olunan Müasir məsələlər üzrə Təqaüdlər Proqramının qalibi olub.

Prof.Cəfər Cəfərovun təhsil quruculuğundakı xidmətləri dövlət və ictimai-siyasi təşkilatlar tərəfindən yüksək qiymətləndirilib. O, Azərbaycan Respublikasının Prezidenti İ.Əliyevin sərəncamı ilə "Azərbaycan Xalq Cümhuriyyətinin 100 illiyi (1918–2018)" medalı (2019), ABŞ-da təhsil alan Azərbaycan Məzunlar Assosiasiyasının "Təhsil sahəsində ən yaxşı nəticəyə görə" diplomu (2008),"Fəxri turizm işçisi" döş nişanı (2014), Humanist Pedaqogikanın Beynəlxalq Mərkəzi tərəfindən "Humanist pedaqogikanın cəngavəri" adı və "Ürək və qu quşu" döş nişanı (2017), Azərbaycan Respublikası Müharibə, Əmək və Silahlı Qüvvələr Veteranları Təşkilatının "General Həzi Aslanov" (2019) və Vətən Müharibəsi Veteranlar Birliyinin "Milli Ordunun 100 illik yubileyi" (2019) ADPU və Corc Vaşinqton Universitetinin Təhsil və İnsan İnkişafi Məktəbi arasında Birgə Bəyannamə (2019) medalı və müxtəlif media mükafatları ilə təltif edilib.

***Cəfər Məmməd oğlu Cəfərov***

12 dekabr 2017-ci ildə IMC/FH KREMS Universitetinin fəxri doktoru adına layiq görülən prof.Cəfər Cəfərov 2018-ci ildə Paris-Sorbon Abu Dabi Universiteti ilə ikitərəfli əməkdaşlığın möhkəmləndirilməsindəki dəstək və səylərə görə təşəkkür diplomu ilə təltif olunub.

Prof.Cəfər Cəfərovun rəhbərliyi ilə özünün inkişafının keyfiyyətcə yeni mərhələsinə qədəm qoyan Azərbaycan Dövlət Pedaqoji Universiteti tarixinə, ənənəsinə sadiq qalmaqla yeniləşmək, pedaqoji və elmi-pedaqoji kadr hazırlığında lider universitetə çevrilmək iddiasındadır.




*Yeni müqavilə - yeni əməkdaşlıq: sağdan ADPU-nun rektoru, prof.C.Cəfərov, Təhsil naziri Ceyhun Bayramov, ABŞ-ın ölkəmizdəki səfiri Örl Litzenberqer və Corc Vaşinqton Universitetinin Təhsil və insan inkişafı fakültəsinin dekanı Maykl Foyer*

***Cəfər Məmməd oğlu Cəfərov***

# ALİ PEDAQOJİ QADIN İNSTİTUTU

***Ali Pedaqoji Qadın İnstitutunun yaradılması haqqında Azərbaycan SSR Xalq Komissarları Sovetinin 29 noyabr 1922-ci il tarixli dekreti***

**1.** Bakı şəhərində mövcud olan Məktəbəqədər Tərbiyə İnstitutu türk dövlət dilində II dərəcəli məktəblər üçün qadın müəllimləri hazırlayan Ali Pedaqoji İnstituta çevrilsin.

**2.**Xalq Maarif Komissarlığı Kollegiyasının 13 iyun 1921-ci ildə Azərbaycan Dövlət Kişi Pedaqoji İnstitutu haqqında qəbul etdiyi nizamnamə Azərbaycan Qadın Pedaqoji İnstitutuna da şamil edilsin.

*Azərbaycan SSR Xalq Komissarlar Sovetinin sədri*
***Qəzənfər Musabəyov***”.



***Ali Pedaqoji Qadın İnstitutunun Pedaqoji şurasının üzvləri***



**SARA XANIM XURAMOVİÇ**
*Ali Pedaqoji Qadın İnstitutunun ilk və son direktoru ( 1890- 1965)*

Azərbaycan Dövlət Pedaqoji Universitetində təhsil alan tələbələrin böyük əksəriyyətini (bəzi fakültələrdə 99 faizini) qızlar təşkil edir. Amma Pedaqoji Universitetin əsası Ali Pedaqoji Kişi İnstitutu adı ilə qoyulub. 1921-ci ilin noyabr ayının 15-də institut 6 nəfər oğlan tələbə (Əbülhəsən Rəhimzadə - Salyan qəzası, Atababa Musaxanlı-Bakı qəzası, Vəli Axundzadə Ağdam qəzası, Mahmud Süleymanzadə və Veyis Mustafazadə -Göyçay qəzası, Əbdülmüsəvvər Əlizadə - Türkmənistan) ilə fəaliyyətə başladı. Nizamnamədə də göstərilirdi ki, instituta 18 yaşından yuxarı zəhmətkeş balaları, ilk növbədə müəllimlər seminariyasını, yaxud ikinci dərəcəli məktəbləri bitirən və fiziki cəhətdən qüsuru olmayan kişilər imtahan vermək şərtilə qəbul oluna bilər. Təhsil müddəti 3 il idi. Müəllim kadrlarına çox ciddi ehtiyac olmasına baxmayaraq qəbul imtahanları xüsusi komissiyanın iştirakı ilə aparılırdı. Birinci il, demək olar ki, ilboyu qəbul aparılaraq tələbələrin sayı 40 nəfərə çatdırılmışdı. İkinci tədris ilində 41 nəfər tələbə qəbul olundu. Üçüncü tədris ilində institutda 100 nəfər tələbə var idi. 1926-ci ildə institutun direktoru olmuş Cəlil Məmmədzadə təhsil ocağının 5 illik yubileyi ilə bağlı məqaləsində yazırdı:"-Bu qədər az müddət içərisində üç buraxılış olmuş: I – 1923/24-də 28 nəfər; II – 1924/25-də 27 nəfər; III – 1925/26-da 56 nəfər; həpsi yüz on bir (111) nəfər müəllim buraxılmışdır"[39]. İldən-ilə müəllim olmaq istəyənlərin sayı artdı. 1924-cü ildə Azərbaycan Xalq Maarif Komissarlığı institutun yeni tədris planını (4 illik) və 70 nəfərlik qəbul planını təsdiq etdi. 1924-cü ilin qəbul kampaniyasında iştirak edərək tələbə adı qazanan Musa Hacıyev xatirələrində yazır:"*1924-cü ilin yayı yaxşı yadımdadır. O zaman institutumuz indiki D.Bünyadzadə adına Azərbaycan Xalq Təsərrüfatı İnstitutunun (indiki-*

[39] Ali Pedaqoji İnstitut. 5 illik. Bakı, 1926,s.3

*İqtisad Universiteti -F.R.) binasında yerləşirdi. İnstitumuzun həyati qəbul imtahanı verməyə gəlmiş gənclərlə dolu idi.Ərizə verən çox, qəbul isə az idi. Bütün fakültələrə cəmi 70 nəfər gənc qəbul ediləcəkdi. Onu da qeyd edim ki, o zaman Dağıstanda, Özbəkistanda və Krımda hələlik ali məktəblər təşkil edilmədiyindən həmin yerlərdən gəlmiş gənclər də bizimlə qəbul imtahanları verirdilər... A.Şaiq gülərüzlə auditoriyaya girdi. Bizi salamladıqdan sonra ərəb əlifbası ilə yazı taxtasına imtahana düşən mövzuların adlarını yazdı və dedi:- "Oğlanlarım, birini seçib yazın. Bax, yazarkən tələsməyin, diqqətli olun, dərindən fikirləşin, sizə müvəffəqiyyətlər arzulayıram."*[40] O mövzulardan yalnız özüm yazdığım yadımda qalmışdır:"Pedaqoji İnstitutun Azərbaycan üçün əhəmiyyəti" Şifahi imtahanlar bilet əsasında aparılmırdı. Müəllimlər özləri şifahi suallar verir və abituriyentlərdən bu suallara cavab alırdılar. Bu yolla şifahi imtahanları da verdikdən sonra instituta əvvəlcədən müəyyən edildiyi kimi 70 nəfər gənc qəbul edildi. Yeni tələbələrin hər bir xərci hökumət hesabına idi. Ümumi yataqxanada yaşayırdıq. Beləliklə, biz gənclərin ömür kitabında yeni, xoşbəxt bir səhifə açıldı, biz mənalı tələbəlik həyatına qədəm qoyduq".[41] Bu tələbələrin içərisində bir nəfər də olsun qadın yox idi. Halbuki, ali təhsilli qadın müəllimlərə də böyük ehtiyac var idi.

XX əsrin 20-ci illərində yaradılan Məktəbəqədər Qadın Tərbiyə İnstitutunun ilk rəhbərlərindən biri olan ***A.Lukyanova*** bu xüsusda yazırdı:"Azərbaycan Şura hökuməti tərəfindən işğal edilər- edilməz qısa müddətli pedaqoji kursları açıldı; fəqət bu kurslar mükəmməl bir təhsil almaq və təhsilə davam etmək istəyənləri qənaətləndirə bilməzdi. Öz məmləkətinin tələbatını bilən və qadın təhsil və tərbiyəsinin tərəfdarı olan Xalq Maarif Komissarlığı Məktəbəqədər Tərbiyə İnstitutunun açılması xüsusunda Xalq Komissarları Sovetinə rapor verdi"[42].



*A.Lukyanova*

Həqiqətən, Azərbaycan SSR Xalq Maarif Komissarlığının Kollegiyası 1921-ci ilin əvvəllərində Məktəbəqədər Qadın Tərbiyə İnstitutunun açılması ilə

[40] Hacıyev M. Mənim tələbəlik illərim. "Gənc müəllim" qəzeti, 30 mart 1972

[41] Yenə orada

[42] Ali Pedaqoji İnstitutun salnaməsi. Bakı,1924

***Sara xanım Xuramoviç***

bağlı Azərbaycan Mərkəzi İcraiyyə Komitəsinə müraciət etmişdi. Ali qanunvericilik orqanında bu məsələ müzakirə olunmuş və Birinci Məktəbəqədər Qadın Tərbiyə İnstitutunun açılması ilə bağlı xüsusi dekret verilmişdi. Həmin dekretdə deyilirdi:"Məktəbəqədər tərbiyə sahəsində təcrübəli kadrlar və rəhbər işçilər hazırlamaq, həmçinin qadınlar arasında tərbiyə işlərini yaymaqdan ötrü 1921-ci il martın 1-dən etibarən Bakı şəhərində Birinci Məktəbəqədər Qadın Tərbiyə İnstitutu açılsın".[43] 1924-cü ildə nəşr edilən "Ali Pedaqoji İnstitutun salnaməsi" adlı məcmuədə göstərilir ki, burada təhsil müddəti 3 il idi (həmin dövrdə Ali Pedaqoji Kişi İnstitutunda da təhsil müddəti 3 il idi -F.R.). Birinci ildə Pedaqoji İnstituta 30 nəfər qadın qəbul edil- mişdi ki, onların da əsas hissəsini Azərbaycan qəzalarından gələnlər təşkil edirdi"[44]. Nizamnamədə instituta müəllim seminariyasını və ikinci dərəcəli məktəbləri bitirən qızların qəbulu nəzərdə tutulsa da orta təhsilli qızların az olması səbəbindən 1 dərəcəli məktəb həcmində təhsili olan qızlar da qəbul olunurdu. İnstituta ilk direktor A.Makinskaya təyin olundu. Sonrakı illərdə onu A.Lukyanova və K.Ordubadskaya əvəz etdi. O dövrdə müəllim kadrları hazırlığında xüsusi xidmətləri olan Səlimə xanım Osmanzadə (o, eyni zamanda Ali Pedaqoji Kişi İnstitutunda təbiyyət-aqronomi şöbəsinin müdiri idi) və Zəhraxanım Şaxtaxtinskaya Birinci Məktəbəqədər Qadın Tərbiyə İnstitutunda çalışırdılar. Burada çalışan 22 müəllimdən 18 nəfərinin ali təhsili var idi. İnstitutda təhsil müddəti üç il olaraq qəbul edilmişdi.

1921-1922-ci tədris ilində institutda 54 tələbə vardısa, bir il sonra onların sayı 115-ə çatdı. Azərbaycan SSR Xalq Komissarları Sovetinin sədri Qəzənfər Musabəyovun 29 noyabr 1922-ci il tarixində imzaladığı dekretdə deyilirdi:

"1.Bakı şəhərində mövcud olan Məktəbəqədər Tərbiyə İnstitutu türk dövlət dilində II dərəcəli məktəblər üçün qadın müəllimləri hazırlayan Ali Pedaqoji İnstituta çevrilsin.

2.Xalq Maarif Komissarlığı Kollegiyasının 13 iyun 1921-ci ildə Azərbaycan Dövlət Kişi Pedaqoji İnstitutu haqqında qəbul etdiyi nizamnamə Azərbaycan Qadın Pedaqoji İnstitutuna da şamil edilsin.

*Azərbaycan SSR Xalq Komissarlar Sovetinin sədri*

***Qəzənfər Musabəyov***".[45]

1922-1923-cü tədris ilində Birinci Məktəbəqədər Qadın Tərbiyə İnstitutu Ali Pedaqoji Qadın İnstitutuna çevrildi. Azərbaycanda qadın təhsilinin təşək-

---

[43] Собрание узаконений и распоряжений правительства АССР за 1921 год.Баку,1921,№8, стр.255

[44] Ali Pedaqoji İnstitutun salnaməsi. Bakı,1924, s.21

[45] Собрание узаконений и распоряжений правительства АССР за 1922 год.Баку,1923

külü və inkişafında xüsusi xidmətləri olan A.Lukyanova yazırdı: *”Azərbaycanda qadın tərbiyəsi ağır bir vəziyyətdə olduğu üçün Xalq Maarif Komissarlığı III kursun 17 nəfər tələbəsini bir yıl müddətində birinci dərəcə məktəblərdə dərs vermək üçün qəzalara göndərilməsini qərara almışdır. Bir yıldan sonra darülmüəllimatı üçüncü qrup qurtaracaqdır ki, bunlar qəzalara göndəriləcək və bu yıl qəzaya gedənlər isə təkrar Ali darülmüəllimata dönərək II dərəcəli məktəbdə dərs verməkdən ötrü xüsusi sinfini ikmal edəcəklərdir. Bu cari tədris yılında III kursun proqramı öylə tərtib edilmişdi ki, ümumi dərslərdən maəda: türkcənin üsul-tədrisi, hesabın üsul-tədrisi, təbiətin üsul-tədrisi və pedaqoji tarixi dəxi daxil edilmişdi. Bunlardan başqa hər bir tələbə türkcə, təbiət və hesabdan nümunə dərsləri verməli idi. Ali darülmüəllimat qurtaran tələbələr ümumi dərslərdən olduqca gözəl bir surətdə hazırlanmışdır. Verdikləri nümunə dərslər bunu isbat etməkdədir. Bunlar gələcək pedaqoji fəaliyyətlərində müvəffəqiyyət qazanacaqlardır”*[46].



*Sara xanımın atası General Mirkazım bəy Talışxanov*

Sonra qəzalara göndərilən qızların ad və soyadları əlifba sırası ilə aşağıdakı ardıcıllıqla verir:

| | |
|---|---|
| 1.Axundzadə Mələk | Şamaxı qəzasından nəhari[47] tələbə |
| 2.Atakişizadə Humay | Şamaxı qəzasından nəhari tələbə |
| 3.Eyyublu Sənubər | Qazax qəzasından leyli[48] tələbə |
| 4.Usubova Gövhər | Qazax qəzasından leyli tələbə |
| 5.Tutayuq Fatma | Şuşa qəzasından leyli tələbə |
| 6.Pinova Nəzirə | (Gürcüstan-Axısqa) nəhari tələbə |
| 7.Hacızadə Tutu | Bakı qəzasından nəhari tələbə |
| 8.Xızırbəyli Şahizə | (Gürcüstan – Axısqa) nəhari tələbə |

[46]Ali Pedaqoji İnstitutun salnaməsi. Bakı,1924

[47] Gündüz oxuyan tələbə

[48] Axşam oxuyan tələbə

***Sara xanım Xuramoviç***

9.Xəlifəzadə Sürəyya Şuşa qəzasından nəhari tələbə
10.Şahtaxtlı Xədicə (Ermənistan-İrəvan)nəhari tələbə
11.Sadıqzadə Şövkət Şuşa qəzasından nəhari tələbə
12.Səfərzadə Səkinə (Gürcüstan-Tiflis) nəhari tələbə
13.Əlizadə Südabə (Ermənistan-İrəvan) nəhari tələbə
14.Qazızadə Güllərəc (Ermənistan-İrəvan) nəhari tələbə
15.Qiyasbəyli Şirin Qazax qəzasından leyli tələbə
16.Qiyasbəyli Müqdənisə Qazax qəzasından leyli tələbə
17.Məhəmmədzadə Xanıman Bakı-nəhari tələbə

*Kitabda tələbələrin ictimai vəziyyəti aşağıdakı kimi verilmişdi:*
Əkinçi sinfinə mənsub olanlar: 10
İşçi sinfinə mənsub olanlar: 4
Zəhmətkeş ziyalı müəllim sinfinə mənsub olanlar 3-dür.

Ali Pedaqoji Qadın İnstitutunun ilk və son direktoru ***Sara xanım Xuramoviç*** olmuşdur.

20-ci illərdə görkəmli maarifçilərlə çiyin-çiyinə çalışan, ali pedaqoji təhsil quruculuğunda fədakarlıq nümunəsi göstərən *Sara xanım Xuramoviç* (Talışınskaya) kimdir?

Sara xanım Xuramoviç (Talışınskaya) 1890-cı ildə fevralın 7-də Tiflisdə anadan olub.[49] Onun atası general Mirkazım bəy Talışxanov Mirəli xanın oğlu olub. Mirəli xanın babası Qara xan Lənkəran xanlığının əsasını qoyub. Mirkazımın atası Mirəli xan da uzun illər çar ordusunda qulluq edib. Ailədə ciddi nizam-intizam görən Mirkazım bəy atasının yolunu davam etdirmək arzusunda olsa da, öncə Bakı realni məktəbində oxuyub. 21 yaşında burda təhsilini bitirən Mirkazım bəy hərbçi olmaq arzusu ilə ikinci dərəcəli Konstantin yunkerlər məktəbinə daxil olur və ona yunker-zabit rütbəsi verilir. İki il sonra Tiflisdəki yunkerlər məktəbinə müəllim təyin edilən Mirkazım bəy çox gənc yaşında podpolkovnik rütbəsi alır. Orduda uzun illər qüsursuz xidmətinə görə, III dərəcəli "Müqəddəs Anna", II-III dərəcəli "Müqəddəs Stanislav" orden və medalları ilə təltif edilən Mirkazım bəy 1914-cü ildə general-mayor rütbəsinə layiq görülür. 45 illik xidmətdən sonra 1916-cı ildə istefaya çıxan Mirkazım bəy bundan sonrakı ömrünü xeyriyyəçilik işlərinə sərf etmək üçün Tiflisdəki Qafqaz Müsəlman Xeyriyyə Cəmiyyətində işə başlayır.

Bu haqda illər sonra Mirkazım bəyin qızı Züleyxa xanım yazırdı: "General-mayor İbrahim ağa Vəkilovla yaxın dost olan atam Tiflisdəki Qafqaz

---

[49] Gəncəli S.Hər sətirdə bir tarix.Bakı, Şur, Cik-cik, 1994, s.176-177

***Sara xanım Xuramoviç***

Müsəlman Xeyriyyə Cəmiyyətində onunla birgə fəaliyyət göstərirdi. Cəmiyyətin sədri İbrahim ağa Vəkilov, katibi isə atam Mirzə Kazım bəy Talışxanov idi. Az sonra bu səmimi dostluq qohumluğa çevrildi. İbrahim ağa Vəkilovun böyük oğlu Fərəc bacım Leylabəyimlə ailə həyatı qurdu".

Mirkazım bəy 1888-ci ildə Ağabəy Yadigarovun qızı Məsumə xanımla evlənib. Anası yüksək təhsilli olmasa da ərəb və fars dillərini bilib, qızının ilk təhsilində mühüm rol oynayıb. Məsumə xanım da Tiflisdə xeyriyyəçiliklə məşğul olurdu. O, Zaqafqaziya Qadın Xeyriyyə Cəmiyyətinin ən fəal üzvlərindən idi. Cəmiyyətin yığıncaqlarında və ianələrin toplanmasında yaxından köməklik edərdi. Tiflisin tanınmış türk-müsəlman ziyalı-zadəgan qadınları bu cəmiyyətin ətrafında toplaşmışdılar. Sara xanım  maarifpərvər bir ailədə böyüyüb. Ailədə Azərbaycan, rus və Avropa şair və yazıçıları haqqında çox şey öyrənə bilmişdi. Bu izdivacdan bir oğlu, üç qızı olub. Mirəli, Sara, Leyla, Züleyxa. Daima hərbi səfərlərdə olmasına baxmayaraq, Mirkazım bəy övladlarının tərbiyə və təhsilinə çox ciddi yanaşıb. Təbii ki, bu işdə ona ömür-gün yoldaşı Məsumə xanım da çox böyük kömək edib. Məsumə xanım özü də tanınmış Yadigarovlar nəslindən idi. Yadigarovlar Borçalının Təkəli kəndindən olublar. Bu əsilzadə nəslin oğulları igidliyi, səxavətliliyi ilə ad-san qazanıb, görkəmli sərkərdələri tariximizdə layiqli iz qoyublar.

M.F.Axundovla yaxın dost olan babasının  böyük filosof yazıçı  haqqında  danışdığı əhvalatlar balaca Sarada  yaxşı təsəvvür yarada bilmişdi. Sara 1898-1906-cı illərdə Tiflisdəki gimnaziyada təhsil almışdır. Bu gimnaziya o dövrdə Cənubi Qafqazda çox məşhur idi. Təhsil müddəti on il olan bu klassik gimnaziyanın direktoru ***Lev Nikolayeviç Mozdalevski***[50] olmuşdur. Xeyli azər-

---

[50] *Lev Nikolayeviç Mozdalevski O,1837-ci il fevralın 14-də Sankt-Peterburq quberniyasının Qdovski uyezdinin Qari kəndində- MIZAsında (indiki indiki Pskov vilayətinin Porxov rayonunun Qari kəndində) anadan olmuşdur. Atası dvoryan Nikolay Lvoviç, anası Olqa Kuzminiçnadır. Əvvəlcə gimnaziyada oxumuş, sonra Peterburq Universitetinin Tarix-filologiya fakültəsində təhsil almışdır. Peterburq Universitetini bitirəndən sonra iki il Almaniyanın Qeydelberq və İen Universitetlərində mükəmməl təhsil almış, Avropa pedaqoqlarının pedaqoji irsini dərindən öyrənmişdir.Təhsilini bitirdikdən sonra Peterburqun bir neçə məktəbində işləyib. K.D.Uşinskinin təklifi ilə «Xalq Maarif Komissarlığının jurnalı»nda əməkdaşlıq edib, eyni zamanda Hüquq Məktəbində tarix fənnindən dərs demişdir. Daha sonra princ P.Q.Oldenburqskinin Xüsusi Rejimli Məktəbində müfəttiş vəzifəsində çalışıb. Smolnıdakı Nəcib Qızlar Məktəbində müəllimlik edib.1867-ci ildə Qafqaz canişini Mixail Nikolayeviç Romanovun (1832-1909) təklifi ilə Tiflisə gəlib, burada iki il onun uşaqlarının müəllimi, hami-nəzarətçəsi olub. (Mixail Nikolayeviç Rusiya çarı I Nikolayın 7-ci övladı, 4-cü oğludur). L.N.Modzalevski Tiflisdə M.F.Axundzadənin ünsiyyətdə olduğu ziyalılardan olmuşdur. O, 1880-1883-cü illərdə Qafqaz Senzor Komitəsinin sədri olmuş, «Ziya»(«Ziyayi-Qafqaziyyə») qəzetlərinin, eləcə də «Kəşkül» adlı jurnal və qəzetin fəaliyyətinə vəzifə borcu çərçivəsində qayğı göstərmişdir. L.N.Modzalevski 1883-cü ildə, Tiflisdəki 16 illik pedaqoji və məmur həyatından uzaqlaşmaq qərarına gəlmiş, istefa verərək Tiflisdən Peterburqa*

baycanlı maarifpərvərlərin təhsil yolu ***Tiflis klassik gimnaziyasında***[51] başlanmışdır. Təhsilini başa vurduqdan sonra 1 il gimnaziyanın valideyn şurasında zəif oxuyan uşaqlara dərs demişdir. 1907-ci ildə Tiflis şəhər idarəsi məktəblər şöbəsi onu Supsərkic küçəsindəki Puşkin adına I şəhər ibtidai məktəbinə müəllim göndərir. Həmin məktəbin şagird kollektivi müxtəlif idi. 4 sinifdə gürcü, 4 sinifdə isə azərbaycanlı oğlan və qızları təhsil aldığı məktəbdə Sara xanımın bacısı Liya (bəzi sənədlərdə Leyla kimi yazılır -R.F.) Talışinskaya - Vəkilova (O, Tiflisin II qız gimnaziyasının qızıl medalla bitirmişdi) da dərs deyirdi. Liya Vəkilova 1919-cu ilə kimi həmin məktəbdə dərs demişdir. O, məktəbin müdir vəzifəsindən öz arzusu ilə azad olunub Bakıya gələndə həmin məktəb qız məktəbinə çevrilmişdi.

Sara xanım Tiflisdə yaşayarkən Tiflis Qadın Xeyriyyə Cəmiyyətinin fəal üzvlərindən biri olmuşdur. Cəmiyyətin xəzinədarlığına nəzarət ona həvalə edilmişdi. Sara xanım 1917-ci ildə Bakıda keçirilmiş müsəlman qadınlarının qurultayında çıxış edərək qadınların hüquqsuzluğundan, təhsildən kənarda qalmasından, cəmiyyətdə rolunun düzgün qiymətləndirilməməsindən bəhs etmişdir. Onun və Şəfiqə Əfəndizadənin çıxışından sonra gərgin vəziyyət yarandı, nümayəndələr qadın məsələsinə ciddi münasibət bildirməyə məcbur oldular. Qadınların çıxışından sonra keçmiş Bakı qazısı Ağa Məhəmməd Kərim tribunaya çıxaraq onları şəriət qanunlarına zidd olaraq kişilər qarşısında çıxış etdiklərinə görə mühakimə etdi. Zalda böyük hərc-mərclik yarandı, maarifpərvər ziyalılar aranı sakitləşdirərək, qadınları gizlincə arxa qapıdan çıxarmağa nail oldular.

---

*köçmüşdür. O,1889-cu ildə yenidən pedaqoji fəaliyyətə başlamış, Marian İnstitutunda sinif müfəttişi və Şura üzvü vəzifələrində çalışmışdır. Axırıncı iş yeri Sankt-Peterburq Lal-Kar Məktəbi olmuşdur. Burada direktor vəzifəsində çalışmış, 1896-cı il mayın 5-də gözlənilmədən beyin iflicindən həyatını başa vurmuşdur. O, 234 mətbu elmi əsərin, 50-yədək dərsliklərə düşmüş şeirin müəllifidir. Rusiyada xarici ölkə alimlərinin pedaqoji irsinin öyrənilməsində onun 3 cildlik «Qədim dövrdən bu günümüzə qədər tərbiyə və təlimin tarixi oçerkləri» adlı fundamental əsəri dünya pedaqoji fikrinin qiymətli mənbələrindən sayılır. «Oçerklər»in 1-ci nəşri 1866-1867-ci, 2-ci nəşri 1874-1877-ci, üçüncü nəşri isə 1892-1899-cu illərdə işıq üzü görmüşdür.*

[51] *Mirzə Şəfi Vazeh, Mirzə Hüseyn Qayıbov, Mirzə Ələkbər Nəzirov, Hacı Yusif Şahnəzərov, Mirzə Seyfəddin Seyidov və b. gimnaziyada Azərbaycan, ərəb, fars dillərindən və şəriətdən dərs demiş, İsmayıl xan Naxçıvanski, İbrahim Rəhimov, Davud bəy Şərifov, Məhəmməd bəy Şahmalıyev, Əlimərdan bəy Topçubaşov, Adil xan Ziyadxanov, Qara bəy Qarabəyov, Firudin bəy Vəzirov, Həmid Hacıbəyov, İsrafil bəy Yadigarov, İsa Sultan Şahtaxtinski, Məhəmməd ağa Şahtaxtinski, Əli bəy Hüseynzadə, Əhməd bəy Pepinov, Mustafa Quliyev, Məmmədrza Vəkilov, Nadir bəy Qayıbov, Həsən bəy Zərdabi, Mirzə Yusif xan Məmmədbəyov, Əmir Kazım mirzə Qovanlı, Qacar Fətəli bəy Sultanov, Eynəli bəy Sultanov, Əhməd bəy Ağayev, Mustafa Mərdanov, Rəşid Axundov, Həbib bəy Köçərli, Cavanşir Vəkilov, Mürsəl bəy Şahsuvarov gimnaziyanın çoxsaylı məzunlarından olmuşdur.*

***Sara xanım Xuramoviç***

Sara xanım 1907-1915-ci illərdə I şəhər ibtidai məktəbində müəllimlik etmiş, 1915-ci ildə Tiflis şəhər məktəblər idarəsi tərəfindən məktəbə müdir təyin edilmiş və 1919-cu ilə kimi həmin vəzifədə çalışmışdır. Q.Dünyamalıqızının yazdığına görə, Sara xanım imtahan verib Kiyev Dövlət Universitetinin hüquq fakültəsində oxuyub. Araşdırma zamanı bu faktı təstiq edən mənbəyə rast gəlmədik.

1919 -cu ildə Bakıya gələn Sara xanım burada qızğın maarifçilik fəaliyyəti ilə məşğul olmuş, qadın təhsilinin inkişafına dəyərli töhfə vermişdir. O, Bakıda keçirilmiş Azərbaycan müəllimlərinin III qurultayının nümayəndəsi olub. 1919-cu il avqustun 20-də saat 11-də Bakı I realnı məktəbin (indiki Azərbaycan Dövlət İqtisad Universitetinin) akt zalında öz işinə başlayır və nəzərdə tutulan müddətdə öz işini başa çatdırır[52]. Qurultayda Azərbaycanın bütün bölgələrini və tədris müəssisələrini təmsil edən nümayəndələr iştirak edirdilər. Qurultayı Azərbaycan Türk Müəllimləri İttifaqının sədri Ağabəy İsrafilbəyov açmış, qurultayda Xalq Maarif Nazirliyi adından nazir müavini Həmid bəy Şahtaxtinski böyük nitq söyləmişdir. Qurultayın Xalq Maarif Nazirliyinə təqdim etdiyi təkliflər əsasında bütövlükdə məktəb islahatı və xüsusi olaraq təhsilin məzmunca milliləşdirilməsini əsas tutan proqram və dərslik islahatı üzrə müvafiq proqram hazırlamaq məqsədilə hökumət komissiyası yaradılır.

1919-cu il noyabrın 7-də Xalq Maarif Nazirliyi yanında yaradılmış hökumət islahat komissiyasına xalq maarif nazirinin müavini Həmid bəy Şahtaxtinski (sədr) Nurməhəmməd bəy Şahsuvarov, Azad bəy Əmirov, Fətulla bəy Rzabəyli, Sultan Məcid Qənizadə, Abdulla bəy Əfəndiyev, Sara xanım Yaqubova, ***Sara xanım Xuramoviç***, Əhməd bəy Pepinov, Xədicə xanım Ağayeva, Məmmədağa Şahtaxtinski, Cabbar bəy Orucəliyev və Saleh bəy Vəkilov daxil idilər. Hökumət bu komissiya qarşısında növbəti dərs ilinin əvvəlinə kimi məktəb islahatı, o cümlədən təhsilin məzmunu ilə bağlı məsələlərin həlli üzrə hökumət proqramını hazırlamaq missiyası qoymuşdu. Sara xanım Xuramoviçin Bakıya gəlməsi ilə qurultaya nümayəndə seçilməsi və islahat komissiyasına daxil edilməsi onun ictimai-siyasi fəallığı və pedaqoji hazırlığı ilə bağlı idi. Sara xanım Bakıdakı 8 saylı məktəbdə, pedaqoji seminariyaların işində, Birinci Azərbaycan Qadın Tərbiyə İnstitutunun yaradılmasında və onun Azərbaycan Qadın Pedaqoji İnstitutuna çevrilməsində mühüm xidmətləri olmuşdur. Onun adı təhsil tarixinə həm də Azərbaycan Qadın Pedaqoji İnstitunun ilk direktoru kimi düşmüşdür.

[52] Azərbaycan müəllimlərinin III qurultayı. https://az.wikipedia.org /wiki/

***Sara xanım Xuramoviç***



*Ali Pedaqoji Qadın İnstitutunun müəllimləri*

Sara xanım Xuramoviçin *"Azərbaycan Ünas Pedaqoji İnstitutu və onun gələcəyi" (8)* adlı məqaləsi ali pedaqoji qadın təhsilinin təşkili və inkişafının ilkin mərhələsini öyrənmək baxımından dəyərli bir mənbədir. Qadın Pedaqoji İnstitutunun açılma səbəblərini S.Xuramoviç belə izah edirdi:*"Lazımi qədər məlumatlı müəllimlərin olmaması xalq maarifi qarşısında yeni məsələlər çıxardı. Həm Bakıda, həm də qəzalarda lazımi qədər müəllim yetişdirə bilmək üçün pedaqoji məktəbləri açmaq! Həmin bu məktəblərdən biri də bugünkü Ali Ünas Pedaqoji İnstitutudur ki, bunun qayəsi ikinci dərəcəli məktəblər üçün müəllimələr hazırlamaqdır. İnstitut üç hazırlıq qrupu və iki ixtisas şöbəsindən ibarətdir. Bu şöbələr təbiyyət və ictimaiyyət-ədəbiyyat şöbələri olub bu tədris yılından etibarən açılmışdır. Hazırlıq şöbələrinin olması ondan iləri gəliyor ki, institut xaricdən ali məktəb kursunu keçə biləcək qədər hazırlığı olan tələbələri deyil, hətta heç olmazsa birinci dərəcəli məktəb qədər məlumata malik olan müdavimləri belə cəlb edəmiyordu. İnstitut tələbələri başlıca olaraq qəzalardan müxtəlif təşkilat tərəfindən göndərildiyi üçün bunların səviyyələri bərabər deyildi."* Sonra müəllif fikrinə davam edərək bildirir:"Birinci qrupda 29, ikinci də 42, üçüncüdə 44 tələbə var. Böyləliklə biz görüyoruz ki, tələbələrin böyük bir qismi hazırlıq şöbələrində olub öz nöqsanlı məlumatlarını ikmal ediyorlar. İctimai vəziyyətə görə təqsimat böylədir; kəndlilər 43%, işçi balaları 13% və xidmətçilər 44%, yaş etibarilə 15-dən 25-ə qədərdirlər. Tələbələrin içərisində konşu cümhuriyyətlərdən Dağıstan krımlıları mövcuddur".

Məlum olur ki, institutda beynəlxalq inqilabçılara yardım komitəsi, kəndlə şəhərin rabitəsi cəmiyyəti, yeni əlifba dostları cəmiyyəti, kişi institutu ilə birlikdə həmkarlar ittifaqı və icraiyyə bürosu fəaliyyət göstərir. İnstitutun 17 nəfərdən ibarət olan ilk buraxılışı 1923/24-cü tədris ilində vaxtından əvvəl olmuşdur. Məzunların hamısı Azərbaycan qəzalarındakı məktəblərə müəllim təyin edilmişdir. Bu fakt o dövr üçün böyük nailiyyət və son dərəcə fövqəladə hadisə idi.

İnstitutun komsomolçuları Ali Pedaqoji Kişi İnstitutu və A.Şaiq adına nümunə məktəbinin tələbə və şagirdləri ilə birlikdə 12 noyabr 1923-cü ildə ilk iclasını keçirtmişdi. İlk iclasda komsomol özəyi təşkil olunmuş, Əbdülcəlil Əskərzadə ilk məsul katib seçilmişdi. Komsomol özəyinin "Leninçi pedaqoq"



*Tələbə İcraiyyə bürosunun üzvləri*

adlı ayda iki dəfə çıxan divar qəzeti vardı. Partiya özəyi yaradıldıqdan sonra həmin qəzet hər iki təşkilatın orqanına çevrilmiş və həmin adla həftədə bir dəfə çıxmağa başlamışdı.

Müəllif ali pedaqoji qadın təhsilinin təşkilindəki çətinlikdən bəhs etməyi unutmur, tələbələrin qruplara düzgün bölünməməsini, 3 illik təhsil müddətinin azlığını, laborator məşğələlərin keçirilməsi üçün şəraitin və təchizatın olmamasını bildirir, yeni cəmiyyətin tələblərinə uyğun müəllim kadrları hazırlamaq məqsədilə tədris planının dəyişdirilməsini, müasir tədris üsullarının tələbinə cavab verən dərsliklərin hazırlanmasını, elmi kabinələrin, zəruri ədəbiyyatla təchiz edilmiş kitabxanaların, laboratoriyaların təşkilini və

yardımçı müəssisələrin tikilməsini vacib hesab edir.

Təsərrüfat-inzibati və maliyyə çətinlikləri ayrı-ayrılıqda fəaliyyət göstərən hər iki institutun birləşdirilməsi zərurətini yaratdı. Azərbaycan Xalq Maarif Komissarları Kollegiyasının 3 aprel 1923-cü il tarixli qərarı ilə Ali Pedaqoji Kişi və Ali Pedaqoji Qadın İnstitutları 1924-1925-ci tədris ilindən inzibati cəhətdən Azərbaycan Pedaqoji İnstitutu şəklində birləşdirildi.

Həyatını təhsilin, maarifin inkişafına həsr edən Sara xanım 19 fevral 1965-ci ildə vəfat edib.

## Ədəbiyyat


1. Ali Pedaqoji İnstitut. 5 illik.Bakı, 1926
2. Hacıyev M. Mənim tələbəlik illərim.”Gənc müəllim” qəzeti, 30 mart 1972
3. Собрание узаконений и распоряжений правительства АССР за 1921 год. Баку,1921,№8, стр.255
4. Ali Pedaqoji İnstitutun salnaməsi. Bakı,1924
5. Собрание узаконений и распоряжений правительства АССР за 1922 год. Баку,1923
6. Gəncəli S.Hər sətirdə bir tarix.Bakı, Şur, Cik-cik, 1994, s.176-177
7. Azərbaycan müəllimlərinin III qurultayı. https://az.wikipedia.org /wiki/
8. Xuramoviç S. Azərbaycan Ünas Pedaqoji İnstitutu və onun gələcəyi. Ali Pedaqoji İnstitut. 5 illik. Bakı, 1926
9. Dünyamalı Q. Xoşbəxt ailələri, xoş güzəranları var idi, amma... “Kaspi” qəzeti, 2 mart 2017

# ALİ PEDAQOJİ İNSTİTUTUN NƏZDİNDƏKİ "NÜMUNƏ MƏKTƏBİ"



**Abdulla Şaiq "Nümunə məktəbi"nin Pedaqoji şurasının üzvləri**



**QAFUR ƏFƏNDİZADƏ (QANTƏMİR)**
*"Nümunə məktəbi"nin müdiri*
*(1888-1938)*

1919-cu ilin əvvəlində Azərbaycanda 23 dövlət orta təhsil müəssisəsi – 6 kişi, 4 qadın gimnaziyası, 5 realnı məktəb, 3 müəllimlər seminariyası, 3 ”Müqəddəs Nina” qız məktəbi, politexnik məktəb və kommersiya məktəbi fəaliyyət göstərirdi. Bunların heç biri milli məktəb deyildi, təlim rus dilində aparılırdı. Azərbaycan Xalq Cümhuriyyəti dövründə qısa bir müddətdə Bakı politexnik, kommersiya məktəbləri istisna edilməklə bütün orta təhsil müəssisələri, o cümlədən III, IV kişi və II, III, IV qadın gimnaziyaları milliləşdirilmişdi. Hökümətin 28 avqust 1918- ci il tarixli qərarına əsasən bütün məktəblərdə Azərbaycan dilinin məcburi tədrisi qanuniləşdirilmişdi. Xalq maarifi sahəsində milliyyətindən, dini mənsubiyyətindən və cinsindən asılı olmayaraq, bütün vətəndaşlara bərabər hüquq verilir, ümumi, pulsuz, icbari təhsil elan olunurdu. Milliləşdirilmiş məktəblərdə rus tarixinin yerinə ümumi türk tarixi, rus məktəblərində isə həftədə 3-4 saat Azərbaycan dili tədris olunurdu. Azərbaycanda ana dilində orta məktəb yox idi. Ana dili o dövrün orta təhsil ocağı sayılan real məktəblərdə həftədə bir-iki dəfə keçirilən məcburi olmayan fənn hesab olunurdu. İlk dəfə orta təhsilin milliləşdirilməsi Demokratik Respublika dövründə həyata keçirildi ki, bu da A.Şaiqin adı ilə bağlıdır. Məhz onun təşəbbüsü ilə bütün dərslər rus dilində keçirilən Bakı I realnı məktəbinin nəzdində Azərbaycan dili üzrə üç aylıq kurs açıldı. Bu kursu qurtaran şagirdlər üçün Bakı I realnı məktəbində bütün dərslər Azərbaycan dilində keçirilən bir sinif (üçüncü sinif) təşkil olundu (1). O dövrdə Bakı I realnı məktəbin direktoru təcrübəli pedaqoq Denfer idi. A.Şaiq həmin məktəbin ana dili müəllimi idi. Təlimin ana dilində aparılacağı sinfin təşkili, ayrı-ayrı fənlərdən Azərbaycan dilində dərs deyə biləcək müəllimlərin tapılması A.Şaiqə həvalə olunmuşdu. A.Şaiq xatirələrində “Nümunə məktəbi”nin

***Qafur Əfəndizadə***

yaranmasındakı çətinlikləri şərh etdikdən sonra buraya cəlb edilən müəllim kadrlarından söhbət açır: "Davamlı mübarizələrdən sonra beş sinif təşkil edildi. Tanıdığım fəal və bilikli müəllimlərdən Cəmo Cəbrayılbəylini, Qafur Rəşadı, Qasımov Əli Raqibi riyaziyyat, təbiyyat və coğrafiya dərslərini aparmaq üçün dəvət etdim... Bununla da sonralar Şaiq adına nümunə məktəbi adını daşıyacaq tədris müəssisəsinin əsası qoyuldu." (2, 295) Q.Rəşadla birlikdə həmin təhsil ocağında iş yoldaşı olmuş C.Cəbrayılbəyli də məktəbə dəvət olunan "fəal və bilikli" müəllimlər cərgəsində bu bacarıqlı coğrafiya mütəxəssisindən də bəhs edir (3, 133).

Qafur Rəşad orada milli dildə dərs deyən ilk coğrafiya müəllimi olub. Məktəbin təşkili tarixi "Ali Pedaqoji İnstitutun salnaməsi"ndə belə təsvir edilir:" *Məzkur təşkilatın Xalq Maarif Komissarlığı tərəfindən Azərbaycanda, Gürcüstanda və Ermənistandaki məktəblərin milliləşməsi haqqında əmr sədr olmuş və təcili surətdə icra edilməsi məktəb müdirlərinə bildirilmişdi. O zaman Azərbaycan maarif işləri nümayəndəsi Həmid Şahtaxtlıdan bütün Azərbaycan məktəb müdirlərinə olduğu kimi sabiq realnı məktəbi müdirinə də bu xüsusda əmr gəlmiş, o zamana qədər kəndilərini hakim hiss etmiş olan rus müdir və müəllimlərini böyük təşvişə salmışdı. Məcburi dəvət edilmiş müəllimlər şurasının o vaxta qədər görülməmiş gurultulu-patırdılı iclasında , nəhayət, aşağı siniflərin milliləşməsinə qərar verilmiş və bu dəxi türk dili müəllimi Abdulla Şaiqə həvalə edilmişdi, onun göstərməsilə Cəbrailbəyli Cəmo, Qasımzadə Ağa Əli, Qafur Rəşad və Realnı məktəbini ikmal etmiş olan Quluzadə Sadiq, Həsənzadə Qulam Əli və əski müəllimlərdən Abaşidze Abdullah müəllimlər şurasında qəbul olunmuş və bu yeni qüvvət sayəsində realnı məktəbində 8 sinif milliləşdirilmişdir:*
*- Əlifba şöbəsi 1, birinci ehtiyat şöbəsi 2, ikinci ehtiyat şöbəsi 2, birinci sinif 2, ikinci sinif 1.*



*Abdulla Şaiq*

*Məktəblərin qapıları yüzlərinə geniş-geniş açılmış türk çocuqlarının və əsarət zəncirlərindən qurtulmuş türk müəllimlərinin yüzü gülüyor və onlara həvalə edilən müqəddəs vəzifəni kamali ciddiyyətlə ifaya çalışıyorlardı.*

*İstər Qafqaziya komissarlığı, istər sonrakı Müsavat hökuməti zamanında çar əsarətindən qurtulmuş türk müəllimlərini də əski düşüncə və müəllimlərindən*

*ayrılmaq istəməyən rus müdir və müəllimlərinin əsarətindən qurtulamıyordu. Onlar bir kərə Azərbaycan xalqını tanımaq istəmədikləri kimi onların lisanını, məktəblərini və müəllimlərini də tanımaq və görmək istəmiyorlardı. Şurayi müəllimin iclası gurultusuz-patırtısız keçəmiyor, hər zaman milli siniflərin önünə qocaman kötüklər yuvarlanaraq onu fəaliyyətdən durdurmaq və müəllimlərin ruh və enerjini qırmaq istərlərdi.*

*Lakin milli siniflər gənc və həvəskar müəllimlər çalışması sayəsində gündən günə irəliləyor və tərəqqiyə doğru şitab ediyordu. İşbu siniflərin milliləşdiyinin 2-ci sənəsi realnı məktəbi daxilində 9 türk və 12 rus sinifləri mövcud idi. Sənə nəhayətindəki otçotda işbu 21 sinifdən milliləşən son üçüncü sinif əxlaq və müvəffəqiyyətcə birinciliyi qazanmışdı. Sinif mürəbbisi Abdullah Şaiq şurayi müəlliminə üçüncü sinfin müvəffəqiyyəti haqqında izahat verdyindən sonra "Əxlaqları haqqında kimsədən bir şikayət eşitmədim. Tələbədən məmnun qalmayan müəllimlər varsa söyləsinlər" deməsilə fransız lisanı müəlliməsi Qaplanova, alman lisanı müəlliməsi Barzak: biz bu sinfi nümunə görüyor və heç bir fənalığa təsadüf etmirik, dedilər. Və müdir ... də onların sözlərini təsdiq etmişdi. İştə bu yıl məktəbimizi ikmal edən tələbələr 21 sinif içində nümunə olaraq göstərilən sinifdir.*

*Milli siniflərin tarixcəsi bununla da bitmiyor, şura hökumətinin təsisindən sonra məktəb binasını əsgərlər işğal etdiyindən məktəb binasız qaldı. Nəhayət, bir çox təşəbbüsatdan sonra əski 4-cü qız ədadisi binasında öylədən sonra oxumaq şərtilə müsaidə verildi. Məktəb oraya köçmək məcburiyyətində qaldı və bir sənə orada davam etdi. Şura hökuməti zamanında bu məktəb ikiyə ayrıldı. Aşağı şöbələr və siniflər birinci dərəcə 9-cu məktəb, 3-cü sinifdən etibarən ikinci dərəcəli 12-ci məktəb namını aldı. O zaman yoldaş Rzabəyli Fəthullah tərəfindən açılmış olan sənəlik pedaqoji kursları bitmiş və onun qutlu, yaradıcı əllərilə Ali Pedaqoji İnstitutunun təməli qurulmuşdu. İnstitut müdiri Rzabəylinin arzusu ilə işbu 12-ci məktəb Ali Pedaqoji İnstitutunun binasına köçürülüb institutun nümunə məktəbi namını aldı"*[53].

Məktəbdə anadilli siniflərin yaradılmasının, şagird kontingentinin seçilib yerləşdirilməsinin, müəllimlərin işə cəlb edilməsinin fəal təşkilatçısı və iştirakçısı Abdulla Şaiq olduğundan sonrakı illərdə həmin məktəb *"Abdulla Şaiq nümunə məktəbi"* ünvanı ilə tanınırdı. Məktəbin ilk anadilli orta məktəb kimi formalaşmasında A.Şaiqlə birlikdə C.Cəbrayılbəyli, Q.Rəşad, Əli Raqib Qasımov, X.Kələntərli kimi görkəmli şəxslərin mühüm xidmətləri olmuşdur. İlk anadilli sinifdə 25 şagird oxuyurdu.ADR dövründə məktəbin buraxılışı olmasa da, Azərbaycanda bolşevik çevrilişindən sonra da fəaliyyətini davam

[53] Ali Pedaqoji İnstitutun salnaməsi. Azərbaycan Dövləti Türk Ali Pedaqoji İnstitutu üç sənəliyi və ilk məzunları dolayısı ilə nəşr olunur. Bakı, Azərbaycan Dövlət Xalq Nəşriyyatı, 1924

***Qafur Əfəndizadə***

etdirdi. Azərbaycan Xalq Maarif Komissarlığının 13 iyul 1921-ci il tarixli Kollegiya iclasında Ali Pedaqoji Kişi İnstitutunun ilk nizamnaməsi təsdiq olunarkən 40 nəfərlik pansion (yataqxana) ilə bərabər tələbələrin təcrübə aparması üçün nümunə məktəbi təşkil etmək qərara alınmışdı. İnstitutun yaradıcılarından biri olan A.Şaiqin təşəbbüsü ilə onun yaratdığı nümunə məktəbi institutun nəzdinə verildi. İlk vaxtlar məktəbə A.Şaiq rəhbərlik edirdi. Sonra məktəbə coğrafiya və təbiət fənlərini tədris edən Qafur Əfəndizadə müdir təyin olundu.”Nümunə məktəbi” Ali Pedaqoji İnstitutun tələbələrinin laboratoriyası idi. Tələbələr həmin məktəbdə təcrübə keçir, sınaq dərsləri deyirdilər. Bu məktəbin ali pedaqoji məktəb üçün kadr hazırlığında mühüm xidmətləri olmuşdur. A.Şaiq Ali Pedaqoji İnstitut haqqında “İnstitutun marşı” adlı bir şeir yazmışdır. Ü.Hacıbəyovun musiqi bəslədiyi həmin marş institutun xor dərnəyində məharətlə ifadə olunurdu.

Abdulla Şaiq "Nümunə məktəbi”nin ilk buraxılışı 1924-cü ildə olmuşdur. İlk məzunlar şərəfi aşağıda adları qeyd olunan şagirdlərə nəsib olub.

| | |
|---|---|
| 1.Ağazadə Soltan | Göyçay |
| 2.Əfəndizadə Azad | Şamaxı |
| 3. Əfəndizadə Əli Fuad | Axısqa (Gürcüstan) |
| 4. Əfəndizadə Adil | Axısqa (Gürcüstan |
| 5.İbrahimzadə Şirəli | Göyçay |
| 6.İbrahimzadə Sadiq | Göyçay |
| 7.İsmayılzadə Yəhya | Göyçay |
| 8.Babazadə Əhməd | Bakı |
| 9.Bədəlbəyli Əfrasiyab | Qarabağ |
| 10.Bağırzadə Məhəmmədəmin | Bakı |
| 11.Hacı oğlu Vəli | Bakı |
| 12.Hüseynzadə Əbdülrəhman | Bakı |
| 13.Süleymanzadə İsrafil | Bakı |
| 14.Şıxəlizadə Murad | Göyçay |
| 15.Salahlı Saleh | Bakı |
| 16.Talıbzadə Talıb | Tiflis |
| 17.Əlizadə Ağakazım | Bakı |
| 18.Əlizadə Məhəmmədbağır | Göyçay |
| 19.Aşurbəyli Davud | Bakı |
| 20.Quluzadə Rəsul | Bakı |
| 21.Kazımzadə Qasım | Bakı |
| 22.Musabəyli Əmir | Şəki |
| 23.Mustafabəyli Ədhəm | Bakı |

***Qafur Əfəndizadə***

24. Məhəmmədzadə Nəcəf Bakı
25. Mirzəzadə Arslan Bakı
26. Mirəhmədzadə Mir Əsədullah Göyçay
27. Yüzbaşıqlı Rəmzi Şamaxı

Bunların 15-i kəndli, 7-i fəhlə və 5-i ziyalı ailəsinə mənsub idi.

Məktəbin ikinci buraxılışı 1925-ci ildə, üçüncü buraxılışı 1926-cı ildə olub.

1924-cü ildə "Nümunə məktəbi"nin quruluşu aşağıdakı kimi idi. Məktəb 4 sinifli və ikinci dərəcəli bir təhsil ocağı idi. 4 sinifdə oxuyan şagirdlərin ümumi sayı 129 nəfər idi. Bunlardan 42-si bakılı, 78-i Azərbaycanın ayrı-ayrı bölgələrindən, İrəvandan və Göyçə mahalından gələnlər idi. Kənardan gələn imkansız tələbələr Ali Pedaqoji İnstitutun pansionunda (yataqxanasında) yaşayırdı. Birinci sinifdə 40, ikincidə 36, üçüncüdə 26 və dördüncü sinifdə 27 şagird oxuyurdu.

Məktəbin Azərbaycan dili və ədəbiyyat müəllimləri Abdulla Şaiq və Hüseyn Sadıq idi. I-II siniflərdə Azərbaycan dili dərslərini Hüseyn Sadıq, rus dili dərslərini Səmədağa Qayıbov, III-IV siniflərdə Aleksandr Leplinski tədris edirdi. Tarix və ictimaiyyatı Süleyman Səlim, riyaziyyatı I-II siniflərdə Ziya Azaqbəyli, III-IV siniflərdə Kərim Qazıyev, triqonometriyanı son sinifdə Məhəmməd Əfəndizadə tədris edirdi.

Yalnız III-IV siniflərdə öyrədilən psixologiya fənnini doktor Xəlil Fikrət, I-II siniflərdə təbiət fənnini Ali Pedaqoji İnstitutun təbiət şöbəsinin son kurs tələbəsi Neman Əfəndizadə, III-IV siniflərdə isə Məhəmməd Bayramzadə, “Hikmət” fənnini I sinifdə Xudaverdi Kələntərli, II-IV sinflərdə İsmayıl Novruzi tədris edirdi.

Məktəbin bütün siniflərində kimya Xudaverdi Kələntərli, coğrafiya Qafur Rəşad Mirzəzadə, alman dili İvan Viktoroviç Denfer, rəsm dərsi İvan Vasilyeviç Berinq tərəfindən tədris edilirdi. Zəruri təcrübələr Ali Pedaqoji İnstitutun laboratoriyalarında aparılırdı.

Məktəbdə şagird komitəsi fəaliyyət göstərirdi. Bütün şagirdlərin iştirakı etdiyi ümumi iclasda seçilən bu komitənin nəzdində ədəbiyyat, riyaziyyat və təbiət dərnəkləri fəaliyyət göstərirdi. Məktəbdə fəaliyyət göstərən gənclər ittifaqı Ali Pedaqoji Kişi və Ali Pedaqoji Qadın İnstitutlarının gənclər heyətilə birlikdə işləyirdi.

Nümunə məktəbinin xüsusi təsərrüfat fəaliyyəti yox idi. Məktəbin bütün xərcləri (hətta müəllimlərin əməkhaqqı da) Ali Pedaqoji İnstitutun təsərrüfat və maliyyə şöbəsi tərəfindən ödənilirdi.

Nümunə məktəbi 1925-ci ildə A.Şaiq adına Pedaqoji Texnikuma çevrildi.

1926-cı ildə Ali Pedaqoji İnstitutun 5 illik yubileyi münasibətilə buraxılan “Ali Pedaqoji İnstitut. 5 illik” adlı məcmuədə məktəbin müdiri

***Qafur Əfəndizadə***

***Qafur Əfəndizadənin "Şaiq adına Pedaqoji Texnikum"*** (4) adlı məqaləsi verilib. Həmin məqaləni olduğu kimi verməyi məqsədəuyğun hesab edirəm. Məqalədə yazılır:" *İki sənədən bəri pedaqoji təmayülü verilən məktəbimiz bu yıl üçüncü buraxılışını bayram ediyor.*

*Bu yıl qurtaran 23 tələbə həm ali məktəbə girmək və həm də birinci dərəcəli məktəblərdə müəllimlik etmək haqqını haizdirlər. 4 sənədən bəri müqtədir müəllimlərinin rəhbərliyi altında ciddiyyətlə çalışan bu yavrular əcəba başqa bir mahiyyətə yeni bir hayata atılmağa hazırdırlarmı? Bu suala qısaca bir cavab verelim. Darülfünunmuzdan bizlərə qədər əks edən xəbərlərə görə Şaiq məktəbini ikmal edənlər orada birinciliyi qazanmışlardır. Tədrisat cəhətindən get-gedə təcrübəsini artıran məktəbimiz üçüncü qafilənin də orada birincilik qazanacağına iman edər.*

*Birinci dərəcəli məktəblərdə dərs vermək cəhətinə gəlincə artıq 7 aydır ki, bu tələbələr şəhərimizin müxtəlif məktəblərində, müxtəlif siniflərində nümunəlik dərsi verirlər.*

*Nümunə dərsləri müvəffəqiyyətli surətdə getmişdir.*

*Məktəbdə təşkilatlar haqqında burada izahata lüzum görmüyorum.*

*Birinci salnamədə (1924-cü ildə nəşr olunan "Ali Pedaqoji İnstitutun salnaməsi" kitabı nəzərdə tutulur- F.R.) bu barədə kafi məlumat verilmişdir.*

Bu yıl qurtaranlar şunlardır:

| | |
|---|---|
| 1.Əhməd Əsədzadə | Salyan |
| 2.Zərgərli Yunis | Salyan |
| 3.Xanızadə Babazər | Salyan |
| 4.Kərimzadə Bilal | Salyan |
| 5.Kərim Cəmaləddin | Göyçə eli |
| 6.Məhəmmədzadə Əli Ağa | Göyçə eli |
| 7.Əbülqasım Nəzərov | Göyçə eli |
| 8.Şirinzadə Şamil | Nuxa |
| 9.Əli Əhmədzadə | İrəvan |
| 10.Əbu Talibzadə Müzəffər | Ordubad |
| 11.Aslanzadə Muxtar | Bakı |
| 12. Bağbanzadə Cavad | İran |
| 13.Şabanzadə Hacı Ağa | Bakı |
| 14.Salahlı Məhəmməd Əmin | Bakı |
| 15.Sadıqzadə Məhəmməd Sadıq | Bakı |
| 16.Abdullazadə Cəfər | Naxçıvan |
| 17.Abdullazadə Abdulla | Şamaxı |
| 18.Qazizadə Marlen | İrəvan |

***Qafur Əfəndizadə***

| | |
|---|---|
| 19.Quluzadə Məhəmməd Ağa | Bakı |
| 20.Kazımzadə Əhməd | Bakı |
| 21.Məhəmmədzadə Rəhim | Bakı |
| 22.Məhərrəmzadə Kərim | Şamaxı |
| 23.Məhəmmədəli Kərimzadə | Bakı |

***Məktəb müdiri: Qafur***

Ali Pedaqoji İnstitutun nəzdindəki əvvəlcə "Nümunə məktəbi"nin və Şaiq adına Pedaqoji Texnikumun müdiri olmuş ***Qafur*** kimdir?

***Qafur Sədrəddin oğlu Əfəndizadə*** (Qantəmir) 1888-ci ildə Göyçay qəzasının Potu kəndində anadan olmuşdur. Mədrəsə müəllimi olan Qafurun atası Sədrəddin Əfəndi dövrünün tanınmış ziyalılarından biri olub. Hətta Sədi Salis təxəllüsü ilə şeirlər yazıb. Qafur ilk təhsilini atasının müəllim işlədiyi mədrəsədə alıb. Uşaqlıq illərindən klassik şairləri, xüsusilə də Şərq ədəbiyyatını mütaliə edib, sənətə, elmə xüsusi maraq göstərib. Şair təbiətli Sədrəddin kişi oğlunun qabiliyyətindən xəbərdar olduğundan onu mükəmməl oxutmaq arzusunda idi. Bu səbəbdən də Qafur 1905-ci ildə Göyçaya gələrək İbrahim Həqqinin yeni üsullu məktəbinə daxil olub. Sonra ali təhsil almaq məqsədilə Türkiyə gedib. 1910-1914-cü illərdə İstanbul Universitetinin Tarix-filologiya fakültəsində oxuyub. Burada yaradıcılıqla məşğul olaraq kiçik hekayələr yazıb. Qantəmir imzasını da Türkiyə mühitində yaşayarkən götürüb. Hüseyn Caviddən sonra Azərbaycan ədəbiyyatına, mühitinə İstanbul ruzigarı gətirənlərdən biri Qantəmir olub. Q.Əfəndiyev İstanbul Universitetini bitirdiyi zaman orada qalıb çalışa bilərdi, oranın yaradıcı mühitində tanınmağa başlamış və özünə çoxlu dostlar tapmışdı. Azərbaycanın müstəqilliyinə son qoyulduqdan sonra da o, öz vətənində qalmağa üstünlük verdi. Yazıçı həmin dövrdə yazdığı məqalələrinin birində deyirdi: *"Hamı bu ölkəni tərk etməyə cəhd göstərir. Belə getsə, bu məmləkətdə kim qalacaq? Bu məmləkət bizə babalarımızdan yadigar qalıb. Onu qoruyub saxlamaq və gələcək nəsillərə çatdırmaq və bu yolda mübarizələr aparmaq müqəddəs vəzifələrimizdən biri olmalıdır".*

Qantəmir 1908-ci ildə Göyçayda pedaqoji fəaliyyətə başlayıb. 1915-ci ildə fəaliyyətini şəhərdə yeni açılan "İqbal" məktəbində davam etdirib. 1916-cı ildə "Nəşri-maarif" cəmiyyətinin Qubada açdığı məktəbə müdir təyin olunub. Qantəmir bir müddət bu bölgədə yeni tipli məktəblərin təşkilində və fəaliyyətində fədakarlıqla çalışıb. Müəllim və məktəb direktoru kimi ömrünü gənc nəslin təlim-tərbiyəsinə həsr edib. Müəllim işlədiyi dövrdə Abbas Səhhətlə, Mirzə Ələkbər Sabirlə dostluq edib, onlarla sıx yaradıcılıq əlaqəsi saxlayıb. Bədii yaradıcılığa 1924-cü ildən başlayıb. "Buğda quyusu", "Sara bibi", "Hacı Qambay", "Vəsiyyət" və digər satirik hekayələrində ictimai

***Qafur Əfəndizadə***

tərəqqiyə, qadın azadlıqlarına mane olanları, fırıldaqçı mollaları kəskin tənqid edib. O, "Qisas alındı", "Nisa xala", "Zeynəb Tükəzbanova", "Kiçik Volodya" və digər əsərlərində inkişafı, tərəqqini tərənnüm edib. Satirik hekayələrində Sabir ruhunun təsiri aydın duyulur. Gəncliyində yazdığı bir-iki şeiri nəzərə almasaq, Qantəmir ədəbiyyatımızda, əsasən, satirik hekayələr ustadı kimi öz adını əbədi həkk etdirib.

Arif Abdullazadə yazıçının 1972-ci ildə çap edilmiş "Seçilmiş əsərləri"nə yazdığı ön sözdə bildirir: "*Qantəmir realist yazıçıdır. Bu realizmin gücü hər şeydən əvvəl Azərbaycan xalqının 1905-ci il inqilabından sonrakı və xüsusən, sovet dövrü həyatını, məişətini, yeni cəmiyyətin bir çox ictimai xüsusiyyətlərini real, bədii cizgilərlə əks etdirməsindədir*". Qantəmirin realizmində həyatın təsviri tənqidi mövqe, satirik gülüş və yumor ilə üzvi surətdə bağlanır. Ədibin yaradıcılığında satira daha qüvvətli olduğundan, yumor, gülüş özünün ən yüksək ifadəsini yalnız bu satirada tapır. Ciddi və aydın kompozisiya, rəvan və duzlu dil, tam portretli və bitkin xarakterli obrazlar qalereyası Qantəmir yaradıcılığını səciyyələndirən xüsusiyyətlərdir.

O, 1920-1921-ci illərdə Göyçayda müəllim hazırlamaq məqsədilə yaradılan qısamüddətli pedaqoji kurslara rəhbərlik edib. Ömrünün sonuna kimi də orta və ali məktəblərdə müxtəlif fənlərdən dərs deyib. Ali Pedaqoji İnstitutun nəzdində fəaliyyət göstərən Şaiq nümunə məktəbinə rəhbərlik edib. Nümunə məktəbi Abdulla Şaiq adına Pedaqoji Texnikuma çevriləndə onun direktoru təyin edilib. O, müəllimlikdən ayrılmadan Azərbaycan Dövlət Universitetinin tibb fakültəsinə (diş həkimliyi) daxil olub və 1929-cu ildə oranı bitirib.

30-cu illərdə Bakıda ictimai-siyasi həyatda və ədəbi aləmdə yersiz qarayaxmalar, qarşılıqlı ittihamlar, şərləmələr baş verəndə o, Ağsu rayonuna köçür və burada diş həkimi kimi fəaliyyətə başlayır. *"Bizim əsas məqsədimiz **Azərbaycanın müstəqilliyinin qorunmasıdır**. Bu müstəqillik asan alınmayıb, tökülən şəhid qanları hesabına başa gəlib. Biz onların axıtdıqları qanların hədər getməsinə yol verməməli, müstəqilliyimizin qorunub saxlanılması üçün hər birimiz şirin canımızdan keçməyi bacarmalıyıq. Zira millətimizin gələcəyinə və müstəqilliyimizin hifz olunmasına yol ancaq bundan keçir"*- sözlərinin müəllifi Qantəmir repressiya maşınının təzyiqindən yaxa qurtara bilmir. O, hədəfə alınan yazarlardan biri idi.

"Kommunist" qəzetinin 3 fevral 1936 –cı il sayında Ə. Hidayət imzalı müəllifin Qantəmir (Qafur Əfəndiyev - 1884-1944) haqqında *"Boş və mənasız hırıltıya qarşı"* məqaləsi yer alır. *"Qantəmiri biz hələ bu günə qədər xırda hekayələr müəllifi kimi tanıyırıq. Bu, həqiqətən, belədir. Qantəmir bizim nəsrimizə özünün haman xırda hekayələri ilə girmişdir.Onun yaradıcılıq*

*biografiyasını da haman xırda hekayələr təşkil edir. Qantəmir bizdə, demək olar ki, 1926-27-ci illərdən aktiv yazmağa və çap edilməyə başlamışdır. Qantəmirin firqəmizin aprel qərarına qədər yazmış olduğu hekayələr onun "Ağıl dəryası" və "Şarlatanlar" kitabçasında toplanmışdır. Qantəmirin yazıçılıq yolu çox qısadır. Bu yaradıcılıq dərin və mürəkkəb bədii axtarış yolları ilə deyil, çox primitiv xətlərlə gedir. O, bizim ədəbiyyatımıza özünəməxsus yol ilə gəlmişdir. Lakin bu yolda mahiyyət etibarilə heç bir orijinallıq yoxdur. Buna görə, Qantəmirin yazıçılıq yolu, bizim ədəbi-bədii inkişafımız üçün deyil, bəlkə onun özü üçün daha xarakterikdir. Qantəmirin hekayələrində tematik müxtəliflik, öz yaradıcılıq diapazonunu genişləndirmək təşəbbüsü görünmür. Onun əsərlərində bizim ictimai varlığımızı qalib sosializm quruluşu pozisiyalarından görən və qiymətləndirən gənc şura yazıçısının həqiqi dünyanı anlayış ədası yoxdur. O, öz hekayələrinin süjetini inkişaf etdirərək, hadisələrin ancaq zahiri fonu ilə kifayətlənir.O, bizim ictimai varlığımızdakı hadisələrin hər birində bir məna, hər bir hərəkətdə bir istiqamət axtarmır. Onun üçün hərəkətlərin və hadisələrin bilavasitə istiqaməti və məqsədə doğru hərəkəti yoxdur.Müəllif bizim həyatımızın ancaq mənfi tərəflərini görür və mənfi hadisə və faktlar həmişə onun əsərlərində həddən artıq şişirdilir, ümumilik və xarakterlilik mövqeyinə qaldırılır və bununla müəllif açıqdan - açığa bizim ictimai varlığımızı təhrif edir, saxtalaşdırır. Məsələn, Qantəmir özünün "Xanım Əminə" hekayəsində Bakının türk hissəsini və yeni Şura küçəsi rayonunu; buradakı nümunəvi dövlət müəssisələrinə, kino, teatrolara, nümunəvi cocuq baxçalarına, məktəblərə, radio stansiyalara və səhiyyə müəssisələrinə baxmayaraq ən cahil, ən avam, insan həyatından uzaq, səfalət yuvası kimi göstərməyə çalışır. Adama belə gəlir ki, müəllif proletar sosialist Bakısının tamamilə yeni, nümunəvi və sürətlə boy atan şura rayonundan deyil, köhnə patriarxal İran şəhərlərindən danışır. Qantəmirin yazıçılıq gözü görünməz bir sürətlə böyüyən bu rayonda şura yazıçısının qələminə layiq qəti sürətdə heç bir müsbət cəhət tapa bilmir. Qantəmir sosialist Bakısının mərkəzi olacaq bu rayona ancaq şəhvət oyadan qızlara və gəlinlərə baxmaq üçün gedir. Burada həqiqi insan həyatı, şura və sosializm quruluşu həyatı yoxdur.*

*Müəllif yazır:"15 yaşını yenicə doldurmuş sütül gəlinlərə ancaq bu dairədə rast gəlmək olar".Həqiqətən, Qantəmiri ancaq bu gəlinlərə baxmaq, bunların dedi-qodularını dinləmək maraqlandırır, "siz hər nə rəng verirsiniz verin mənim ən çox xoşuma gələn şey arvad davasıdır". Bu Qantəmirin ən səmimi ifadəsidir.Qantəmir ən qabaqcıl, ən aktiv, hətta firqəçi və komsomolçu qadında və qızda bir dənə də olsun müsbət insani xüsusiyyət görə bilmir. Onun üçün qadın ancaq əyləncə, "saçının uzunluğuna rəğmən əqli qısa", sütül bədənli və ictimai işə yaramayan bir şəhvət obyektidir. Qantəmirin bu*

*tipləri əsərinə almaqda məqsədi qabaqcıl əməkçi türk qadınlarının obrazını yaratmaq deyil, bu tiplər simasında oxucunun hırıltısına səbəb olan qondarma və süni cizgilər qeyd etməkdir. Qantəmirin hekayələrində "bitərəflik" və "obyektivizm" ruhu hökm sürür. Onun hekayələrində hər şeydən əvvəl ictimai kəsər yoxdur. Qantəmirin yumoristliyi haqqında çox danışılır. Doğrudur, bu hekayələr adamı bəzən güldürür, ancaq bu gülüş boş və mənasız hırıltıdan ibarət olaraq qalır. Bəzən oxucu bu hekayələrdəki tiplərə deyil, müəllifin gülünc vəziyyətinə gülür. Qantəmirin bədii dil və bədii ifadə vasitələrinə malik ola bilməməsi xüsusi qeyd edilməlidir. O, çox çürük, çox yabancı epitetlərdən və müqayisələrdən istifadə edir. Qantəmir öz əsərlərində effekt yaratmaq üçün bir sıra ən çirkin, ən ləyaqətsiz sözlərə və küçə söyüşlərinə əl atır.Bu tendensiya Qantəmirdə ən zərərli bir təsir halındadır. Bu bizim tərəfimizdən qəti və amansız ifşa edilməlidir. Bu əsərlərin Azərnəşrin bədii ədəbiyyat şöbəsi tərəfindən bu şəkildə buraxılması böyük bir səhv və bağışlanmaz qüsurdur. Qantəmir öz yaradıcılığı ilə təhlükəli bir yoldadır. O, tutmuş olduğu bu mənfi istiqamətdən mütləq çevrilməli və həqiqi yenidən qurulma yollarına düşməlidir."*

Qantəmir 16 fevral 1938-də həbs edilərək 8 il müddətinə Özbəkistanın Cizak vilayətinə sürgün edilir. 28 yanvar 1944-cü ildə sürgündə olarkən dünyasını dəyişir.

Sağlığında ikən "Ağıl dəryası"(1930), "Şarlatan" (1934), "Kolxozstan" (1935) kitabları nəşr olunub. 1964 və 1972-ci illərdə "Seçilmiş hekayələr"i nəşr olunub.

## Ədəbiyyat


4. Abdullayev A. Qantəmirin həyatı və yaradıcılığı. Filologiya elmləri namizədi alimlik dərəcəsi almaq üçün dissertasiyanın avtoreferatı. B., 1964
5. Azərbaycan sovet ədəbiyyatı tarixi, 2 cilddə, c.l, B., 1967
6. Zamanın özü, yazıçının sözü: кim idi Qantəmir? https://news.day.az/culture/312898.html
7. Qantəmir Qafur. https://az.wikipedia.org/wiki/Qantəmir_Qafur
8. Qafur Əfəndizadə. https://az.wikipedia.org/wiki/Qafur_Əfəndizadə
9. Qantəmir. https://az.wikipedia.org/wiki/Qantəmir

## Görkəmli partiya və dövlət xadimi Nəriman Nərimanovun Azərbaycan Ali Pedaqoji İnstitutunun ilk məzunlarına təbriki

*Elmlərini yeni tamam etmiş müəllimlərə açıq məktub*



Əziz yoldaşlar, təzə həyata qədəminizi təbrik edirəm. Vəzifəniz hər nə qədər qayət çətin və məsuliyyətli bir vəzifədirsə də bunu da düşünməlisiniz: insanın ruhunu ucaldan bir çox şey vardır ki, onun ən birincisi zəhmətdir. Mən istərdim, siz gələcək həyatınızda üç məsələyə diqqət edəsiniz:

1) Sizin tərbiyənizdə olan Azərbaycan balaları gərək zəhmət sevən olsunlar, yəni çətinlikləri başqasının yox, öz zəhmətləri ilə rəf etsinlər. Bunun üçün balalara təbiəti sevdirmək, onları təbiətin əlamətləri ilə maraqlandırmaq lazım gəlir.

2) Sizin tərbiyənizdən çıxan cavanlarımız gərək cəsur, cürətli və dəyanətli olsunlar. Yəni bir parça çörəkdən ötrü ikiüzlülük etməsinlər, filankəsin xoşuna gəlmək üçün "qatığa qara" deməsinlər.

Amandır, yoldaşlar. Buna yaxşı fikir veriniz. Mənsəbdən ötrü yalan söyləyən, gündə vicdanını satan "ikiüzlü" adamlar bizim gələcək kommunaya üzv ola bilməzlər. Ona binaən uşaqlarla daima əlaqədə olaraq hərəkətinizdə, sözünüzdə artıq dərəcədə ehtiyatlı olmalısınız. Çünki uşaq gördüyünü tez götürər.

3) Biz iddiamızdan əl çəkmirik, Azərbaycan Şərq üçün bir məktəbdir, yəni Şərq hazırkı halda qalırsa biz ona hər cəhətdən müəllim olacağıq. Beş ildən sonra Türkiyə, İran, Əfqan üçün bizim müəllimlərimiz elm-fənn meydanında hazır olacaqlar. Ona görə dilimizi lüzumsuz qeyrisinin lisanının təsiri altında saxlamaq bütün işimizi təxirə salar. Bu səbəblərə görə dilimizi müstəqil bir şəklə salmaqda üçün ən çox siz müəllimlərə ümid bağlayıb, məktəbi bitirmənizi yenə də səmimi qəlbdən təbrik edirəm.

**Nəriman Nərimanov**

## Azərbaycan SSR xalq maarif komissarı Mustafa Quliyevin Azərbaycan Ali Pedaqoji İnstitutunun ilk məzunlarına təbriki

***Məzunlara xitab***

Dəyərli yoldaşlar, ağır çalışmalar yılı içərisində sizin tərbiyə almış olduğunuz pedaqoji institutumuz meydana çıxarıldı. İşçi və köylülər kəndi istismarçılar əleyhinə apardıqları ağır mübarizələr içərisində ehtiyac və yoxsulluğa baxmayaraq maarif və mədəniyyətin ilk ocaqlarını yaratdılar. Maarif və mədəniyyət böylə parlaq ocaqları hal-hazırda kəndi məsul vəzifələrini ifa edən pedaqoji institutlarımızdır. Bu yıllarda şura hökuməti pedaqoji institutlarının işini böyük bir diqqətlə təqib ediyordu. Bu yıl artıq kəndi böyük bayramını -bu institutlardan ilk tələbə buraxılışını tərtib ediyor. Maarif işçilərinin xəyalları doğru oldu. Siz xalq maarifinin ilk mübarizləri, böyük xalq müəllimi adilə həyata addım atıyorsunuz.



Hər şeydən əvvəl pedaqoji maarifinin gələcək boyu və çiçəklənməsi: pedaqoji institutlarımızın gələcək nişanəsi və qəza darülmüəllimlərimizin möhkəmlənməsi sizin işlərinizdən asılıdır. Biz mükərrirən demişiz ki, pedaqoji məktəblərini pedaqoji məfkurəsinin mərkəzi ad etməli, bizim bütün müəllimlərimiz onların ətrafına toplanmalı orada bizim müəllimlərimizi hazırlamalı, tərbiyə və maarifin təməlini qoymalıyız. Müəllimlər sayının azlığı bizim pedaqoji məktəblərimizdə işi bu istiqamətə çevirməyə müsaidə etmiyordu. Siz var qüvvənizi bu sahəyə verməli və bütün enerji məktəbləri və texnikumlarımızın şərəfini yüksəltməlisiniz.

Siz məsudsunuz, zira siz böyük müəllim adını daşıyorsunuz. Sizin borcunuz bu böyük ada ləyaqətli olmanızdır. Əskidə müəllim bu çinovnik olmuş mülkədar və sərmayədarların qulu və hamisini rolunu oynuyordusa, şimdi şura müəllimi kəndi böyük vəzifəsini – yeni kommunizm cəmiyyətinin məsul yaradıcılığı və yeni nəslin tərbiyəçiliğini sədaqət və doğruluqla ifa etməlidir. Geri qalmış işçi və köylüyə ictimai bir işçi və rəhbər olmaq, zəhmətkeş həyatına yardımçı olmaq sizin vəzifəniz, sizin borcunuzdur.

Hər daim xatirdə saxlamalıdır ki, işçi və köylü kəndi sinfi düşmənləri, həyat-memat mübarizəsi veriyordurkən bitərəf qalmaq burjuaziyaya ən gözəl bir yardımda bulunmaqdır. Pedaqoji bitərəf qalmağa imkan verməz, yalnız kəndi xüsusi həyatı ilə maraqlanan mülkədar və dükancılar davam etməkdə olan sinif mübarizəsində bitərəf qala bilirlər. Şura müəllimi hər şeydən əvvəl kommunist cəmiyyətinin məsul təşkilatçısıdır.

Dəyərli yoldaşlar! Mən əminəm ki, siz şura hökumətinin qayə və məfkurəsinin nəqli olacaq və böyük gənc nəslin mürəbbisi adını məğruranə daşıyacaqsınız!

**Mustafa Quliyev**

## Ali Pedaqoji Kişi İnstitutunun ilk müəllimləri

1.**Fətulla bəy Rzabəyli** – müdir (biologiya və fiziologiya müəllimi (Odessa Universitetinin məzunu)

2.**Həbib Mahmudbəyov** – müdir müavini (rus dili müəllimi, Tiflis Aleksandrovski Müəllimlər İnstitutunun məzunu)

3.**Abdullah Şaiq Talıbzadə** - ədəbiyyat müəllimi

4.**Məhəmməd Əfəndiyev** – riyaziyyat müəllimi (Leninqrad Universitetinin məzunu)

5.**Həmid Şaxtaxtinski** – psixologiya müəllimi (Odessa Universitetinin məzunu)

6.**Sadiq Hüseynov** – kimya müəllimi (Darmştad Politexnikumunun məzunu)

7.**İsmayıl Novruzi** – fizika və təbiət müəllimi (İstanbul Universitetinin məzunu)

8.**V.V.Pismennaya** – rus dili müəllimi (Leninqrad Ali Pedaqoji İnstitutunun məzunu)



## Ali Pedaqoji Kişi İnstitutuna 1922-1923-cü tədris ilində dəvət olunan müəllimlər

| | |
|---|---|
| 1.**Davud Şərifli** – | antropologiya və rus dili müəllimi |
| 2.**Hüseyn Mirzə Camalov** – | siyasi iqtisad müəllimi |
| 3.**Fəthullah Əlizadə** - | anatomiya müəllimi |
| 4.**Keilhis** – | rəsm müəllimi |
| 5.**Mailyan** – | musiqi müəllimi |
| 6.**Berq** – | tətbiqi fizika müəllimi |
| 7.**İsmayıl Hikmət**- | türk ədəbiyyatı tarixi müəllimi |
| 8.**Xəlil Fikrət** - | pedaqogika və pedaqogika tarixi müəllimi |
| 9.**Rəhim Məlikov** – | fizika müəllimi |
| 10.**Mustafa Quliyev** – | siyasi iqtisad müəllimi |
| 11.**Xəlil Məhəmmədzadə** - | ictimaiyyat müəllimi |
| 12.**Səlimə xanım Osmanzadə** - | təbiət müəllimi |
| 13.**Mirzə Möhsün İbrahimov**– | fars ədəbiyyatı tarixi müəllimi |
| 14.**Mirqasımov Mirəsədulla** (həkim) | – anatomoya müəllimi |
| 15.**Abdulla bəy Azaqbəyli** – | məntiq və psixologiya müəllimi |
| 16.**B.Qarbulum** – | |
| 17.**Süleyman Səlim** – | coğrafiya müəllimi |
| 18.**Keylihis** – | qrafika müəllimi (Florensiya Rəsm Akademiyası məzunu) |
| **19. Doktor Məhəmməd Rza Vəkilov**– | məktəbin həkimi (Xarkov Universitetinin məzunu) |

## Ali Pedaqoji Kişi İnstitutunun 1922-1923-cü tədris ilində ilk tələbələri

| | |
|---|---|
| **1.Rəhimzadə Əbdülhəsən -** | Salyan qəzasından |
| **2.Musaxanlı Atababa -** | Bakı şəhərindən |
| **3.Axundzadə Vəli -** | Ağdam qəzasından |
| **4.Süleymanzadə Mahmud -** | Göyçay qəzasından |
| **5.Mustafazadə Ağaveyis -** | Göyçay qəzasından |
| **6.Adilzadə Abdülməsur -** | Türküstandan |



**Ali Pedaqoji Kişi İnstitutunun ilk məzunları**

| | |
|---|---|
| **1.Axundzadə Vəli-** | təbiət şöbəsinin məzunu (Ağdam qəzası) |
| **2.Əhmədbəyli Ali Ağa-** | təbiət şöbəsinin məzunu (Lənkəran qəzası) |
| **3.Əfəndizadə Əbdülrəşid-** | təbiət şöbəsinin məzunu (Nuxa qəzası) |
| **4.Əfəndizadə Neman-** | təbiət şöbəsinin məzunu (Göyçay qəzası) |
| **5.Bayramzadə Məhəmməd-** | təbiət şöbəsinin məzunu (Nuxa qəzası) |
| **6.Bağırzadə Məhəmməd-** | ədəbiyyat şöbəsinin məzunu (Gəncə) |
| **7.Cəfərzadə Həsən-** | təbiət şöbəsinin məzunu ( Gəncə qəzası) |
| **8.Hacızadə Hacıbala-** | təbiət şöbəsinin məzunu (Qazax qəzası) |
| **9.Hacızadə Vahid-** | təbiət şöbəsinin məzunu (Zaqatala qəzası) |
| **10.Hüseynzadə Surxay-** | təbiət şöbəsinin məzunu (Şuşa qəzası) |
| **11.Rəhimzadə Əbdülhüseyn-** | təbiət şöbəsinin məzunu (Salyan qəzası) |
| **12.Rzazadə Rza-** | təbiət şöbəsinin məzunu (Şamaxı qəzası) |
| **13.Rzazadə Həsənəddin-** | riyaziyyat şöbəsinin məzunu (Tiflis) |
| **14.Zeynalzadə Zeynal -** | riyaziyyat şöbəsinin məzunu (Şamaxı qəzası) |
| **15.Süleymanzadə** | |

| | |
|---|---|
| **Məhəmməd -** | riyaziyyat şöbəsinin məzunu (Göyçay qəzası) |
| **16.Şərəfəddin Seyidaləm-** | ədəbiyyat şöbəsinin məzunu (Türküstan-Daşkənd) |
| **17.Şahverdili Teymur -** | ədəbiyyat şöbəsinin məzunu (Lənkəran qəzası) |
| **18.Qasımzadə Qafur-** | təbiət şöbəsinin məzunu (Bakı) |
| **19.Abdizadə Cami Əkrəm-** | təbiət şöbəsinin məzunu (Quba) |
| **20.Abdihzadə Tahir-** | təbiət şöbəsinin məzunu (Kazan) |
| **21.Abdihzadə Məhəmməd-** | təbiət şöbəsinin məzunu (Kazan) |
| **22.Abdihzadə Əli-** | təbiət şöbəsinin məzunu (Ağdam) |
| **23)Abdilzadə Abdülməsur** | riyaziyyat şöbəsinin məzunu (Daşkənd) |
| **24.Məhəmmədzadə Vəli** | riyaziyyat şöbəsinin məzunu (Ağdam) |
| **25.Mədədzadə Məhəmməd-** | təbiət şöbəsinin məzunu (Qazax) |
| **26.Mustafazadə Ağaveyis** | - riyaziyyat şöbəsinin məzunu (Göyçay) |
| **27.Musaxanlı Atababa -** | ədəbiyyat şöbəsinin məzunu (Bakı) |
| **28.Nəcəfqulubəyzadə Nəsir-** | riyaziyyat şöbəsinin məzunu (Ağdam) |

## Ali Pedaqoji Qadın İnstitutunun məzunları (1924-cü il)

| | |
|---|---|
| **1.Axundzadə Mələk** | Şamaxı qəzasından |
| **2.Atakişizadə Humay** | Şamaxı qəzasından |
| **3.Eyyublu Sənubər** | Qazax qəzasından |
| **4.Usubova Gövhər** | Qazax qəzasından |
| **5.Tutayuq Fatma** | Şuşa qəzasından |
| **6.Pinova Nəzirə** | Gürcüstan-Axısqa |
| **7.Hacızadə Tutu** | Bakı qəzasından |
| **8.Xızırbəyli Şahizə** | Gürcüstan – Axısqa |
| **9.Xəlifəzadə Sürəyya** | Şuşa qəzasından |
| **10.Şahtaxtlı Xədicə** | Ermənistan-İrəvan |
| **11.Sadıqzadə Şövkət** | Şuşa qəzasından |
| **12.Səfərzadə Səkinə** | Gürcüstan-Tiflis |
| **13.Əlizadə Südabə** | Ermənistan-İrəvan |
| **14.Qazızadə Güllərəc** | Ermənistan-İrəvan |
| **15.Qiyasbəyli Şirin** | Qazax qəzasından |
| **16.Qiyasbəyli Müqdənisə** | Qazax qəzasından |
| **17.Məhəmmədzadə Xanımana** | Bakı qəzasından |

# SON SÖZ ƏVƏZİ

*İllər keçəcək, nəsillər dəyişəcək, həyata fərqli dünyabaxışına malik insanlar gələcək. İndi təxmin edilən kimi, çox peşələrdən əsər-ələmət qalmayacaq. Amma statusunu və funksiyasını dəyişsə belə, məktəbə və müəllimə həmişə ehtiyac olacaq.*

*Bəlkə də bəşəriyyətin ən böyük nailiyyəti yazını və məktəbi kəşf etməsidir. Bəşər tarixinin inkişafının müəyyən mərhələsində meydana gələn məktəb sonrakı dövrlərdə nisbi müstəqillik kəsb etməklə yanaşı, həm də cəmiyyətin tərəqqisinin başlıca stimuluna çevrildi, inkişafın, mədəni yüksəlişin əsas şərti və göstəricisi oldu. Məktəb ayrı-ayrı xalqların böyüyən nəslin təlim-tərbiyəsi ilə bağlı təcrübəsini, elm və mədəniyyət sahəsindəki nailiyyətlərini qoruyub saxladı, yazıya aldı və cəmiyyətin irəliyə doğru inkişafının hərəkətverici qüvvəsinə çevirdi.*

*Təkcə qədim Şərq mədəniyyəti bəşəriyyətə misli-bərabəri olmayan elə bir təcrübə qoyub gedib ki, onsuz dünya məktəb və təhsil tarixini, fəlsəfi-pedaqoji fikrin, elm və mədəniyyətin inkişafını təsəvvür etmək qeyri-mümkündür.*

*Qədim Şərq mədəniyyətindən bizi minilliklər ayırır. Bu zaman kəsiyində çox şey dəyişib, sivilizasiyanın ilkin çağlarından indiyə kimi möhtəşəm elm, incəsənət, mədəniyyət nümunələri, insanları haqqa-ədalətə, ruhi əzəmətə sövq edən din yaranıb, şəhərlər salınıb, kosmos kəşf edilib, insanları heyrətə salan texniki tərəqqi baş verib. Bununla yanaşı həm də bəşəriyyətə fəlakət gətirən irili-xırdalı minlərlə qarşıdurmalar və müharibələr baş verib, tarix iki dünya müharibəsinə şahidlik edib,*

*Şumerdən başlanan tarix güc sahiblərinin diktəsi ilə onların istəyinə uyğun yazılıb. Hər şey dəyişsə də, ciddi şəkildə dəyişməyən məktəblər olub. Mixi yazının meydana gəlməsi ilə yaranan Şumer məktəbləri indiyə kimi öz sadə modelini və əsas məqsədini qoruyub saxlayıb: ”kitabələr evi”-məktəb, “kitabələr evi”nin atası- müəllim (direktor), “kitabələr evi”nin övladları – şagirdlər, “böyük qardaş” – gil lövhələri hazırlayan köməkçi, “qamçı tutan” – məktəbin nəzarətçisi. Şumer məktəblərində təhsil ümumi, icbari və dünyəvi xarakter daşıyırdı, İki fərqli proqramdan istifadə olunurdu. Birinci proqramda elm və texnikaya, ikincisində ədəbiyyata və yaradıcılığa üstünlük verilirdi. Hüsnxət qaydasında yazmaq, mixi yazı sistemini və riyazi bilikləri öyrənmək vacib idi. Məktəb həm də ədəbi mərkəz və dəftərxana rolu oynayırdı. Təlimin əsas məqsədi sənət öyrətməkdən ibarət idi. Məzunlar məbədlərdə və saraylarda ya mirzəlik edər, ya da “kitabələr evi”ndə elm və tədrislə məşğul olardılar. Xarici dil bilən mirzələrə üstünlük verilirdi və s.*

*Orta əsrlərdə məktəbin köməyi ilə maddi və mənəvi mədəniyyətin inkişafı xeyli irəlilədi. Sənətkarlıq və ticarət mərkəzi olan şəhərlər yarandı, yeni təhsil sistemi formalaşdı, Şərqdə ali mədrəsələrin, Qərbdə universitetlərin*

*əsası qoyuldu. Az sonra İntibah mədəniyyəti yarandı, teosentrik baxışdan antroposentrik baxışa keçildi. Təbiətdən. məhəbbətdən, incəsənətdən, insan təfəkkürünün nailiyyətlərindən, insanlarla ünsiyyətdən zövq almağı bacaran hərtərəfli inkişaf etmiş şəxsiyyət yetişdirmək məktəbin əsas vəzifəsi hesab olundu."Bilik güc, güc isə bilikdir" konsepsiyası formalaşdı. Dünyanı bütöv dərk etməyə qabil olan və bundan nəticə çıxarmağı bacaran yeni insan idealı formalaşdı. Maarifçilk cəmiyyətin əxlaqi-mənəvi inkişafının mühüm şərti hesab edildi. Məktəb fəaliyyətinin nəzəri bazasının yeniləşməsi baş verdi. Monoloji mədəniyyətdən fərqli olaraq dioloji mədəniyyətin formalaşması zərurəti yarandı. Dövrün və zamanın tələblərinə uyğun olaraq təhsilin rolu daha da artdı. Təhsil millətin tərəqqisinin başlıca amilinə çevrildi.*

*Deməli, məktəb dövlətin ən möhtəşəm, ən güclü və mütərəqqi bir "silah"ıdır. Bu "silah" təkmilləşə bilər, yeniləşə bilər, amma heç vaxt istifadəsiz qala bilməz. Dünyada müasir məktəbi, mükəmməl dərsliyi və kamil müəllimləri olan dövlətlər həmişə söz sahibləri olub. Elə buna görə də, futuroloqların bəzilərinin dediyi ki, "gələcəkdə müəllimə ehtiyac qalmayacaq"- fikri inandırıcı görünmür. Təbii ki, on illər sonra məktəbin forması, məzmunu və öyrətmə-öyrənmə texnologiyası, müəllimin funksiyası dəyişəcək, amma məktəbin əzəli və əbədi şəxsiyyət yetişdirmək funksiyası dəyişməyəcək.*

*Pedaqoji və elmi pedaqoji kadr hazırlığında bir əsrlik tarix yazan Azərbaycan Dövlət Pedaqoji Universitetinin məzunlarına 50 il, 100 il sonra da böyük ehtiyac olacaq. Biz 100 illik yubiley tədbirlərinə hansı həvəslə hazırlaşırıqsa, təbii ki, xələflərimiz də eyni həvəslə 150, 200 illik yubileylərə hazırlaşacaq, onları təntənəli şəkildə qeyd edəcək.*

*Azərbaycanda da illər, əsrlər sonra yəqin ki, Avropa ölkələrində olduğu kimi, ali təhsil ocaqlarımızın, o cümlədən Azərbaycan Dövlət Pedaqoji Universitetinin 300, 500, 600 illik yubileyləri keçiriləcək. Yubiley tədbirlərində isə daha çox yada düşənlər təbii ki, Pedaqoji Universiteti yaradan və yaşadanlar olacaq. Çünki onlar bir əsrlik tarix yaradıblar. Elə bir tarix ki, illər sonra daha böyük maraq və əhəmiyyət kəsb edəcək, hörmət və ehtiramla oxunacaq. Bu da səbəbsiz deyil. Sürücü irəliyə hərəkət etmək üçün maşının yan güzgülərindən arxaya baxmalı olduğu kimi, millət də inkişaf etmək, bəşər mədəniyyətinə töhfələr vermək, keçmişini, soykökünü öyrənmək, tarixini bilmək məcburiyyətindədir. Pedaqoji Universitetin tarixi, onu yaradan və yaşadanların tarixi Azərbaycan təhsil və mədəniyyət tarixinin ayrılmaz hissəsidir. Unutmaq olmaz ki, millət gələcəyə tarixinin çiynində gedir.*

*Tarixdə isə tarixi yaradanlarla, yazanlar qalır...*

*2017-2019*

## MÜNDƏRİCAT

**Dizayner:** Əmiraslan Zaliyev
**Texniki redaktor:** Aynur Abıyeva

Çapa imzalanmış .........
Şərti çap vərəqi38 Sifariş № 282
Kağız formatı 60x84 1/16. Tiraj 500 .

